**Azərbaycan Respublikası Prezidenti**
**yanından**
**<u>Dövlət İdarəçilik Akademiyası</u>**

**Akif Bayramov, Allahverdi Hacıyev**

**Ziyəddin Məhərrəmov, Yusif Ağayev**

# AZƏRBAYCAN DİLİ
# VƏ
# NİTQ MƏDƏNİYYƏTİ
## (Dərs vəsaiti)

Dərs vəsaiti Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyası Tədris Metodik Şurasının 06 mart 2015-ci il tarixli iclasının qərarı ilə(07 saylı protokol) təkmilləşdirilmiş şəkildə çap edilir.

**BAKI-2017**

**Redaktor: Dos. Ədilə Əsədova**

**Rəyçilər: Dos. T. Mehrabova**
**Dos.T.Məmmədova**

**Kitabın dizaynı: Ülkər Abdıyeva**

**Akif Bayramov, Allahverdi Hacıyev, Ziyəddin Məhərrəmov ,Yusif Ağayev**

**Azərbaycan dili və nitq mədəniyyəti**
Təkmilləşdirilmiş nəşri
(ali məktəblər üçün dərs vəsaiti)

*Bu təkmilləşdirilmiş dərs vəsaitində müasir nitq mədəniyyətinin ən aktual məsələləri nəzərdən keçirilir, mövcud dərsliklərə və digər mənbələrə əsaslanaraq nitq normalarının, natiqlik sənətinin mahiyyəti, xüsusiyyətləri açıqlanır, tədris prosesində ondan istifadə qaydaları, üsulları göstərilir.*

*Vəsaitdən bu problemlərlə maraqlanan, humanitar və qeyri-humanitar fakültələrin tələbələri, magistrləri, aspirantları və müəllimləri, eləcə də jurnalistlər və digər mütəxəssislər istifadə edə bilərlər. "Azərbaycan dili və nitq mədəniyyəti" vəsaiti əsasən Azərbaycan Respublikası Prezidenti yanında DİA-nın tələbələri üçün nəzərdə tutulmuşdur. Vəsaitdə müasir Azərbaycan dilinin bütün struktur elementləri əsasən nitq mədəniyyəti problemləri ilə əlaqələndirilmişdir.*

# Ön söz

Nitq mədəniyyəti bəşər mədəniyyətinin tərkib hissələrindəndir və ixtisasından asılı olmayaraq cəmiyyətin bütün üzvləri nitq mədəniyyətinə sahib olmalıdır. Əks halda, hər hansı peşə, sənət, vəzifə sahibləri öz işində yüksək müvəffəqiyyət əldə edə bilməz. Xüsusilə, idarəçiliklə məşğul olan şəxslər, yüksək nitq mədəniyyətinə mənsub olmalıdırlar ki, onlar öz üzərilərinə düşən vəzifənin öhdəsindən layiqincə gələ bilsinlər.

Yüksək nitq mədəniyyətinə sahib olan şəxs birinci növbədə ictimaiyyət qarşısında, o cümlədən tabeçiliyində olan insanlar qarşısında öz şəxsiyyətini təsdiq etdirmiş olur. Bu, işdə müvəffəqiyyətinin ən başlıca amilidir. Yəni, yüksək nitq mədəniyyəti sayəsində hər hansı idarəçilik sahəsində fəaliyyət göstərən məmur hamını özünə inandıra bilir. Hamıda özünə qarşı hörmət, rəğbət hissi oyada bilir. Bunun ən parlaq nümunəsi Heydər Əliyevin yüksək nitq mədəniyyəti sayəsində xalqın ən böyük sevimlisinə çevrilməsi və ümummilli lider səviyyəsinə qalxması olmuşdur. Heydər Əliyevin şəxsi nümunəsi nəticəsində Azərbaycan xalqının nitq mədəniyyəti səviyyəsi XX əsrin 2-ci yarısından etibarən xeyli dərəcədə inkişaf etmişdir. Xüsusilə respublikamızın XX əsrin 90-cı illərində əldə etdiyi müstəqillik nəticəsində doğma ana dilimiz olan Azərbaycan dili həqiqi mənada, əməli şəkildə dövlət dili hüququnu qazandı. 1995-ci ildə ümumxalq referendumunda qəbul edilmiş yeni Konstitusiyada Azərbaycan dili dövlət dili kimi öz layiqli statusunu aldı.

Bunun nəticəsində Azərbaycan dilində gözəl nitq mədəniyyətinə sahib olmaq hər bir azərbaycanlının gündəlik tələbatına çevrilmişdir. Xalqın böyük əksəriyyətinin savadlı olduğu yeni təfəkkür tərzinin formalaşdığı müasir dövrdə yüksək nitq mədəniyyətinə sahib olmağı zaman özü tələb edir. Cəmiyyət üzvlərini bir-birinə bağlayan həyat tərzi, şüur, düşüncə, mənəvi tələbat kimi milli keyfiyyətlər məhz nitqimizin kamilliyinin qeydinə qalmağı əvvəlki dövrlərdən daha kəskin şəkildə tələb edir. Azərbaycan xalqının ümumi nitq mədəniyyəti səviyyəsi, ümummilli liderimiz Heydər Əliyevin cəmiyyət qarşısında müxtəlif illərdə və müxtəlif çıxışlarında nümayiş etdirdiyi parlaq nitqi nəticəsində misli görünməmiş dərəcədə yüksəlmişdir. Bununla bərabər, biz hər gün gözəl nitq nümunələrini diktorların aktyorların müəllimlərin, həkimlərin, siyasətçilərin və başqalarının danışığında eşidirik.

Bütün bunlar əsas verir ki, müasir dövrdə yaşayan, çalışqan, işləyən hər bir azərbaycanlı daim öz nitqinin zənginliyi ilə gözəlliyinin qeydinə qalmalı, onun geyimi, davranışı ilə yanaşı, nitqi də müasir səviyyəyə uyğun olmalıdır. Yüksək nitq mədəniyyətinə sahib olmaq insanın şan-şöhrətini, ləyaqətini, izzət və hörmətini idarəçi fəaliyyətini daha da artırır.

Hal hazırda Azərbaycan ali məktəblərində, o cümlədən Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında tədris planlarına uyğun şəkildə Azərbaycan dili və nitq mədəniyyəti fənni tədris olunur.

Bununla əlaqədar akademiyanın Dillər Kafedrası "Azərbaycan dili və nitq mədəniyyəti" adlı dərs vəsaiti çap etdirmişdir. Bu vəsaitin davamı olaraq kafedra Azərbaycan dili və nitq mədəniyyəti fənnini əyaniləşdirmək məqsədilə müxtəlif mövzulara aid sxemləri, nitq mədəniyyətin inkişafına təkan verən Azərbaycan dilinin tətbiqi və inkişafı ilə bağlı ümummilli liderimiz Heydər Əliyevin Azərbaycan Respublikası Prezidentliyi dövründə imzaladığı qanun və fərmanları, dil, nitq söz haqqında müdrik kəlamları özündə əks etdirən daha təkmil dərs vəsaiti hazırlamışdır. İnanırıq ki, bu

vəsait fənnin səmərəli mənimsənilməsində və ümumilikdə tələbələrdə nitq mədəniyyətinin formalaşmasında böyük rol oynayacaqdır.

Şübhəsiz ki, vəsait irad və nöqsanlardan da xali deyildir. Həmin nöqsanları aşkar edən və müəlliflərin diqqətinə çatdıran oxuculara da əvvəlcədən dərin minnətdarlığımızı bildiririk.

Müəlliflər

# Ümummilli liderimiz Heydər Əliyevin Azərbaycan Respublikası Prezidentliyi dövründə Azərbaycan dilinin tətbiqi və inkişafı ilə bağlı imzaladığı qanun və fərmanlar

**Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin**

**FƏRMANI**

Azərbaycan Respublikasının dövlət dili Azərbaycan dilidir. Müstəqil dövlətimizin rəsmi dili statusunu almış Azərbaycan dilinin geniş tətbiq edilməsi və sərbəst inkişafı üçün münbit zəmin yaranmışdır. Tarixin müxtəlif mərhələlərində dilimizə qarşı edilmiş haqsızlıqların,təzyiq və təhriflərin nəticələrinin aradan qaldırılması üçün hazırda ölkəmizdə çox əlverişli şərait mövcuddur.Dil öz daxili qanunları əsasında inkişaf edirsə də,onun tətbiq və tədqiq edilməsi üçün yaradılmış geniş imkanlar bu inkişafın daha sürətli və dolğun olmasına təkan verir.

Bütün xalqlarda olduğu kimi, Azərbaycan xalqının da dili onun milli varlığını müəyyən edən başlıca amillərdəndir.Dilimiz xalqın keçdiyi bütün tarixi mərhələlərdə onunla birgə olmuş, onun taleyini yaşamış, üzləşdiyi problemlərlə qarşılaşmışdır. O, xalqın ən ağır günlərində belə onun milli mənliyini, xoşbəxt gələcəyə olan inamını qoruyub möhkəmləndirmişdir. İnkişaf etmiş zəngil dil mədəniyyətinə sahib olan xalq əyilməzdir, ölməzdir, böyük gələcəyə malikdir. Ona görə də, xalqımıza ulu babalardan miras qalan bu ən qiymətli milli sərvəti hər bir Azərbaycan övladı göz bəbəyi kimi qorumalı, daim qayğı ilə əhatə etməlidir. Bu onun müqəddəs vətəndaşlıq borcudur.

Azərbaycan dili bu gün dərin fikirləri ən incə çalarınadək olduqca aydın bir şəkildə ifadə etmək qüdrətinə malik dillərdəndir. Düşüncələrdəki dərinliyi, hisslərdəki incəlikləri bütünlüklə ifadə etmək kamilliyinə yetişə bilməsi üçün hər hansı xalqa bir neçə minillik tarix yaşaması lazım gəlir. Azərbaycan dilinin bu günkü inkişaf səviyyəsi göstərir ki, Azərbaycan xalqı dünyanın ən qədim xalqlarındandır.

Azərbaycan dilinin dünya dilləri arasında ən kamil dillərdən biri olduğu həqiqətini bir çox xalqların görkəmli nümayəndələri də dönə-dönə etiraf etmişlər. Onlar öz əsərlərində bu dili XIX əsrdə Avropada geniş yayılmış fransız dili ilə müqayisə edərək, onu Avrasiyanın hər tərəfində işlənilən bir dil kimi yüksək qiymətləndirmişlər. Milyonlarla azərbaycanlının hazırda mədəni inkişaf vasitəsi olan bu dil tarixən nəinki Qafqazda yayılmışdır, hətta müəyyən dövrlərdə daha geniş məkanlarda müxtəlif dilli xalqların da istifadə elədikləri ümumi bir dil olmuşdur.

Neçə-neçə böyük mədəniyyətin yaradıcısı olan xalqımızın tarixi qədər onun dilinin təşəkkülü tarixi də olduqca qədimdir. Azərbaycan dili türk mənşəli ümumxalq canlı danışıq dili zəminində əmələ gəlib şifahi ədəbi dilə çevrilənədək və sonradan bu əsasda Azərbaycan ədəbi dilinin yazılı qolu təşəkkül tapana qədər yüz illər boyunca mürəkkəb bir yol keçmişdir.

Qədim və zəngin tarixə malik türk dil ailəsinin oğuz qrupuna daxil olan Azərbaycan dilinin tarixi miladdan əvvəlki dövrlərə gedib çıxır.Ayrı-ayrı türk boy birləşmələrinin ümumi anlaşma vasitəsi olan

bu dil IV-V əsrlərdən etibarən ümumxalq danışıq dili kimi fəaliyyət göstərməyə başlamışdır. Dilimizin özəyini ta qədimlərdən Azərbaycan torpaqlarındakı türk boylarının və soyların dili təşkil etmişdir.

Azərbaycan dili dialekt və şivələrinin geniş Avrasiya məkanına yayılan türk xalqlarının az qala bütün dil xüsusiyyətlərini əks etdirəcək qədər rəngarəng olmasının başlıca səbəbi ta qədimlərdən bu torpaqlarda etnik baxımdan eyni köklü türk etnoslarının mövcud olmasıdır. Şifahi şəkildə yayılan ilkin ədəbiyyat nümunələri - dastanlar, nağıllar, bayatılar, laylalar və sair Azərbaycan şifahi ədəbi dilinin erkən formalaşması və təkamülü zərurətini yaratmışdır.

Azərbaycan ədəbi dilinin yazılı qolu da əlverişli tarixi şəraitdə ümumxalq dili əsasında təşəkkül tapmışdır. Xalq şifahi şəkildə yaratdıqlarını əbədiləşdirmək üçün sonradan onları yazıya köçürmüşdür. Bu prosesin də yazı dilinin təşəkkülü və sabitləşməsində böyük əhəmiyyəti olmuşdur. Bu baxımdan "Kitabi-Dədə Qorqud" eposu olduqca səciyyəvidir. Abidənin bədii dilinin özünəməxsus səlisliyi bir daha göstərir ki, "Kitabi-Dədə Qorqud"un meydana çıxa bilməsi üçün Azərbaycan dili böyük tarixi - ədəbi hazırlıq mərhələsi keçməli idi.

Qaynağını uzaq keçmişdən alan Azərbaycan dilinin ilk və ən qədim yazılı nümunələri günümüzədək gəlib çatmasa belə, ölkəmizin ərazisində qədim əlifbaların varlığı, həmçinin yazı dilimizin bədii məna kamilliyi və digər amillər bu dilin dərin tarixi köklərə malik olduğunu sübuta yetirir. Həsənoğlu, Qazi Bürhanəddin, Nəsimi kimi söz sənətkarları Azərbaycan ədəbi dilinin belə bir bünövrəsi üzərində yüksəlmişlər.

XVI əsr Azərbaycan dilinin mövqelərinin möhkəmlənməsi ilə əlamətdardır. Səfəvilər dövlətinin yaranması ilə Azərbaycan dili dövlət dili səviyyəsinə qalxaraq rəsmi və dövlətlərarası yazışmalarda işlədilməyə başlandı. Səfəvilər dövründə Azərbaycan dili sarayda və orduda tam hakim mövqe tutaraq dövlət dili kimi rəsmiləşdi. Anadilli ədəbiyyatın böyük ustadları Şah İsmayıl Xətai və Məhəmməd Füzuli, xalq ədəbiyyatımızın adı bizə bəlli ilk qüdrətli nümayəndəsi Aşıq Qurbani bu dövrdə yetişmişdir. Əgər şifahi şer dili Qurbaninin əsərlərində əks olunmuşdusa, xalq şeri dilinin yazılı qolu Şah İsmayıl Xətai və Məhəmməd Əmaninin yaradıcılığı ilə təmsil olunmuşdur. Füzulinin dolğun dili isə elmi və fəlsəfi olduğu qədər də xəlqi idi.

XVII əsrin xalq şerində cərəyan edən proseslər XVIII əsrdə şifahi xalq ədəbiyyatının bədii dilə təsiri şəklində özünü göstərir. Ədəbi dildə sadəliyə, canlı danışıq elementlərinə meylin gücləndiyi bu dövrdə Azərbaycan dilinin yeni inkişaf mərhələsi məhz Molla Pənah Vaqifin yaradıcılığı ilə başlanır.

XVIII əsrdəAzərbaycan ədəbi dilində üslub baxımından da zənginləşmə prosesi gedir. Elmi üslubun təşəkkülü üçün şərait yaranır, ayrı-ayrı elm sahələrinə dair bir çox əsərlər yazılır.

XIX əsr ədəbi dilimizin inkişafı xalqımızın həyatında baş verən köklü bir hadisə ilə yaxından bağlıdır. Bu, Azərbaycanın ikiyə parçalanması və nəticədə iki ayrı dövlətin tabeçiliyində bir-birindən fərqli mədəni mühitdə yaşamağa məhkum olması hadisəsidir. Müstəmləkəçilik siyasəti ilə yanaşı, Rusiyanın Şimali Azərbaycanda oynadığı mədəniləşdirici rol başqa elm sahələri kimi, dilçiliyin də inkişafına zəmin yaratmışdır. XIX əsrin ortalarından etibarən Azərbaycan dilinə aid bir sıra dərsliklər və dərs vəsaitləri yazılıb nəşr olunmuşdur. Milli maarifçi ziyalılar özləri ana dilinin öyrənməyin, onu qoruyub saxlamağın ən əsas yolunu məktəblərdə tədrisin ana dilində aparılmasında gördüklərindən,

Azərbaycan dilinə aid dərslik və lüğət yazmağa başlamışdılar. Azərbaycan dilinə dair ilk dərsliklərin yazılmasında o dövrün görkəmli maarifçiləri Mirzə Kazım bəy, Mirzə Şəfi Vazeh, Seyid Əzim Şirvani, Aleksey Çernyayevski, Mirzə Əbülhəsən bəy Vəzirov, Seyid Ünsüzadə, Rəşid bəy Əfəndiyev, Sultan Qənizadə, Məmmədtağı Sidqi, N.Nərimanov, Ü.Hacıbəyov, A.Şaiq və başqalarının xidmətlərini qeyd etmək lazımdır.

Zaman keçdikcə dövrün tələbatına uyğun olaraq Azərbaycan dilinin istifadə dairəsi genişlənmiş, onun tətbiqinin və inkişafının elmi əsaslar üzərində aparılması ehtiyacı meydana çıxmışdır. Rusca-azərbaycanca, azərbaycanca-rusca lüğətlər, təcrübi-tədris kitabları nəşr olunmuşdur. Məhz bu dövrdən başlayaraq, Azərbaycan ədəbi dilinin normalarının müəyyənləşməsində nəzəri dilçilik ideyaları təzahür edir. Bu baxımdan M.F.Axundovun ədəbi dil haqqında milli ədəbiyyatın realist məzmununa uyğun gələn tezisləri xüsusilə diqqəti cəlb edir.

Dram, satira realist nəsr dilinin yarandığı XIX əsrdə elmi üslubun əsası kimi müasir elmi-fəlsəfi dilin ilk nümunələrinə də rast gəlirik. Mətbuat dili də bu əsrin məhsuludur. "Əkinçi"dən başlayaraq yaranmış milli mətbuat bu dilin inkişafında mühüm rol oynamışdır.

XX yüzillik isə Azərbaycan ədəbi dilinin ən sürətli tərəqqisi və çiçəklənməsi dövrüdür. Ədəbi dil məsələsi hələ əsrin əvvəllərində ictimai-siyasi mübarizənin tərkib hissəsi olmuşdur.Həmin dövrdə ana dili kitabları hazırlanmış, dərsliklər buraxılmış, müntəxabatlar tərtib olunmuşdur. Azərbaycan dilinin səs quruluşuna və qrammatik sisteminə dair kitablar yazılmışdır.

Mətbuat ana dili, ədəbi dil uğrunda mübarizənin önündə gedirdi. Ədəbi dil normasının müəyyənləşməsində bütün görkəmli ziyalılar iştirak edirdilər. Xalq dili xəzinəsinin qapıları "Molla Nəsrəddin" vasitəsilə ədəbi dilin üzünə açılırdı. Bu dövrdə yaranan səhnə sənəti də yeni milli-mədəni şəraitdə ədəbi dilə bədii nitqlə öz töhfəsini vermişdir.

Ana dilinin taleyinə heç bir ziyalının laqeyd qalmadığı bu dövrdə C.Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Üzeyir Hacıbəyov, Ömər Faiq Nemanzadə kimi söz ustaları Azərbaycan dilinin saflığı və onun yad ünsürlərdən qorunması uğrunda fədakarcasına mübarizə aparırdılar.

Azərbaycan ədəbi dilinin tarixində bundan sonrakı yeni mərhələ sovet dövrü ilə başlayır. Ərəb əlifbasını daha uyğun bir əlifba ilə əvəz etmək məqsədilə 1921-ci ildə Əlifba Komitəsi yaradıldı və həmin komitəyə Azərbaycan dili üçün latın qrafikalı əlifba tərtib etmək tapşırıldı. Bir qədər sonra isə yeni əlifbaya keçildi.O, 1926cı ildə Bakıda I Beynəlxalq türkoloji qurultay çağırıldı. Bu türk dünyası üçün böyük tarixi əhəmiyyəti olan bir hadisə idi. Qurultayın Bakıda keçirilməsini 20-30-cu illər Azərbaycanının dilçilik sahəsindəki elmi-potensialına verilən qiymət kimi səciyyələndirmək olar. Təəssüflə qeyd etmək lazımdır ki, sonralar qurultayın qərarlarının yerinə yetirilməsi yolunda süni maneələr yaradıldı, türkdilli xalqların mədəni inteqrasiyasına yönəldilmiş bu nəcib iş siyasi məqsədlərə qurban verir. Azərbaycanın dilçi alimlərinin böyük əksəriyyəti isə totalitar rejimin repressiyasına məruz qaldı. 1939-cu ildə latın qrafikalı əlifbadan kiril qrafikası əsasında yaradılmış yeni Azərbaycan yazısına qəti və məcburi keçmək haqqında qərar verildi. Beləliklə, 1924-cü ildən 1939-cu ilə qədər keçən 15 il ərzində xalqın yazı mədəniyyətinə bir birinin ardınca iki ağır zərbə dəydi. Buna

baxmayaraq, Azərbaycan dili, çətinliklə də olsa, bütün bu illər ərzində yenə öz saflığını qoruya bilmiş, elmi və bədii ədəbiyyatda, publisistikada böyük imkanlara malik olduğunu nümayiş etdirmişdir.

1945-ci ildən Azərbaycan Elmlər Akademiyasının tərkibində müstəqil Dilçilik İnstitunun yaranması dilçiliyimizin bir elm kimi inkişafına da təkan verdi. Dilçilik elmimiz XX əsrdə sürətlə inkişaf dövrü yaşamışdır. Həmin dövrdə ədəbi dilimizi tədqiq edən Bəkir Çobanzadə, Məmmədağa Şirəliyev, Əbdüləzəl Dəmirçizadə, Muxtar Hüseynzadə, Əliheydər Orucov, Səlim Cəfərov, Əlövsət Abdullayev, Fərhad Zeynalov və başqa dilçi alimlərimizin böyük ordusu yaranmışdır. Dərin qürur və fərəh hissi ilə demək olar ki, Azərbaycan dilçilərinin gərgin əməyi sayəsində dilçiliyin bütün sahələrində səmərəli işlər görülmüş, dil tarixi, dialektologiya, müasir dil, lüğətçilik sahələrində dəyərli tədqiqatlar aparılmışdır. Keçmiş sovet məkanında, eləcə də beynəlxalq miqyasda Azərbaycan türkoloji araşdırmaların önəmli mərkəzlərindən biri olmuşdur. Beləliklə, XX əsr bütünlükdə Azərbaycan dilinin yazı mədəniyyətinin əsl inkişaf yoluna qədəm qoyduğu bir dövrdür. Məhz bu dövrdə dilimizin funksional imkanları genişlənmiş, üslubları zənginləşmiş, dilin daxili inkişaf meylləri əsasında yazı qaydaları cilalanmışdır.

Müstəqil Azərbaycan Respublikasının 1995-ci il noyabrın 12-də referendum yolu ilə qəbul olunmuş Konstitusiyasında Azərbaycan dili dövlət dili kimi təsbit olunmuşdur. Hər hansı bir dilin dövlət dili statusu alması, şübhəsiz ki, hər bir dövlətin bir dövlət kimi formalaşması ilə bilavasitə bağlıdır. Azərbaycan xalqının tarixində Azərbaycan dili XVI əsrdə Səfəvilər hakimiyyəti dövründə dövlət dili səviyyəsinə qalxsa da, milli dövlətçiliyin itirilməsi nəticəsində həmin ənənə uzun müddət qırılmışdır. Yalnız 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin yaranması ilə Azərbaycan dilinin geniş tətbiq olunması yolunda böyük imkanlar açıldı. Bu sahədə bəzi addımlar atılsa da, gənc respublikanın ömrünün qısa olması, Azərbaycan dilinin cəmiyyətdə dövlət dili kimi mövqelərinin tam bərqərar edilməsinə imkan vermədi.

Azərbaycanda Sovet hakimiyyəti yaradıldıqdan sonra qəbul edilmiş Konstitusiyada ümumiyyətlə, Dövlət dili haqqında heç bir maddə olmamışdır. SSRİ-nin tərkibinə daxil olduqdan sonrakı dövrdə, daha doğrusu, Azərbaycanın 1937-ci ildə qəbul edilmiş Konstitusiyasında belə bir maddə yox idi.

Yalnız 1956-cı ildə Azərbaycan SSRİ Ali Dövlətin qərarı ilə 1937-ci il Konstitusiyasına Azərbaycan dilinin dövlət dili olması barədə maddə əlavə edildi. Lakin respublikanın o dövrkü rəhbərliyinin mövcud siyasi vəziyyəti lazımınca qiymətləndirə bilməyərək, hadisələri sürətləndirmək cəhdləri bu nəcib işi uğursuzluğa düçar etdi.

Nəhayət, mərkəzin bütün maneələrinə baxmayaraq bir çox qan 1978-ci ildə qəbul edilən Konstitusiyasına Azərbaycan dilinin dövlət dili olması barədə maddənin daxil edilməsi müyəssər oldu. O, həmin dövr üçün çox cəsarətli və qətiyyətli bir addım idi.

Azərbaycan Respublikası öz dövlət müstəqilliyini bərpa etdikdən sonra Azərbaycan dilini daha da inkişaf etdirilməsi yolunda geniş üfüqlər açıldı. Təəssüflər olsun ki, respublikanın o zamankı rəhbərliyinin səriştəsizliyi nəticəsində xalqın iradəsinə zidd olaraq dövlət dilinin adı qeyri-qanuni şəkildə dəyişdirildi və məsələyə dolaşıqlıq, anlaşılmazlıq gətirildi. Dövlət dili haqqında məsələ 1992-ci ilin dekabrında Azərbaycanın Milli Məclisində müzakirə edildi və dövlət dilinin adının dəyişdirilməsi nəzərdə tutulan anti-konstitusion qanun qəbul edildi. Təəssüf ki, belə taleyüklü məsələnin həlli üçün o zaman Milli Məclisdə cəmi 26 nəfəri layihəyə səs verməsi kifayət edirdi. Halbuki, Dövlət dili haqqında

müddəa Konstitusiyada nəzərdə tutulduğuna görə, ona hər hansı dəyişik edilməsi ümumxalq müzakirəsi, ali qanunvericilik üzvlərinin ən azı üçdə iki səs çoxluğu ilə edilə bilərdi. Lakin o zaman adi qanunvericilik qaydalarına məhəl qoyulmamış, xalqın iradəsi nəzərə alınmadan volyuntarist və məsuliyyətsizlik qərar qəbul edilmişdir.

Müstəqil Azərbaycan Respublikasının ilk Konstitusiyasının layihəsinə baxılarkən dövlət dili, daha doğrusu, dövlətin dilinin adı haqqında müddəa geniş müzakirə obyekti oldu, həmin məsələ yeni Konstitusiya layihəsini hazırlayan komissiyada, kütləvi informasiya vasitələrində, müxtəlif elmi forumlarda, yığıncaqlarda, idarə, təşkilat və müəssisələrdə, sərbəst, demokratik şəkildə hərtərəfli müzakirə olundu. Nəhayət, xalq 1995-ci il noyabr ayının 12-də referendum yolu ilə öz mövqeyini nümayiş etdirərək Azərbaycan Respublikasının dövlət dilinin Azərbaycan dili olması müddəasına tərəfdar olduğunu bildirdi. Ana dilimizə qarşı edilmiş haqsızlıq aradan qaldırıldı, onun hüquqları qorundu, cəmiyyətdəki mövqeləri tam bərpa ediildi.

Indi Azərbaycan dilinin özünəməxsus inkişaf qanunları ilə cilalanmış kamil qrammatik quruluşu, zəngin söz fondu, geniş ifadə imkanları, mükəmməl əlifbası, yüksək səviyyəli yazı formaları vardır, hazırda ölkəmizdə cəmiyyət həyatının elə bir sahəsi yoxdur ki, Azərbaycan dili orada rahat işlədilə bilməsin.

Bununla yanaşı, Azərbaycan Respublikasının onillik inkişaf yolunun təcrübəsi göstərir ki, digər sahələrdə olduğu kimi, ana dilimizin öyrənilməsi  və tətbiqi sahəsində hələ görüləsi işlər çoxdur. Ölkəmizin ali və orta məktəblərində Azərbaycan dilinin müasir dünya standartlarına, milli mədəni inkişaf tariximizin tələblərinə cavab verən tədrisi işinin təkmilləşməsinə ehtiyac vardır. Bir çox kütləvi informasiya vasitələrində, rəsmi yazışmalarda, kargüzarlıq və s. sahələrdə Azərbaycan ədəbi dilinin normalarına əməl edilir. Azərbaycan dilinin, reklam işində istifadə edilməsində ciddi qüsurlar müşahidə olunur. Kəskin tənqidlərə baxmayaraq, reklam vasitələrinin hazırlanmasında bir çox hallarda xarici dillərə əsassız olaraq üstünlük verilir. Şəhər və qəsəbələrimizin görkəminə xələl gətirən əcnəbi dilli lövhələr, gənc nəslin azərbaycançılıq ruhunda tərbiyəsinə mənfi psixoloji təsir göstərir. Ölkə ərazisində yayımlanan televiziya kanalların əksəriyyəti xarici dillərdə fəaliyyət göstərir. Kino və televiziya ekranlarında Azərbaycan dilinə dublyaj edilmiş xarici filmlərə nadir hallarda rast gəlmək olar, dublyaj edilmiş ekran əsərlərinin tərcümə səviyyəsi isə olduqca aşağıdır. Azərbaycan Respublikasının xarici siyasət sahələrində, xüsusilə ölkəmizdə fəaliyyət göstərən səfirlik, xarici nümayəndəlik və şirkətlərdə Azərbaycan dilinin işlənməsi yarıtmaz vəziyyətdədir. Xaricdə yaşayan soydaşlarımızın Azərbaycan dili dərslikləri, tədris vəsaiti, ana dilində bədii və elmi ədəbiyyat, mətbuat və s. ilə təmin olunması qənaətbəxş deyildir.

Çox qəribə görünsə də, Azərbaycan dilçiliyinin sovet dövründə əldə edilmiş sürətli inkişaf tempi son illərdə aşağı düşmüşdür və bu sahədə bir durğunluq müşahidə olunur. Azərbaycanda nitq mədəniyyəti məsələlərinin tədqiqinə və nizamlanmasına kəskin ehtiyac duyulur. Azərbaycan dilinin tətbiq dairəsi bəzən süni olaraq məhdudlaşdırılır. Rəsmi və elmi üslubun vəziyyəti heç də ürəkaçan deyildir. Azərbaycan dilinin orfoqrafik, izahlı, terminoloji və s. lüğətlərinin yenidən  latın qrafikası ilə hazırlanıb çap olunması, ikidilli tərcümə lüğətlərinin tərtibi və nəşri məsələləri yubadılır. Latın qrafikasının bərpa olunması barədə qanun qəbul edilməsindən 10 ilə yaxın bir müddət keçməsinə baxmayaraq, onun həyata keçirilməsi olduqca ləng gedir. Bütün bu və digər məsələlərin əlaqələndirilməsi və tənzimlənməsinin, onların həlli prosesinə nəzarətin vahid mərkəzləşdirilmiş bir qurum tərəfindən həyata keçirilməsinə ehtiyac vardır.

Azərbaycan dövlət müstəqilliyinin başlıca rəmzlərindən sayılan Azərbaycan dilinin tətbiq və inkişaf etdirilməsinə dövlət qayğısının artırılması, ana dilimizin öyrənilməsi, elmi tədqiqin fəallaşdırılması, dilimizin cəmiyyətdə tətbiq dairəsinin genişləndirilməsi və bu işə nəzarətin gücləndirilməsi məqsədilə ***qərara alıram:***

1. *Azərbaycan Respublikası Prezidentinin yanında Dövlət Dil Komissiyası yaradılsın.azərbaycan Respublikası Prezidentinin İcra Aparatına tapşırılsın ki, Komissiya haqqında Əsasnaməni bir ay ərzində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin .*
2. *Azərbaycan Respublikasının Prezidentinin İcra Aparatına tapşırılsın ki, "Azərbaycan Respublikasında Dövlət dili haqqında" qanun layihəsini bir ay ərzində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin.*
3. *Azərbaycan Respublikasının nazirlik, idarə, təşkilat və müəssisə rəhbərləri öz tabeliklərində olan qurumlarda dövlət dilinin və latın qrafikasının tətbiqi işinin yaxşılaşdırılması ilə bağlı uzunmüddətli kompleks planlar hazırlayıb həyata keçirsinlər və 2001-ci il avqustun 1-ə qədər ilkin nəticələr haqqında Azərbaycan Respublikasının Prezidentinə məlumat versinlər.*
4. *Azərbaycan Respublikasının Təhsil Nazirliyi orta və ali məktəblərdə Azərbaycan dilinin tədrisi və Azərbaycan dilində təhsilin keyfiyyəti ilə bağlı əsaslı dönüş yaratmaq istiqamətində qəti tədbirlər həyata keçirsin və müvafiq təkliflər proqramını bir ay ərzində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin.*
5. *Azərbaycan Milli Elmlər Akademiyası və Azərbaycan Respublikasının Təhsil Nazirliyi Yazıçılar Birliyi ilə birlikdə latın qrafikası ilə yenidən çap olunması təklif olunan elmi və bədii əsərlərin, lüğət və dərsliklərin çap proqramını bir ay ərzində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin.*
6. *Azərbaycan Milli Elmlər Akademiyası bir ay ərzində Azərbaycan dilçiliyinin müxtəlif sahələri üzrə elmi araşdırmaların cari və perspektiv planlarına yenidən baxıb təsdiq etsin və onların yerinə yetirilməsinin gedişi barədə hər altı aydan bir Azərbaycan Respublikasının Prezidentinə məlumat təqdim etsin.*
7. *Respublikanın şəhər və rayon icra hakimiyyəti başçılarına tapşırılsın ki:*
   *-Yerlərdə istifadə olunan lövhə, reklam tabloları, şüarlar, plakatlar və digər əyani vasitələrin Azərbaycan ədəbi dilinin qaydalarına uyğunlaşdırılması baxımından tədbirlər görsünlər və bu tapşırığın yerinə yetirilməsi haqqında 2001-ci il avqustun 1-ə qədər Azərbaycan Respublikasının Prezidentinə arayış versinlər;*
   *-Yerlərdə Azərbaycan dilinin və latın qrafikasının tətbiqi işinə nəzarəti gücləndirsinlər və bu işin gedişi barədə 2001-ci il avqustun 1-ə qədər Azərbaycan Respublikasının Prezidentinə məlumat versinlər;*
8. *Azərbaycan Respublikasının Mədəniyyət Nazirliyinə, Dövlət Televiziya və Radio Verilişləri Şirkətinə tapşırılsın ki, əcnəbi ölkələrdə istehsal edilmiş və Azərbaycanda nümayiş etdirilmək üçün alınmış kino və televiziya məlumatının Azərbaycan dilinə dublyajı işinin lazımi səviyyədə qurulması və ölkə ərazisində xarici kino və telefilmlərin, Azərbaycan dilində nümayiş etdirilməsi barədə təklifləri bir ay ərzində hazırlayıb Azərbaycan sutka sının Prezidentinə təqdim etsin.*

9. *Azərbaycan Respublikasının Nazirlər Kabinetinə tapşırılsın ki:*

*-Ölkədə Azərbaycan dilində çap olunan qəzet, jurnal, bülleten, kitab və digər çap məhsullarının istehsalının 2001-ci il avqustun birinə qədər bütövlükdə latın qrafikasına keçməsini təmin etsin;*

*-Azərbaycan Respublikasında dövlət dilinə qarşı gizli, yaxud açıq təbliğat aparmaq, Azərbaycan dilinin işlənməsinə və inkişafına müqavimət göstərmək, onun hüquqlarının məhdudlaşdırılmasına cəhd etmək kimi hallara, latın qrafikasının tətbiq olunmasına maneələr törədilməsinə görə məsuliyyət növlərini müəyyən edən qanunvericilik aktının layihəsini bir ay ərzində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;*

*-Mərkəzi və yerli icra hakimiyyəti orqanlarında kargüzarlığın latın qrafikası ilə aparılmasını 2001-ci il avqustun birinə qədər təmin etsin;*

*- Bu fərmandan irəli gələn digər məsələləri həll etsin.*

**Heydər Əliyev**

**Azərbaycan Respublikasının Prezidenti**

Bakı şəhəri,18 iyun 2001-ci il

***Azərbaycan əlifbası və Azərbaycan dili***

***gününün təsis edilməsi haqqında***

**AZƏRBAYCAN RESPUBLIKASININ PREZIDENTININ**

**FƏRMANI**

Qədim və zəngin mədəniyyətə malik olan Azərbaycan xalqı dünya sivilizasiyasına bir çox dəyərli töhfələr vermişdir. Onların ilk nümunələri, bəşər tarixinin böyük kəşfi olan yazı vasitəsilə Qobustan və Gəmiqaya təsvirləri, həmçinin, epiqrafik abidələr şəklində daşların yaddaşına həkk olunaraq günümüzədək yaşamışdır.Tarixi faktlar sübut edir ki, bu qiymətli əsərləri yaradarkən Azərbaycan xalqı müxtəlif əlifbalardan istifadə etmişlər.

İslamın qəbuluna qədər olan dövrün yazıları ilə bu qiymətli xəzinənin böyük bir qismi məhv edilmiş, zaman keçdikcə həmin abidələrin qələmə alındığı yazı şəkilləri unudulmuş və ya ərəb qrafikasına keçirilmişdir.İslamın yayıldığı dövrlərdən isə xalqımız ərəb əlifbasından istifadə yolu ilə min ildən artıq bir zaman ərzində tariximizin ən yeni mərhələsinədək zəngin mədəni irs yaratmışdır.Ərəb əlifbası yüz illər boyu geniş məkanda müsəlman Şərq xalqlarının ümumi yazı sistemi kimi formalaşmışdır.Böyük Azərbaycan ədibləri,alimləri, mütəfəkkirləri İslam mədəniyyətinin təşəkkül tapıb inkişaf etməsində mühüm rol oynayaraq bəşər sivilizasiyasını zənginləşdirmişlər.Lakin əsrlərlə müxtəlif xalqların mədəni əlaqəsinə xidmət edən ərəb qrafikasının dilimizin səs sistemini bütün dolğunluğu ilə əks etdirə bilməməsi,onun quruluşu və xarakteri haqqında tam aydın təsəvvür yaratmaması XIX əsrin ikinci yarısından etibarən Mirzə Fətəli Axundov başda olmaqla dövrün mütərəqqi maarifçi ziyalılarının əlifba islahatı problemi üzərində düşünməyə vadar etmişdir.Bu, Azərbaycan xalqının həmin dövrdə yaşadığı tarixi şəraitdən doğan zərurət idi.Öz qaynağını Avropadan alan yeni dövrün maarifçilik hərəkatı Azərbaycan mədəniyyətinin inkişaf istiqamətini müəyyənləşdirmiş və bu da yeni mədəniyyət tipinə uyğun müasir əlifbaya olan ehtiyacı aktuallaşdırmışdır.XX əsrin əvvəllərində cərəyan edən ictimai-siyasi və mədəni proseslərin gedişatı, mövcud əlifbanı daha münasibi ilə əvəz etmək ideyasını meydana atmışdır.

1922-ci ildə Azərbaycan hökumətinin qərarı əsasında yeni əlifba komitəsinin yaradılması, həmin komitəyə Azərbaycan dili üçün latın qrafikalı əlifba tərtibinin tapşırılması yeni qrafikaya keçilməsi yolunda atılmış ilk ciddi addım idi.1923-cü ildən etibarən latın əsaslı əlifbaya keçmə prosesi sürətləndi.1926-cı ildə keçirilmiş Birinci Ümumittifaq Türkoloji qrultayın tövsiyələrinə cavab olaraq 1929-cu il yanvarın 1-dən etibarən Azərbaycanda kütləvi şəkildə latın qrafikalı əlifba tətbiq edildi.Qısa bir müddət ərzində latın qrafikasının işlədilməsi Azərbaycanda geniş kütlələr arasında savadsızlığın ləğvi üçün olduqca əlverişli zəmin yaratdı.Bütün bu nailiyyətlərə baxmayaraq, həmin əlifba 1940-cı il yanvarın 1-dən kiril yazısı əsasında tərtib edilmiş yeni qrafikalı əlifba ilə əvəz olundu.Yarım əsrdən çox bir müddət ərzində kiril qrafikası ilə Azərbaycan elmi və mədəniyyətinin qiymətli nümunələri yaradıldı.Lakin kiril qrafikasının dilimizin səs quruluşuna uyğun gəlməməsi Azərbaycan ziyalılarını bu əlifbanın təkmilləşdirilməsi yolunda mütəmadi iş aparmağa sövq etdi.Təcrübə göstərir ki, kiril qrafikasının dilimizin səs quruluşuna uyğunlaşdırılması yolunda nə qədər cəhd göstərilsə də,optimal variantın əldə edilməsi mümkün deyildir, bu da onun nə vaxt da dəyişdiriləcəyi ehtimalını gücləndirdi.

Müstəqilliyimizin qazanılmasından sonra yaranmış tarixi şərait xalqımızın dünya xalqlarının ümumi yazı sisteminə qoşulması üçün yeni perspektivlər açdı və latın qrafikalı Azərbaycan əlifbasının bərpasını zəruri etdi. Bu isə müvafiq qanun qəbul olunması ilə nəticələndi.

On ilə yaxın bir müddətdə latın qrafikası Azərbaycan əlifbasına keçidin ölkəmizdə 2001-ci il avqust ayında bütövlükdə təmin edildiyini və yeni əlifbadan istifadənin müstəqil Azərbaycan Respublikasının ictimai-siyasi həyatında, yazı mədəniyyətinin tarixində mühüm hadisə olduğunu nəzərə alaraq **qərara alıram:**

*1. Hər il avqust ayının 1-i Azərbaycan Respublikasında Azərbaycan əlifbası və Azərbaycan dili günü kimi qeyd edilsin.*

*2. Bu fərman dərc edildiyi gündən qüvvəyə minsin.*

**Heydər Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**

Bakı şəhəri, 9 avqust 2001-ci il.

***Azərbaycan Respublikasında Dövlət***

***dili haqqında***

**AZƏRBAYCAN RESPUBLİKASININ**

**QANUNU**

Azərbaycan Respublikası Azərbaycan dilinin dövlət dili olaraq işlədilməsi öz müstəqil dövlətçiliyinin başlıca əlamətlərindən biri sayır, onun tətbiqi, qorunması və inkişaf etdirilməsi qayğısına qalır, dünya azərbaycanlılarının Azərbaycan dili ilə bağlı milli-mədəni özünüifadə ehtiyaclarının ödənilməsi üçün zəmin yaradır.

Bu Qanun Azərbaycan Respublikası Konstitusiyasına uyğun olaraq Azərbaycan Respublikasında Azərbaycan dilinin dövlət dili kimi hüququ statusunu nizamlayır.

# I FƏSİL

## Ümumi müddəalar

### Maddə 1.Dövlət dilinin hüquqi statusu

*1.1 Azərbaycan Respublikasının dövlət dili Azərbaycan Respublikası Konstitusiyasının 21-ci maddəsinin I hissəsinə müvafiq olaraq Azərbaycan dilidir.Dövlət dilini bilmək hər bir Azərbaycan Respublikasının vətəndaşının borcudur.*

*1.2 Azərbaycan Respublikasının dövlət dili kimi Azərbaycan dili ölkənin siyasi, ictimai, iqtisadi, elmi və mədəni həyatının bütün sahələrində işlədilir.*

*1.3 Azərbaycan Respublikası dövlət dilinin işlənməsi, qorunması və inkişafını təmin edir.*

*1.4 Azərbaycan Respublikasında dövlət hakimiyyəti və yerli özünüidarəetmə orqanlarında, dövlət qurumlarında, siyasi partiyalarda, qeyri hökumət təşkilatlarında (ictimai birlik və fondlarda),həmkarlar təşkilatlarında, digər hüquqi şəxslərdə, onların nümayəndəliklərində və filiallarında, idarələrdə dövlət dilinin tətbiqi ilə bağlı fəaliyyət bu qanuna uyğun olaraq həyata keçirilir, o cümlədən kargüzarlıq işləri dövlət dilində aparılır.*

*1.5 Dövlət dilinin tətbiqinin normaları müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilir.*

*1.6 Azərbaycan Respublikasının ərazisində fəaliyyət göstərən beynəlxalq təşkilatlara (və ya onların nümayəndəlikləri ilə) və xarici dövlətlərin nümayəndəlikləri ilə yazışmalar Azərbaycan Respublikasının dövlət dilində və ya müvafiq xarici dilində Azərbaycan dilinə tərcümə olunmaq şərti ilə aparıla bilər.*

### Maddə 2. Azərbaycan Respublikasında dövlət dili haqqında qanunvericilik

Azərbaycan Respublikasında dövlət dili haqqında qanunvericilik Azərbaycan Respublikasının Konstitusiyasından, bu qanundan, digər normativ hüquqi aktlardan və Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrdən ibarətdir.

**Maddə 3. Dövlət dilinin işlənməsi, qorunması və inkişafı sahəsində dövlətin əsas vəzifələri**

*3.0. Dövlət dilinin işlənməsi, qorunması və inkişafı sahəsində dövlətin əsas vəzifələri aşağıdakılardır:*

*3.0.1. Azərbaycan Respublikası Konstitusiyasının və bu qanunun tələblərinə uyğun olaraq dövlət dili ilə bağlı hüquq qaydalarının müəyyənləşdirilməsi*

*3.0.2. Dövlət dilinin tətbiqi işinə, bu dilin işlənməsi və qorunması ilə bağlı qanunvericiliyin müddəalarına riayət olunmasının təmin edilməsi;*

*3.0.3. Dövlətin inkişaf proqramının hazırlanması və dövlət büdcəsinin vəsaiti hesabına maliyyələşdirilməsinin təmin edilməsi;*

*3.0.4. Dövlət dilinin saflığının qorunması, dilçilik elminin nəzəriyyəsi və praktikasının inkişafı üçün müvafiq şəraitin yaradılması və tədbirlərin həyata keçirilməsi;*

*3.0.5. Dövlət dilinin işlənməsi üçün zəruri olan maddi bazanın yaradılması;*

*3.0.6. Xarici ölkələrdə yaşayan azərbaycanlıların Azərbaycan dilində təhsil almalarına, bu dildən sərbəst istifadə etmələrinə köməklik göstərilməsi.*

## II FƏSİL

## DÖVLƏT DİLİNİN İŞLƏNMƏSİ, QORUNMASI VƏ İNKİŞAFI

**Maddə 4. Dövlət dilinin rəsmi mərasimlərdə işlənməsi**

*4.1. Azərbaycan Respublikasının dövlət hakimiyyəti və yerli özünüidarəetmə orqanlarının, dövlət qurumlarının keçirdiyi bütün rəsmi mərasim və tədbirlər Azərbaycan Respublikasının dövlət dilində aparılır.*

*4.2. Bu Qanunun 4.1-ci maddəsinin tələbləri Azərbaycan Respublikasının təşkil etdiyi beynəlxalq səviyyəli rəsmi mərasimlərə və tədbirlərə, habelə müvafiq icra hakimiyyət orqanları tərəfindən digər ölkələrdə keçirilən hər hansı rəsmi mərasim və tədbirlərə şamil olunmur.*

**Maddə 5. Dövlət dilinin təhsil sahəsində işlənməsi**

*5.1. Azərbaycan Respublikasında təhsil dövlət dilində aparılır.*

*5.2. Azərbaycan Respublikasında başqa dillərdə təhsil müəssisələrinin fəaliyyəti qanunvericiliklə müəyyən edilmiş qaydada həyata keçirilir. Belə müəssisələrdə dövlət dilinin tədrisi məcburidir.*

*5.3. Azərbaycan Respublikasında ali və orta peşə-ixtisas təhsili müəssisələrinə qəbul zamanı Azərbaycan dili fənnindən imtahan verilməlidir.*

**Maddə 6. Dövlət dilinin televiziya və radio yayımlarında işlənməsi**

*6.1. Azərbaycan Respublikası ərazisində təsis edilən və fəaliyyət göstərən mülkiyyət formasından asılı olmayaraq, bütün televiziya və radio yayımları dövlət dilində aparılır.*

*6.2. Azərbaycan Respublikasının ərazisində təsis edilən və mülkiyyət formasından asılı olmayaraq, dövlət dilində yayımlanan bütün televiziya və radio kanallarının aparıcıları dövlət dilini mükəmməl bilməlidirlər və onların səlis danışıq qabiliyyəti olmalıdır. Televiziya və radio kanallarında dublyaj olunan filmlər və verilişlər dövlətin müəyyən etdiyi dil normalarına uyğun olmalıdır.*

**Maddə 7. Dövlət dilinin xidmət sahələrində, reklam və elanlarda işlənməsi**

*7.1. azərbaycan Respublikası ərazisində bütün xidmət sahələrində, reklam və elanlarda dövlət dili işlənilir. Əcnəbilərə xidmət göstərilməsi ilə bağlı müvafiq xidmət sahələrində dövlət dili ilə yanaşı, digər dillər də tətbiq oluna bilər, zəruri hallarda reklam və elanlarda (lövhələrdə, tablolarda, plakatlarda və s.) dövlət ilə yanaşı, digər dillər də istifadə oluna bilər. Lakin onların tutduğu sahə Azərbaycan dilindəki qarşılığının tutduğu sahədən böyük olmamalı və Azərbaycan dilindəki yazıdan sonra gəlməlidir.*

*7.2. Azərbaycan Respublikasının ərazisində bütün xidmət sahələrində, reklam və elanlarda dövlət dili normalarına uyğun olaraq tətbiq edilməlidir.*

*7.3. Azərbaycan Respublikasının ərazisində istehsal edilən, habelə ixrac edilən malların üzərindəki etiketlər və digər yazılar müvafiq xarici dillərlə yanaşı, dövlət dilində də olmalıdır.*

*7.4. Azərbaycan Respublikasına idxal edilən mal və məhsulların üzərindəki etiketlər və adlar, onlardan istifadə qaydaları haqqında izahat vərəqələri başqa dillərlə yanaşı, Azərbaycan dilinə tərcüməsi ilə müşayiət olunmalıdır.*

**Maddə 8. Dövlət dilinin xüsusi adlarla işlənilməsi**

Azərbaycan Respublikası vətəndaşlarının adları, atalarının adları və soyadlar dövlət dilində yazılır. Azərbaycan Respublikası vətəndaşlarının adları və soyadlarının dəyişdirilməsi müvafiq qanunvericiliklə tənzimlənir.

**Maddə 9. Inzibati ərazi bölgüsü ilə əlaqədar dövlət dilindən istifadə**

"Ərazi quruluşu və inzibati ərazi bölgüsü haqqında" Azərbaycan Respublikası Qanununa uyğun olaraq Azərbaycan Respublikasının inzibati ərazi bölgüsünü təşkil edən inzibati ərazi vahidlərinin-şəhər, rayon inzibati ərazi dairəsi, qəsəbə və kəndlərin adları dövlət dilində yazılmalıdır, onların dövlət dilinin normalarına uyğun olaraq yazılışı müvafiq qurum tərəfindən müəyyənləşdirilir. Bu maddədə göstərilən inzibati ərazi vahidlərinin adları dövlət dili ilə yanaşı xarici dillərdə də yazıla bilər. Belə olan halda inzibati ərazi vahidinin adı əvvəlcə dövlət dilində və ondan sonra xarici dildə verilməlidir.

**Maddə 10. Coğrafi obyektlərin adlarında dövlət dilinin işlədilməsi**

*10.1. Azərbaycan Respublikasında coğrafi obyektlərin adlarının dövlət dilinin normalarına uyğun olaraq yazılışı müvafiq qurum tərəfindən müəyyənləşdirilir.*

*10.2. Azərbaycan coğrafi adlarının xarici dillərdə verilməsi Azərbaycan dilində səslənməsinə, coğrafi adların beynəlxalq yazılış qaydalarına uyğun olaraq müəyyən edilir.*

**Maddə 11. Dövlət dilinin hüquq-mühafizə orqanlarında, Silahlı Qüvvələrdə, notariat fəaliyyətində, məhkəmə icraatında və inzibati xətalar üzrə icraatda işlənməsi**

*11.1. Azərbaycan Respublikasının hüquq mühafizə orqanlarında Azərbaycan Respublikasının dövlət dili işlənir. Dövlət dilini bilməyən şəxslər qanunvericiliklə müəyyən edilmiş qaydada tərcüməçidən istifadə edə bilərlər.*

*11.2. Azərbaycan Respublikasının Silahlı Qüvvələrində, sərhəd qoşunlarında və daxili qoşunlarda qanunvericiliklə müəyyən edilmiş hallar istisna olmaqla, dövlət dili işlənir.*

*11.3. Azərbaycan Respublikasının notariat fəaliyyəti üzrə kargüzarlıq dövlət dilində aparılır. "Notariat haqqında" Azərbaycan Respublikası Qanununa müvafiq olaraq notariat hərəkətlərinin aparılması üçün müraciət etmiş şəxs dövlət dilini bilmirsə və ya notariat hərəkətinin hər hansı başqa bir dildə aparılmasını xahiş edirsə, notarius imkan daxilində tərəfindən rəsmiləşdirilən sənədlərin mətnlərini arzu edilən dildə tərtib edə bilər və ya mətn tərcüməçi tərəfindən ona tərcümə edilə bilər.*

*11.4. Azərbaycan Respublikası məhkəmələrində cinayət mühakimə icraatı dövlət dilində aparılır. Azərbaycan Respublikası Cinayət-Prosessual Məcəlləsi ilə müəyyən edilmiş hallarda və qaydada məhkəmələrdə cinayət mühakimə icraatı digər dillərdə aparıla bilər.*

*11.5. Azərbaycan Respublikası məhkəmələrində mülki işlər və iqtisadi mübahisələr üzrə məhkəmə icraatı dövlət dilində aparılır. Azərbaycan Respublikası Cinayət-Prosessual Məcəlləsi ilə müəyyən edilmiş hallarda və qaydada bütün növ məhkəmə icraatları digər dillərdə aparıla bilər.*

*11.6. Azərbaycan Respublikasında inzibati xətalar üzrə icraat dövlət dilində aparılır. Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsi ilə müəyyən edilmiş hallarda və qaydada inzibati xətalar üzrə icraat digər dillərdə aparıla bilər.*

**Maddə 12. Dövlət dilinin beynəlxalq yazışmalarda işlənməsi**

*12.1. Azərbaycan Respublikasının beynəlxalq yazışmaları dövlət dilində aparılır. Belə yazışmalar zəruri hallarda dövlət dili ilə yanaşı, müvafiq xarici dillərdən birində də aparıla bilər.*

*12.2. Azərbaycan Respublikasının ikitərəfli beynəlxalq müqavilələri, dövlət dilində, çoxtərəfli beynəlxalq müqavilələr isə müqavilə bağlayan tərəflərin razılığı ilə müəyyən edilən dildə(dillərdə) tərtib olunmalıdır.*

*12.3. Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələr (sazişlər və s.) və qoşulduğu beynəlxalq konvensiyalar (protokollar və s.) dövlət dilində nəşr edilməlidir.*

**Maddə 13. Dövlət dilinin normaları**

*13.1. Azərbaycan dilinin orfoqrafiya və orfoepiya normaları müvafiq icra hakimiyyəti orqanı tərəfindən təsdiq edilir. Hüquqi, fiziki və vəzifəli şəxslər həmin normalara əməl etməlidirlər. 13.2. Müvafiq icra hakimiyyəti orqanı 5 ildə bir dəfədən az olmayaraq yazı dili normalarını təsbit edən lüğətin (orfoqrafiya lüğətinin) nəşr olunmasını təmin edir.*

**Maddə 14. Dövlət dilinin əlifbası**

Azərbaycan Respulkiasının dövlət dilinin əlifbası latın qrafikalı Azərbaycan əlifbasıdır.

**Maddə 15. Dövlət dilinin nəşriyyat işində işlənməsi**

*15.1. Dövlət dilinin nəşriyyat işində işlənməsi Azərbaycan Respublikasının qanunvericiliyinə əsasən həyata keçirilir.*

*15.2. Azərbaycan Respublikasında dövlət dilində nəşr olunan çap məhsulları latın qrafikalı Azərbaycan əlifbasında buraxılmalıdır.*

*15.3. Azərbaycan yazı mədəniyyətinin tarixində mühüm rol oynamış ərəb və kiril əlifbalarından xüsusi hallarda (lüğətlərdə, elmi nəşrlərdə, ədəbiyyat göstəricisi və s.) istifadə edilə bilər.*

**Maddə 16. Dövlət dilinin vətəndaşların şəxsiyyətini təsdiq edən rəsmi və vahid nümunəli sənədlərdə işlədilməsi**

*16.1. Azərbaycan Respublikası vətəndaşlarının doğum və nikah haqqında şəhadətnamələri, şəxsiyyət vəsiqələri əmək kitabçaları, hərbi bileti və yalnız ölkə daxilində etibarlı sayılan digər rəsmi və vahid nümunəli sənədlər dövlət dilində tərtib edilir.*

*16.2. Azərbaycan Respublikası vətəndaşlarının pasport və təhsil haqqındakı sənədləri, zəruri hallarda digər sənədləri dövlət dili ilə yanaşı xarici dillərdə də tərtib edilir.*

**Maddə 17. Dövlət dilinin dövlət hakimiyyəti və yerli özünüidarəetmə orqanlarının, hüquqi şəxslərin, onların nümayəndəliklərinin və filiallarının, idarələrin adında işlədilməsi**

Azərbaycan Respublikası dövlət hakimiyyəti və yerli özünüidarəetmə orqanlarının, hüquqi şəxslərin, onların nümayəndəliklərinin və filiallarının, idarələrin adları Azərbaycan dili normalarına uyğun olaraq yazılır. Göstərilən təsisatların adını əks etdirən lövhələr, blanklar, möhürlər və kargüzarlıqla bağlı rəsmi xarakterli bütün digər ləvazimatlar dövlət dilində tərtib olunur.

**Maddə 18. Dövlət dilinin qorunması və inkişafı**

*18.1. Azərbaycan Respublikasında dövlət dilinə qarşı gizli, yaxud açıq təbliğat aparmaq, bu dilin işlənməsinə müqavimət göstərmək, onun tarixən müəyyənləşmiş hüquqlarını məhdudlaşdırmağa cəhd etmək qadağandır*

*18.2. azərbaycan Respublikasının ərazisindəki bütün kütləvi informasiya vasitələri (mətbuat, televiziya, radio və s.), kitab nəşri və digər nəşriyyat işi ilə məşğul olan qurumlar Azərbaycan dilinin normalarına riayət olunmasını təmin etməlidir.*

# III FƏSİL

## Yekun müddəaları

**Maddə 19. Qanunun pozulmasına görə məsuliyyət**

Bu Qanunu pozan hüquqi, fiziki və vəzifəli şəxslər Azərbaycan Respublikasının qanunvericiliyində nəzərdə tutulmuş qaydada məsuliyyət daşıyırlar.

**Maddə 20. Qanunun qüvvəyə minməsi**

*20.1. Bu Qanun dərc olunduğu gündən qüvvəyə minir.*

*20.2. Bu Qanun qüvvəyə mindiyi gündən "Azərbaycan Respublikasında Dövlət dili haqqında" Azərbaycan Respublikasının 22 dekabr 1992-ci il tarixli 413 nömrəli Qanunu qüvvədən düşmüş hesab edilir.*

**Heydər Əliyev**

**Azərbaycan Respublikasının Prezidenti**

Bakı şəhəri, 30 sentyabr 2002-ci il.

**“Azərbaycan Respublikasında Dövlət dili haqqında” Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə**

**Azərbaycan Respublikası Prezidentinin**

**FƏRMANI**

**“Azərbaycan Respublikasında Dövlət dili haqqında”** Azərbaycan Respublikası Qanununun qüvvəyə minməsi ilə əlaqədar həmin Qanunun tətbiq edilməsini təmin etmək məqsədilə qərara alıram:

**1. Azərbaycan Respublikasının Nazirlər Kabinetinə tapşırılsın ki, bir ay müddətində:**

- qüvvədə olan qanunvericilik aktlarının Azərbaycan Respublikasında Dövlət dili haqqında Azərbaycan Respublikası Qanununa uyğunlaşdırılması barədə təkliflərini hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

-nazirlər Kabinetinin və müvafiq mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının həmin Qanuna uyğunlaşdırılmasını təmin etsin və bu barədə Azərbaycan Respublikası Prezidentinə məlumat versin;

- həmin qanunun pozulmasına görə məsuliyyət növlərini müəyyən edən qanunvericilik aktlarının layihəsini hazırlayıb Azərbaycan Respublikası Prezidentinə təqdim etsin;

-həmin qanunun 4.2-ci maddəsində nəzərdə tutulmuş “müvafiq icra hakimiyyəti orqanları”nın səlahiyyətlərini həyata keçirən icra hakimiyyəti orqanlarına dair təkliflərini Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

- həmin qanunun 9-cu və 10.1-ci maddələrində nəzərdə tutulmuş müvafiq qurumun səlahiyyətlərini həyata keçirən orqana dair təkliflərini Azərbaycan Respublikasının prezidentinə təqdim etsin;

-“Azərbaycan Respublikasında Dövlət dili haqqında” Azərbaycan Respublikası qanunundan irəli gələn məsələləri öz səlahiyyətləri daxilində həll etsin.

**2.**Müəyyən edilsin ki, “Azərbaycan Respublikası dövlət dili haqqında” Azərbaycan Respublikası qanunun maddələrində nəzərdə tutulmuş “müvafiq icra hakimiyyəti orqanları”nın səlahiyyətlərini Azərbaycan Respublikasının Dil Komissiyası həyata keçirir.

**3.** Bu Fərman dərc olunduğu gündən qüvvəyə minir.

**Heydər Əliyev**

**Azərbaycan Respublikasının Prezidenti**

Bakı şəhəri, 02 yanvar 2003-cü il.

## Müstəqillik illərində Azərbaycan dilinin inkişafına dövlət qayğısı

Ulu öndər Heydər Əliyev müstəqil Azərbaycan Respublikasında hakimiyyəti dövründə ana dilimizin inkişafı ilə bağlı bir neçə fərman və sərəncam imzalayıb.Prezidentin 9 avqust 2001-ci il tarixli sərəncamı ilə müstəqil respublikamızda “Azərbaycan əlifbası və Azərbaycan dili günü” qeyd edilir. Həmçinin 1999-cu ilin noyabr ayında Birləşmiş Millətlər Təşkilatının verdiyi qərarla hər il 21 fevral Beynəlxalq Ana Dili Günü kimi dünyanın əksər ölkələrində, o cümlədən bizdə də geniş qeyd olunur. Heydər Əliyev cənabları əsrlərlə yaradılmış bir sərvəti məhv olmaqdan qorudu, Azərbaycan adlı bir məmləkətin olduğunu, onun varlığını bütün dünyaya bəyan etdi, belə bir zəngin torpağın, dərin zəkaların, əvəzsiz nemətlərin sahib olduğumuzla fəxr etdiyimiz, “Millətimin imzalar içində imzası olduğunu” böyük qürurla aləmə çatdırdı. Eyni zamanda, bütün bunları dogma Azərbaycan dilində həyata keçirdi, bununla o, həm böyük ideayalar sahibi olduğunu üzə çıxartdı, həm də Azərbaycan dilinin geniş imkanlara malik olduğunu bir daha sübuta yetirdi. Bu gün də qulaqlarımızda səslənən: “Mən fəxr edirəm ki, Azərbaycanlıyam!”ifadələri bizi yenə də səfərbər olmağa səsləyir.

Çoxları Azərbaycan dilini sevməyi, ona böyük ehtiramla yanaşmağı sözün əsl mənasında Heydər Əliyevdən öyrənmişdi. Çünki, ümummilli liderimiz yenidən hakimiyyətə qayıtdıqdan sonra rəhbər vəzifədə çalışanlara ciddi şəkildə bu dili öyrənməyi tapşırdı. Hələ televiziya ilə yayımlanan müsahibələrin birində yüksək vəzifəli məmurlarla bu barədə danışığı, onlara verdiyi töhmətlər hələ də xalq arasında söylənir. Onun: “...öyrənir, öyrənin bu dili. Bu dili nə vaxtadək öyrənməyəcəksiniz?,’- deməsi bir proqram təsiri bağışlayırdı.

Heydər Əliyevin ana dilinə bu cür ciddi münasibəti çox insanları düşünməyə, “mən öz dilimi nə dərəcədə bilirəm, onu qorumaq üçün nə edirəm?” suallarına cavab axtarmağa vadar edir.

Ulu öndərin ana dilinin taleyi barədə təməl düşüncələrini şərtləndirən dil quruculuğundakı ideya istiqaməti bu gün də müasir siyasi baxışlara uyğun səviyyədə aparılmaqdadır. Bu istiqamətdə atılmış vacib addımlardan biri də ulu öndərin 2003-cü ildə təsdiq etdiyi "Azərbaycan Respublikasında Dövlət dili haqqında" Azərbaycan Republikasmın Qanunudur. Bu qanunda Azərbaycan dili müstəqil dövlətçiliyin əsaslarından biri olaraq qəbul edilmiş, onun digər dillər arasında yaşaması və təkmilləşdirilməsi sahəsində konseptual ideyalar irəli sürülmüşdür. Belə bir qanunun qəbulu ölkə Prezidenti kimi Heydər Əliyev tərəfindən dövlətin milli dil, milli kimlik siyasətinin uğurla aparılmasının nəticəsi olaraq ictimai xarakter daşıyır və bununla yanaşı, həm də ana dilinə dövlət dili statusu qazandırmışdır. Ölkə həyatında dilin tarixi, müasir vəziyyəti və onun hüquqlarının müdafiə olunması, hüdudlarının genişlənməsi məsələləri daim gündəmdə qalmaqla, böyük dövlət əhəmiyyəti daşıyır. Ümummilli liderimiz Heydər Əliyev dilimizin saflığını, mənəvi zənginliyini qorumağın zəruriliyini çıxışlarında hər zaman vurğulayır, dövlət idarəçiliyində bu zəruri şərtə əməl etməyin vacibliyini önə çəkirdi. Bununla yanaşı qeyd edirdi ki, Azərbaycan dili dünyanın inkişaf etmiş dillərindən olduğundan müasir dövrün ən müxtəlif ictimai-siyasi, elmi-mədəni, fəlsəfi-intellektual məzmun və hadisələri, informativ mənzərəsi bu dildə çevik şəkildə səlistliklə əksini tapa bilir.

Müstəqillik illərində Azərbaycan Prezidenti İlham Əliyevin ana dilinin dövlət dili kimi geniş, maneəsiz işləkliyi üçün göstərdiyi siyasi, milli iradə, gördüyü məqsədyönlü işlər də Azərbaycan dilinin nüfuzunun yüksəlməsinə və türk dilləri arasında mötəbər mövqe qazanmasına xidmət edir. Dövlət başçısı kini onun 2004- cü il yanvarın 12-də imzaladığı "Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında" , 2004-cü il yanvarın 14-də təsdiq etdiyi “Azərbaycan Milli

Ensiklopediyasının nəşri haqqında", eləcə də 2007-ci il 30 dekabr tarixli "Dünya ədəbiyyatının görkəmli nümayəndələrinin Azərbaycan dilində nəşri nəzərdə tutulan əsərlərinin siyahısının təsdiq edilməsi haqqında" sərəncamları ana dilinin həyatımızın bütün sahələrində tam və müfəssəl tətbiqini gerçəkləşdirmişdir. 23 may 2012-ci ildə "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" Azərbaycan Respublikası Prezidentinin Sərəncamı Azərbaycan dilinin tətbiqi və inkişafı üçün yeni bir addımdır. Bu sənəddə Azərbaycan dilinin tarixi əsasları barədə mükəmməl təsəvvür yaradılmış və inkişaf problemləri haqqında sistemli şəkildə bəhs edilmişdir. Xüsusən, Azərbaycan dilinin mənşəyi ilə bağlı davam edən yanlış konsepsiyaya son qoyulması, tarixi faktlara əsaslanaraq Azərbaycan dilinin dövlət dili kimi yaşaması, inkişaf etdirilməsi üçün həm inzibati, hüquqi-siyasi, həm də elmi-nəzəri istiqamətlər müəyyənləşdirilməsinin zəruriliyi qeyd edilir.

Aprel ayının 9-da Azərbaycan Prezidenti İlham Əliyev tərəfindən imzalanan daha bir Sərəncam da ölkəmizdə dil siyasətinin uğurla həyata keçirildiyini bir daha göstərir. "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı" Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə təsdiq edilmişdir. Dövlət Proqramının məqsədi Azərbaycan dilinin istifadəsinə və tədqiqinə dövlət qayğısının artırılmasını, Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsini, ölkədə dilçilik araşdırmalarının əsaslı surətdə yaxşılaşdırılmasını təmin etməkdir. Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun inkişafı, qorunması, elektron məkanda daha geniş istifadəsi və ölkədə dilçiliyin inkişaf etdirilməsi mexanizminin yaradılması əsas vəzifə olaraq qarşıya qoyulur.

Dilçilik sahəsində yüksək ixtisaslı kadrların hazırlanmasının təkmilləşdirilməsi, dünya dilçilik elminin müasir inkişaf meyillərini nəzərə almaqla, elmi tədqiqatların prioritet istiqamətlərinin müəyyənləşdirilməsi kimi məsələlər Azərbaycan dilinin qorunmasında önəmlidir. Dünyaya inteqrasiya olunduğumuz bir zamanda dünyanın aparıcı elmi mərkəzləri ilə əməkdaşlıq dövrün tələbinə çevrilib. Bu baxımdan dünyanın aparıcı mərkəzləri ilə beynəlxalq elmi əməkdaşlığın inkişaf etdirilməsi, dilçiliyin aktuallıq kəsb edən müxtəlif problemlərinə dair birgə tədbirlərin həyata keçirilməsi maraq kəsb edir.

Dilin inkişafını və ədəbi dil normalarının qorunmasını təmin edən qanunvericilik bazasının təkmilləşdirilməsi, dil və nitq mədəniyyətinin yüksəldilməsi, Azərbaycan dilinin lüğət tərkibinin və qrammatik normalarının sistemləşdirilməsi kimi məsələlər Dövlət Proqramından irəli gələn zəruri vəzifə kimi qarşıya qoyulur.

Dünya dilçilik elminin müasir inkişaf meyilləri nəzərə alınaraq, Azərbaycan Milli Elmlər Akademiyasında və respublikanın digər elmi müəssisələrində, ali məktəblərində aparılan fundamental və tətbiqi tədqiqatların prioritet istiqamətlərinin müəyyənləşdirilməsi Dövlət Proqramında öz əksini tapıb. Bu baxımdan Azərbaycan dilinin və dilçilik elminin inkişafı ilə bağlı qısamüddətli və uzunmüddətli kompleks elmi proqramlar işlənilib həyata keçiriləcək.

Azərbaycan dilinin dövlət dili kimi inkişafı, tədrisi, lüğət ehtiyatının zənginləşdirilməsi, qrammatik quruluşunun qorunması, söz yaradıcılığı prosesinə nəzarətin gücləndirilməsi və nitq mədəniyyəti sahəsində kompleks tədbirlərin həyata keçirilməsi də diqqətdən kənarda qalmamışdır. Mətbuat orqanlarında, televiziya və radio kanallarında, internet resurslarında və sosial şəbəkələrdə ədəbi dil normalarının pozulması hallarının qarşısını almaq üçün mexanizmlər müəyyənləşdiriləcək. Belə ki, televiziya və radio verilişlərində, yazılı və elektron mətbuatda Azərbaycan ədəbi dilinin

normalarına əməl olunmasını təmin etmək məqsədilə teleradio şirkətləri və kütləvi informasiya vasitələri sahəsində çalışan mütəxəssislərin dil hazırlıqlarının yüksəldilməsinin təmin edilməsi də rəsmi sənəddə yer alıb.

Dövlət Proqramı Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsi və inkişafında, yüksək ixtisaslı kadrların hazırlanmasında əhəmiyyətli bir sənəddir. Azərbaycan dilinin bütün ölkə miqyasında - mədəniyyət, elm, iqtisadiyyat, hərb,səhiyyə, siyasət, tədris və təlim sahəsində tətbiq olunması sənəddə zəruri və əməli cəhətdən əsaslandırılır və Azərbaycan dilçiliyi ilə bağlı görüləcək işlərin əsas konturları verilir. Dövlət dilini qorumaq hər bir dövlətin mühüm siyasi-ideolbji vəzifələrindən, əsas milli, texniki maraqlarından biridir. Azərbaycan dilinin tarixi hüquqlarını qorumaq, onun mənəvi-siyasi nüfuzunu həm ölkə daxilində, həm də ölkə xaricində yüksəltmək sərəncamda xüsusi qeyd edilir. İqtisadi əlaqələr genişləndikcə, ictimai-siyasi münasibətlər, eləcə də elmi-texniki tərəqqi dilin zənginləşməsini zəruri edir. Ünsiyyət vasitəsi olan dilin bugünkü inkişaf səviyyəsinə rekonstruktiv yanaşma təsdiqləyir ki, dilin inkişafı cəmiyyətin səviyyəsi, ictimai-siyasi hadisələrlə, qlobal dəyişikliklərlə əlaqədardır. Qloballaşan dünyada informasiya verən və onu qəbul edən mexanizm, yəni dil dövlətçiliklə tənzim olunduqda perspektivləri artır, işlənmə əhatəsi genişlənir, informasiya intensivliyi yüksəlir. Müstəqil dövlətçilik mərhələsi dilin inkişafının ən etibarlı bazasıdır. Dövlət dili dil siyasətinin əsas anlayışıdır və milli dilin dövlət dili səviyyəsinə yüksəlməsi ölkəmizin apardığı dil siyasətinin real nəticəsidir. Dil quruculuğu da dil siyasəti ilə bağlı olan anlayışıdır, yəni dilə şüurlu və məqsədyönlü təsirdir. Dil quruculuğu dil siyasətinin tərkib hissəsidir. Hazırkı dövrdə cəmiyyətin bir çox fəaliyyət sahələrinə nüfiız edən qloballaşmanın dilə birbaşa təsir dairəsi onun leksik səviyyəsi ilə bağlıdır. Məhz beynəlxalq aləmə, Avropaya birbaşa çıxış dilin terminologiyasına təsir göstərir.

Dilimizə, xüsusən mənəviyyatımıza diqqətin, dəyərin artdığı bir məqamda özümüzü daha inamlı hiss edirik. İndi yeni əlifbaya keçirilməsi, dünya mədəniyyətinə inteqrasiya, ədəbi nümunələrin yenidən nəşri, məktəblərə, digər Təhsil müəssisələrinə çatdırılması hər birimizin bu sahədə məsuliyyətini bir daha artırır. İndi istər müəllimlər, istərsə də şagirdlər dövlət tərəfindən yaradılmış şəraitdən səmərəli şəkildə istifadə etməyə, milli-mədəni səviyyəsini artırmağa çalışmalıdırlar. Dövlətimiz üçün digər qayğıların az olmadığı belə bir dövrdə, torpaqlarımızda müharibə getdiyi, işğalçılarla mübarizə apardığımız bir vaxtda vətəndaşların belə bir qayğı ilə əhatə olunması hər birimizdə qürur hissi oyadır. Önündə bir Heydər Əliyev qüdrəti, Məmməd Araz harayı, Bəxtiyar Vahabzadə yanğısı, Zəlimxan Yaqub çağırışı duyursan. İstər-istəməz qəlbindən: “Qalx ayağa məmləkətim, dur ayağa millətim...” kəlmələri keçir. Və elə bu anda da fikirləşirsən ki, nə yaxşı ki, Vətənim var, nə yaxşı ki, elim var, nə yaxşı ki, duyğularımı əks etdirməyə qadir olan dilim var! İndi bu dildə dünyanın hər yerində, hər guşəsində sözlər səslənir, musiqi dillənir. İdmançılarımız bu yurdun şərəfini ləyaqətlə göylərə ucaldır, musiqiçilərimiz dilimizin şirinliyini xalqlar, millətlər arasında sevə-sevə tərənnüm edir, tarixçilərimiz, siyasətçilərimiz Azərbaycan həqiqətlərini yüksək tribunalardan bütün dünyaya bəyan edirlər. Xüsusən, Heydər Əliyevin layiqli davamçısı, artıq dünya miqyasında xüsusi mövqeyi olan İlham Əliyev cənabları bu xalqın, bu millətin yüksək zirvələrdə çox ləyaqətli təmsilçisi olduğunu hər an sübuta yetirir. Özü də ana laylası qədər həzin, övlad məhəbbəti qədər şirin Azərbaycan dilində. “Ana dili hər bir millətin varlığının simvoludur, millətin möhürüdür” kəlmələrinin əzəmətini hər işində, əməlində yaşadır.

## Nitq mədəniyyətinin tarixinə dair

Nitq mədəniyyəti ümumbəşəri dəyər kimi çox qədim tarixə malikdir. Nitq mədəniyyəti – ritorika qədim Yunanıstanda, Romada, Ərəbistanda, Çində geniş yayılmışdı (Bu haqda yeri gələndə bəhs ediləcək). Azərbaycanda isə nitq mədəniyyətinin – ritorikanın bu və ya digər elementi dağınıq halda min ildən bəridir ki, mövcuddur. Azərbaycanın şair və mütəfəkkirləri nitqin gözəlliyi, ekspres-sivliyi, təmizliyi, konkretliyi və s. cəhətləri haqqında çox bəhs etmişlər. Lakin bir müstəqil sahə olaraq nitq mədəniyyəti Azərbaycanda XX əsrin ortalarında diqqəti cəlb etmiş, Elmlər Akademiyasının Dilçilik İnstitutu nəzdində nitq mədəniyyəti şöbəsi açılmış, 80-ci illərdən başlayaraq bəzi ali məktəb-lərdə tədris planına salınmışdır. 1969-cu ildən başlayaraq Azərbaycan dilinə diqqət artdığı kimi, nitq mədəniyyəti məsələlərinə də diqqət artırılmışdır. Müstəqillik illəri dilimizin, sosial həyatımızın bütün sahələrində əlamətdar olduğu kimi, dilçiliyimizin də inkişafına gündəlik dövlət qayğısının göstərilməsi ilə əlamətdardır.

Bu dövlət qayğısı dilçiliyimizin bütün sahələri qarşısında geniş inkişaf perspektivləri açdığı kiıni, Azərbaycan nitq mədəniyyəti problemlərinə yanaşmanı da kökündən yaxşılaşdırmağı tələb edir. Buna görə də bir fənn olaraq nitq mədəniyyəti təhsil sisteminin aktual problemlərindən biri olmalıdır. APU-da, Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında və digər ali təhsil ocaqlarında Azərbaycan dili və nitq mədəniyyəti müstəqil fənn kimi tədris edilir.

Azərbaycan dili və nitq mədəniyyəti fənninin tədrisinə başlayarkən ilk növbədə, dilin ictimai kateqoriya olması, dilin qədimliyi, şifahi ümumxalq danışıq dili ilə ədəbi dilin üzvü bağlılığı olması barədə şərh vermək lazımdır. Nitq mədəniyyəti fənninin tarixiliyi, antik dövr natiqlik mədəniyyəti və məktəbləri barədə məlumat vermək lazımdır.

Tarixi qaynaqlardan məlum olur ki, lap qədim zamanlardan məzmunlu, obrazlı, aydın yığcam, təsirli nitqə malik olan insanlar cəmiyyət tərəfindən həmişə yüksək qiymətləndirilmişdir. Nitqin gözəlliyi və ona sahib olmağın yolları, vasitələri böyük şəxsiyyətlərin daim diqqət mərkəzində olmuş-dur. Miladdan əvvəl Qədim Misirdə, Hindistanda, Çində, Babilistanda və başqa yerlərdə görkəmli natiqlər yetişmişdir. Lakin natiqlik sənətinin, nitq mədəniyyətinin əsl vətəni qədim Yunanıstan ol-muşdur. Natiqlik də bir elm kimi Yunanıstanda meydana gəlmiş, inkişaf etmişdir. Yunanıstanın ictimai-siyasi həyatındakı mübarizələr, iqtisadiyyatda baş verən irəliləyiş, elmi tərəqqi və sair ilə bağlı Afina şəhər dövlətində natiqlik sənəti inkişaf etməyə, yüksəlməyə başlayır. Natiqlik sənətindən təsirli və kəskin silah kimi istifadə etməyə çalışırdılar. E.ö. VII-IV əsrlərdə fəaliyyət göstərən yunan natiqlik məktəbi Aristotel, Asntifont, Andokid, Lisiy, İsey, İ. Sokrat, Molon, Kvintilian, Demosfen, Hipeorid, Esxil kimi görkəmli natiqlər yetişmişdir. Həmin məktəblərdə dərs deyən bu görkəmli natiqlər bu sənəti

həm nəzəri, həm də praktik şəkildə öyrənənlərə aşılamışlar. Bu dövrdə natiqlik sənətinin nəzəriyyəsindən bəhs edən “Ritorika” elmi də yaranmışdır.

Antik yunan natiqlik sənətinin yaranması və inkişafında Aristotelin xüsusi rolu olmuşdur. Aristotel 335-ci ildə “Ritorika” adlı əsərini yazıb natiqlik sənətinin elmi əsaslarını vermiş, sənəti insan fəaliyyətinin xüsusi növü kimi qiymətləndirmişdir. Natiq nitqinin quruluşunu, üslubunu, orfoepiyasını, ifadəlilik vasitələrini geniş şəkildə şərh etmişdir. “Ritorika” əsəri üç hissədən ibarətdir: a)Nitqin tərtibi prinsipi; b) Natiq üçün lazım olan şəxsi keyfiyyət və qabiliyyət; e) Nitqin texnikası, vasitələri və priyomları.

Aristotel nitqin üsluba, məqsədə və şəraitə uyğun qurulmasına daha çox fikir verir və göstərirdi ki, üslubun əsas mahiyyəti onun aydınlığı ilə bağlıdır. Üslub nitqin predmetinə uyğun olmalıdır. O, natiqin məharətinin beş cəhətini xüsusi qeyd edirdi.

**1.** Materialın icadı və onun hazırlanması.

**2.** Planın tərtibi. Materialın plan üzrə müvafiq formaya salınması.

**3.** Həmin materialın öyrənilməsi və yadda saxlanılması.

**4.** Nitqin söylənilməsi, orfoepiya (ədəbi tələffüz), intonasiya, emosiya və s. məsələlərin nəzərə alınması və onlara əməl olunması.

**5.** Materialın şifahi şərhinin ədəbi-üslubi cəhətdən işlənməsi.

Aristotelin yaxşı nitq üçün materialın düzgün seçilməsi, planın tutulması, onun mükəmməl öyrənilməsi, söyləmə zamanı uyğun üslubun müəyyənləşdirilməsi, orfoepik və informasiya qaydalarına əməl edilməsi, emosiyaların özünəməxsus forma ilə verilməsi mühüm şərt hesab edirdi.

Qədim Yunanıstanda natiqlik sənətinin inkişafına güclü təsir göstərən səbəblərdən biri də Solon qanunları olmuşdur. Bu qanunlara əsasən hər bir afinalı məhkəmədə öz hüququnu müdafiə etməyi bacarmalı idi. Buna görə də hər bir afinalı hüquqi biliklərə yiyələnməyi, həm də öz hüquqlarını müdafiə etməyi bacarmalı idi. Belə bir tələb əsasında afinalılar hüquqi biliklərə yiyələnməyə, həm də öz hüquqlarını müdafiə etmək üçün aydın, təsirli, məntiqi, sübutlu, rabitəli danışa bilməyə xüsusi səy göstərirdilər. Afinada məhkəmə proseslərini 501 nəfər münsiflər heyətindən ibarət olan vətəndaş aparırdı. Kimin müqəssir olub-olmaması əksəriyyətin səs verməsi yolu ilə müəyyənləşdirilirdi.O zaman məhkəmədə vəkillər fəaliyyət göstərmədiklərindən vətəndaşlara Hüquq təhsili almışdı. Onlar xüsusi muzdla məhkəmədə baxılacaq işin məzmun və mahiyyəti ilə bağlı nitqlər yazırdılar. İşi məhkəməyə düşən afinalı həmin nitqi əzbərləyir və məhkəmə prosesində özünü müdafiə edirdi, bu işdə onlara həmçinin *loqoqraflar* kömək edirdilər.

Demosfen öz dövrünün görkəmli loqoqrafı və natiqlərindən məşhuru olmuşdur. Antik natiqliyin yaranması və inkişafında xüsusi rol oynamışdır. Nitq orqanları qüsurlu olan Demosfen sözləri daha aydın deyə bilmək üçün ağzına xırda daşlar alaraq dəniz kənarında nitq söyləyər, danışarkən çiynini atmağı tərgitmək üçün tavandan asılı cidanın altında durarmış. Uzunmüddətli məşqlər Demosfeni natiqlik sənətinin zirvəsinə yüksəltdi. Siseron onun haqqında demişdir; "Kim Demosfen olmaq istəmirsə, o natiq deyil".

Demosfen natiqlik sənəti ilə bağlı nəzəriyyəçilərdən biri idi. O ritorika ilə bağlı bir sıra əsərlər yazmışdır. Ritorika elmini nəzəri və praktik cəhətdən inkişaf etdirmiş, faydalı fikirlər, mülahizələr söyləmişdir. Natiqlik sənətində aşağıdakı tələblərə əməl olunmalıdır: 1) materialın toplanması. 2) məqsədəuyğun söylənilməsi üçün planın tərtibi. 3) nitqin məzmununun öyrənilməsi, mənimsənilməsi. 4) məzmunun dinləyicilər qarşısında söylənilməsi.

Demosfenin tələffüzü, danışıq tərzi aydın, anlaşıqlı idi. O özünün dərin məntiqi, rəngarəng informasiya çalarları, müraciət formaları, ritorik sualları ilə dinləyiciləri cəlb edə bilirdi. Demosfen nitqlərində Afinanın satqın və fəiliyyətsiz hakimlərini ifşa edir, onları ədalətli olmağa, düzgün siyasət yeritməyə çağırırdı. Bu keyfiyyətlərinə görə afinalılar böyük ehtiram və inamla danışan Demosfenin nitqinə həvəslə qulaq asır, onu axıra qədər dinləyirdilər.

Afina dövlətinin tənəzzülü ilə bağlı yunan natiqlik sənətində də geriləmələr baş verir. Gözəl nitq öz siyasi xarakterini itirir, canlı, konkret şəraitdən uzaqlaşır, daha çox təntənə nitqinə çevrilir.

Yunan natiqliyinin tənəzzülündən sonra onun mərkəzi qədim Romaya köçür. Romada natiqlik sənəti yaranmağa başlayır.

Qədim dünyanın bu dövləti natiqlik sənətinə bir sıra görkəmli şəxsiyyətlər bəxş etmişdir. Katon (b.e.ə. 163-132), Antoni Mark (b.e.ə. 80-30) kimi nitq ustaları Roma natiqlik məktəbinin yetişdirmələri olmuşlar. Bunların içərisində bir natiq kimi dünya şöhrəti qazanmış görkəmli dövlət xadimi, ritorika alimi, mütəfəkkir Mark Tuli Siseron (b.e. ə.106-43.) olmuşdur. O, natiqlik sənəti ilə bağlı üsusi ilə fərqlənirdi. "Natiqlik haqqında", "Brut, yaxud məşhur natiqlik haqqında" və "Natiq" traktatlarını yazmışdır.

Mark Tuli Siseron nitqində giriş, təhkiyə və fikir təsdiq edən sübutlara, faktlara, nəticə məsələlərinə üstünlük verirdi. Yeri gəldikcə tarixi lətifələrdən, haqqında danışdığı hadisələrdən, atalar sözü və xalq məsəllərindən, bədii sual, xitab və nidalardan məharətlə istifadə etmişdir.

Qədim Roma natiqlik məktəbibin nümayəndələrindən biri də Mark Fabiy Kvintilian(42-118) olmuşdur.O, "Natiqlik təhsili" adlı 12 kitabdan ibarət əsər yazmışdır Həmin kitablarda natiqlik sənətinin elementləri və ritorikanın mahiyyəti, nitq üzərində işin mərhələləri (mövzunun seçilməsi,

yerləşdirilməsi, yadda saxlanması, nəqli, aydın tələffüzü), natiqlik sənətinə, natiqlik fəaliyyətinə verilən tələblər və s. məsələlər şərh olunmuşdur. O, natiqlik nəzəriyyəçisi kimi tanınmışdır.

Roma natiqlik məktəbi sənətinin inkişafı uzun sürmür. Respublikanın süqutundan sonra natiqlik sənəti tənəzzülə doğru gedir. Diktatura, imperiya natiqliyin qarşısını alır, bu sənət din xadimlərinin əlində moizə söyləmək, dini qanunları, ehkamları təbliğ etmək vasitəsinə çevrilir.

Natiqlik sənətinin tarixi ilə bağlı eyni vəziyyət Rusiyada, eləcə də Azərbaycanda XVII, XVIII və XIX əsrlərə qədər davam etmişdir.

Rusiyada natiqlik sənətinin inkişafı böyük rus alimi, mahir söz ustası M.V.Lomonosovun adı, fəaliyyəti ilə bağlıdır. O, 1748-ci ildə "Краткое руководство краткоречи" adlı kitab nəşr etdirmişdir. Bu kitab Ritorikanın əsasında yazılmışdır. M.V.Lomonosova görə, natiq dinləyicisinin hissiyatına təsir etməlidir. Bunun üçün o, natiqliyin təsirgöstərmə vasitələrindən istifadə etməyi bacarmalıdır.

Rus natiqlik sənətinin inkişafında XIX əsrdə yaşayıb-yaratmış yazıçıların, şairlərin, filosofların, siyasətçilərin, din xadimlərinin, dilçi alimlərin və başqalarının da fəaliyyəti böyük olmuşdur. Ölkənin böyük şəhərlərində fəaliyyət göstərən məhkəmələrdə səslənən nitqlər də rus natiqlik sənətinin bu dövrdə formalaşmasına müsbət təsir göstərmişdir. XIX əsrin 60-cı illərində Rusiyada məhkəmə islahatları keçirilir. Məhkəmədə iclasçıların iştirakı təmin olunur. Məhkəmə prosesi, bir növ, demokratikləşdirilir.

Saltıkov-Şedrin, Dostayevski, Çexov və başqaları tez-tez məhkəmə salonlarına gedər, oradakı çıxışları dinləyərdilər. Natiqlik sənətinə qədim mədəniyyət tarixi olan Şərqdə də maraq yaranaraq, ritorika elminə insan fəaliyyətinin xüsusi növü kimi yüksək qiymət verilmişdir.

Filosof, siyasətçi, qanunşünas, böyük islahatçı, islam dininin banisi Məhəmməd Peyğəmbər ədəb, əxlaq, iffət. vicdan, təvazökarlıq, təmizlik, namuslu olmaq və s. insani keyfiyyətlər sırasında natiqlik məharətinə xüsusi əhəmiyyət vermiş, göstərmişdir ki, natiqliyin bəlağəti bəzən cadu və sehr təsiri bağışlayır.İnsanın gözəlliyindən biri də onun gözəl danışmasıdır.

İslamın ikinci böyük siyasətçisi olan Həzrət Əlinin zəngin irsində təlim-tərbiyə məsələləri ilə yanaşı, danışıq, onun etik qaydaları barədə ibrətamiz fikirlər söylənmişdir: əqli çox olan adamın sözü çox az olar; hər bir adam öz dilinin altında gizlənir, danışanın özünə yox, sözünə daha çox diqqət et, ölç, biç sonra danış, kəs; düşün, daşın, sonra danış; anla, bil, sonra et və s.

Şərq dünyasının böyük alimi Əli ibn Sina (980-1037), şair və filosov – Firdövsi (934-1024), Əbu Reyhan Biruni (973-1048), Mahmud Kaşqarlı (1029-1126), Sədi Şirazi (1184-1291) və başqaları öz əsərlərində sözə yüksək qiymət vermiş, danışıq qabiliyyətinin, sözdən istifadə bacarığının insan

ləyaqəti ilə üzvi bağlı olduğunu həkimanə sözlərlə, ifadələrlə oxucularına çatdırmışlar. Bu baxımdan Sədi Şirazinin fikirləri daha səciyyəvidir.

Nədir dil ağızda, ey ağlı olan
Hünər xəzinəsinə açardır – inan!
Tələsik söyləmə sözünü bir dəm,
Fikrini kamil de, gec olsa nə qəm…
Əvvəl bir düşün, sonra dilə gəl,
Divar tez yıxılar, olmasa təməl!

.

Azərbaycanda da natiqlik sənətinin yaranması tarixi qədimdir. Bu sənət xalqın ədəbi-estetik fikri ilə bağlı qədim və orta əsrlərdə yazıçı və şairlərin şərh, risalə, təzkirə, bədii əsərlərində yaranmış, təşəkkül tapmış, həmin mənbələrdə sözün qüdrəti ilə bağlı dəyərli fikirlər söylənilmişdir.

Azərbaycan şifahi xalq ədəbiyyatında söz, gözəl danışmaq qabiliyyəti bəşəriyyətin təməl daşı kimi qiymətləndirilmişdir. Ulu əcdadlarımız sözün real gücünü, təbii qüdrətini həmişə yüksək qiymətləndirmişlər. İnsan cismən yox olsa da, onu tarixdə yaşadan sözdür. Bizim çağdaş tariximiz sözün tarixidir. Məsələn, Nizaminin, Füzulinin, Xətainin, Vaqifin, M.F.Axundovun və başqalarının dövrü… Nizaminin dövründə yaşamış sənətkarlar, hökmdarlar ancaq Nizamiyə görə tanınır, yad edilirlər. Söz müqəddəs, sözü cilalayan ustad isə müqəddəslərin müqəddəsidir. Söz güldürür, söz ağladır, söz sevindirir, kədərləndirir, ümid verir. Söz var dağa çıxarar, söz var dağdan endirər. Söz bir olsa dağ yerindən oynayar. Söz həm məlhəmdir, həm də yara.Söz var gələr keçər, söz var dələr keçər. Antik dövrün qüdrətli loğmanı Hippokrat demişdir ki, təbabət üç nəhəngin çiynində dayanır: bitki, bıçaq, söz. Min il bundan əvvəl Firdövsi yazırdı: "Sözün qədrini bilin, həyatda ancaq söz yadigar qalır".

Orta əsrlər dövrünün ən görkəmli alimlərindən biiri olan Nəsrəddin Tusi özünün "Əxlaqi-Nasir", "Abad-ül-mütəllimin" və digər əsərlərində sözün qüdrətinə, natiqlik sənətinə yüksək qiymət vermişdir. O, gözəl nitqi birinci növbədə dilin səlisliyi, ifadə imkanlarının genişliyi kimi diqqətə çatdırır. O, nitq mədəniyyətinin əsas şərtləri olan düzgünlük, ifadəlilik və dəqiqliyə xüsusi fikir vermiş, dilin qayda-qanunlarına hamının eyni dərəcədə riayət etməsini zəruri saymışdır. İnsan öz-özü ilə də, Allahı ilə də, insanla da ünsiyyətdən çox böyük fərəh duyur, çünki o bütün bunları dərk etmiş, həqiqətə yaxınlaşmış, Allaha qovuşmuş olur. Tusiyə görə, natiqlik müqəddəs sənət, söz söyləmək, danışmaq möcüzəsi qabiliyyət sayılır.

Azərbaycan ədəbiyyatı tarixində nitqin, danışığın gözəlliyinə yüksək qiymət verənlər çox olmuşdur. Fələki, Şirvani, İzzəddin Şirvani, Mücirəddin Beyləqani, Əfzələddin Xəqani. Nizami Gəncəvi, Həsənoğlu, Nəsrəddin Tusi, Əbdülrəşid Bakuvi, İmadəddin Nəsimi, Məhəmməd Füzuli,

Sahib Təbrizi, Molla Pənah Vaqif, Qətran Təbrizi, Şah İsmayıl Xətai, Marağalı Əhvədi və başqa böyük natiqlər olmuşdur. Onların yazdıqları bədii əsərlərdə natiqlik məharəti, nitq kamilliyi mədəniyyəti, nitqin təsir qüvvəsi, nitqdə forma və məzmun vəhdətinin gözlənilməsi və s. haqqında janrın verdiyi imkan ölçüsündə elmi-nəzəri fikir və mülahizələr söylənilmiş, söz sənətinə yüksək qiymət verilmişdir. Nizami Gəncəvi "Sirlər xəznəsi"ndə "Sözün qüdrəti" adlı ayrıca fəsil vermişdir:

Sözün qızıl yatağı altunla tutdu qoşa,
Dedi söz sərrafına: "De hansı gəlir xoşa?
İncə, köhnə qızılmı, təzə sözmü yaxşıdır? "
Söz sərrafı söylədi. "Söz dünyanın naxşıdır…!"
Söz qasidi bələdsiz başa vurar yolları.
Söz hünər meydanında yenər mərd oğulları…
Söz hər yerdə hakimdir. Hamıdan başda olur.
Dünyanın sərvətidir, inci qaş-daş da odur.
Nizami deyir ki,
Sözün qanadları var, quş kimi incə-incə,
Dünyada söz olmasa, nəyə gərək düşüncə.

Nizaminin "İsgəndərnamə" epopeyasında natiq surətini yaratmış, onu mütəfəkkir, dərin hikmət sahibi kimi səciyyələndirmişdir. Nəsimi "Məndə sığar iki cahan, mən bu cahana sığmaram" deyərək sözün zirvəsində dayanır. Onun söz sənəti, sözün qüdrəti ilə bağlı olduqca dəyərli fikirləri vardır.

Füzuli sözə, nitqə yüksək qiymət vermişdir

Xəlqə ağzın sirrini hər dəm qılır izhar söz,
Bu nə sirdir kim olur, hər ləhzə yoxdan var söz?
Artıran söz qədrini sidq ilə qədrin artırar,
Kim nə miqdar olsa da əhlin eylər ol miqdar söz…

Füzuliyə görə, söz müqəddəs bir ilahi varlıqdır, canlı varlıq kimi yaşayır. Söz olmadan real varlıq, cisim mövcud deyil.

*Can sözdür, əgər bilirsə insan, Sözdür ki, deyirlər, özgədir can,*
*Söz vardır kəsdirər başı, Söz vardır kəsər savaşı,*

Şah İsmayıl Xətai şəxsiyyət azadlığını dilin mövcudluğunda görürdü. O belə bir qənaətə gəlirdi ki, dil səni-sən, məni-mən, səni-biz, bizi-hamımız kimi formalaşdırmaqla millət, xalq anlayışını tamamlayır. O, elmilik, aydın diksiya və musiqiliyi nitq üçün vacib şərtlərdən sayırdı. Orta əsrlərdə yaşayıb-yaradan şairlər, söz ustaları, natiqlərin söz və onun qüdrəti, tutarlı və orijinal fikir söyləmək

bacarığı, natiqlik məharəti, nitqin kamilliyi, təsir qüvvəsi, nitqdə forma və məzmun vəhdətinin gözlənilməsi, söz ustası (suxənvər, danışığına fikir verən, danışa bilən (suxəndan) və s. barədə fikir və mülahizələr söyləmişlər.

XVII-XVIII əsirlərdə aşıq poeziyasında da sözün tələffüzünə, yatımlı deyilişinə çox fikir verilmiş, İmran dili dedikdə gözəl danışıq nəzərdə tutulmuşdur. XIX əsrdə Azərbaycanda M.Ş.Vazeh, Axundov, A.A.Bakıxanov, Q.Zakir kimi praktik natiqlər, bu sahənin nəzəriyyəçiləri yetişmişdir. M.F.Axundov özünün bütün bədii və elmi yaradıcılığında mədəni nitq, natiqlik məharəti, fəsahətli kəlam, nitqin müxtəsərliyi və aydınlığı, səhnə dili, dilimizin orfoqrafiya və orfoepiya normaları və s. haqda elmi-nəzəri fikirlər, mülahizələr söyləmişdir. Onun "Kritika və Tənqid" risaləsi adlı məqalələrində dilin təkmilləşdirilməsi məqsədilə söylədiyi fikirlər eyni söz və ifadələrin təkrarına yol verməmək, yazılı və şifahi nitqin fərqli xüsusiyyətlərini nəzərə almaq, Azərbaycan dilinin orfoqrafiya və orfoepiya qaydaları və səhnə nitqi, sair bu gün də öz əhəmiyyətini itirməmişdir. Mirzə Kazım bəy, Mirzə Şəfi Vazeh, Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir, Aleksey Çerniyayevski, Seyid Əzim Şirvani, Rəşid bəy Əfəndiyev, Soltan Məcid Qənizadə, Həbib bəy Mahmudbəyov, Nəriman Nərimanov, Ömər Faiq Nemanzadə, Mahmud bəy Mahmudbəyov, Abdulla Şaiq, Məmmədtağı Sidqi, Seyid Ünsüzadə, Firidun bəy Köçərli, Fərhad Ağazadə, Bəkir Çobanzadə, Hacı Rəhim Əfəndiyev və başqaları yazdıqları məqalələr, dərslik və dərs vəsaiti ilə məktəblərimizə, maarif və mədəniyyətimizə xeyli kömək etmişlər. Bu ziyalılar Azərbaycanda məktəb açmaq sahəsində, məktəb üçün dərslik yazmaq, əlifba, orfoqrafiya və bu kimi bir sıra məsələləri həll etmək barədə uzun illər boyu bütün təzyiq və məhdudiyyətlərə baxmayaraq yorulmadan mübarizə aparmış, dilimizin praktik məsələlərindən, lüğət tərkibi, üslubiyyətından da bəhs etmiş, məktəblilərin yüksək nitq mədəniyyətinə yiyələnməsinin vacibliyini dönə-dönə vurğulamışlar. XIX əsrin ikinci yarısında və XX əsrin əvvəllərində yaşayıb-yaratmış görkəmli alim M.M.Nəvvabın sözün qüdrəti barədə, danışıq mədəniyyəti haqda bir çox fikirləri, nəsihətləri olmuşdur. Nəsihətnaməsində 500 nəsihətin verilməsi mədəni nitqə aid parlaq nümunədir.

XX əsrdə yaşamış natiqlərdən Məmməd Əmin Rəsulzadə, Fətəli xan Xoyski, Nəriman Nərimanov, Bəkir Çobanzadə, Əli Nəzim, Həmid bəy Şaxtaxtinski, Səməd Vurğun, Mikayıl Rəfili, Cəfər Xəndan, Əli Sultanlı, Şıxəli Qurbanov, İsmayıl Şıxlı, Xəlil Rza Ulutürk kimiləri nümunə ola bilər. "Nə qədər ali, hissiyati – qabiliyyə oyandırtan bir kəlmə! Nə qədər möhtərəm, müqəddəs, nə qədər əzəmətli bir qüvvə! "Ana dili! Bir dil ki, mehriban bir vücud öz məhəbbətini sənə, bu dildə bəyan edibdir. Bir dil ki, sənə hələ beşikdə ikən bir layla şəklində öz ahəngi və lətafətini sənə eşitdirib, ruhun ən dərin guşələrində nəqş bağlayıbdır!.." Bu fikirlərin müəllifi olan Nəriman Nərimanov ana dilinə xalqın varlığını təşkil edən əsas amil kimi baxmış, ədəbi dilimizin tədrisi, xəlqiliyi, saflığı,

təmizliyi və inkişafı haqqında bu gün belə aktual olan fikirlər, mülahizələr söyləmişdir Ağamməd Abdullayev, Ş.Qurbanov natiqlik sənətinidən çoxsaylı məqalələr yazmışlar. Yusif Vəzir Çəmənzəminli “Dil məsələsi” adlı məqaləsində qeyd edir ki, – Dil çirklik sevməz, zor və güc də qəbul etməz. Dil öz kökü üstə bitər, qalxar, qol-qanad açar və bu asudəlik, təbiilik sahəsində də böylə gözəl, zərif və geniş bir halə gələr ki, hamını heyran qoyur“. “Hər bir xalqın milliyini, mənəvi dəyərlərini yaşadan, inkişaf etdirən onun ana dilidir” deyən ulu öndərimiz H.Əliyev zəmanənin görkəmli natiqlərindən olmuşdur. O, müdrik, ağıllı qərarları ilə yanaşı, danışığı, nitqi ilə də bu dilin keşiyində duran bənzərsiz bir insan, böyük mütəfəkkir bir alim idi. H.Əliyev bir natiq kimi zəngin söz ehtiyatına malik idi, o, nitqində söz və ifadələrin təkrarına mümkün qədər yol verməzdi. Onun nitqində məntiq və rabitə vardı. AMEA-nın Dilçilik İnstitutunda 1960-cı ildən nitq mədəniyyəti şöbəsi fəaliyyət göstərir. Şöbə tədqiqatlarla yanaşı mətbuatda, radio, televiziya verilişlərində, bədii və elmi əsərlərdə, dərsliklərdə, reklamlarda nəzərə çarpan dil və üslub nöqsanlarının aradan qaldırılması üçün əməli təkliflər vermişdir. “Nitq mədəniyyəti”, “Ana dilinin saflığı uğrunda”, “Dilimiz qeyrətimiz” və s. daimi rubrikalar altında yazılar dərc olunmuşdur.

## Azərbaycan dili haqqında ümumi məlumat

Azərbaycan dili Azərbaycan xalqının milli dilidir. Eyni zamanda, bu dil müstəqil Azərbaycan Respublikasının rəsmi dövlət dilidir.

Azərbaycan dilindən həm respublikamızda, həm də xarici ölkələrdə istifadə olunur. Dünyanın 87 ölkəsində yaşayan 45 milyon azərbaycanlı bu dildən doğma ana dili kimi istifadə edir. Bundan başqa, bəzi xalqlar arasında Azərbaycan dili ikinci ana dili kimi də işlənir. Hazırda Azərbaycan ərazisində yaşayan bir sıra kiçik xalqlar, o cümlədən lahıc, talış, tat, qırğız və başqaları Azərbaycan dilindən ikinci ana dili kimi istifadə edirlər.

Almaniyada yaşayan soydaşımız Əlixan İqbalın məlumatına görə ötən əsrin sonunda bütün dünyada yaşayan azərbaycanlıların sayı 48, 703.575 nəfər təşkil edir. Onun əldə etdiyi nəticələr Respublika qəzetinin 4 oktyabr 1994-cü il tarixli nömrəsində dərc edilmişdir. İndi bu rəqəm 6 milyona çatmışdır.

Azərbaycan dili öz mahiyyətinə görə dünyanın ən zəngin milli dillərindən biri sayılır. Bu dilin özünə məxsus gözəlliyi və ahəngi vardır. Azərbaycan dili hər şeydən əvvəl, xoş avaz yaradan səslər sisteminə, zəngin və rəngarəng söz ehtiyatına, tam sabitləşmiş qrammatik quruluşa malikdir.

Azərbaycan dilində ən dərin duyguları, ən incə mənaları istədiyin şəkildə çox müxtəlif bədii boyarlarla ifadə etmək olur. Bu dil elmi, siyasi, fəlsəfi fikirləri çox aydın ifadə etməyə qadir olduğu kimi, bədii təfəkkürün gözəl nümunələrini yaratmaq üçün çox yararlıdır. Eyni zamanda dünya mədəniyyəti xəzinəsinə qiymətli hədiyyə kimi daxil olan və onu zənginləşdirən M.Füzulinin məşhur “Leyli və Məcnun” poeması, M.F.Axundovun komediyaları və bir çox sənət əsərləri həmin dildə-Azərbaycan dilində yaranmışdır.

Azərbaycan dilinin gözəlliyi, onun zənginliyi və digər xüsusiyyətləri tarixən bir sıra görkəmli şəxsiyyətlərin nəzər-diqqətini özünə cəlb etmişdir. Böyük rus şairi M.Y.Lermontov Azərbaycan dili

haqqında demişdir: "...mən bir çox dağlar aşdım, Şuşa, Quba və Şamaxı şəhərlərində oldum... azərbaycanca öyrənməyə başladım; həmin dil burada və ümumiyyətlə Asiyada fransız dilinin Avropada olduğu qədər zəruri bir dildir."

Məşhur şəxsiyyətlərdən Bestujev-Marlinski, L.Bualo və başqaları da Azərbaycan dilinin əhəmiyyətindən bəhs etmişlər. Görkəmli ictimai xadim olan Sultan Məcid Qənizadə Azərbaycan dili haqqında yazmışdır: "Həqiqətən bu dil (Azərbaycan dili – Y.S.) öz təbiətinə görə çox elastikdir və asanlıqla zərif üslubi formalara düşmə bacarığına malik olmaqla öz xüsusiyyətləri ilə fəxr edə bilər. Bu xüsusiyyətlər öz mahiyyətinə görə çox maraqlıdır... buradakı xüsusiyyətlərə bənzər hadisələrə hər hansı bir başqa dildə az təsadüf etmək olar.

## Azərbaycan dilinin türk dilləri ailəsində yeri

Azərbaycan dili iltisaqi (aqlütinativ) dillərdəndir. Bu dil geneoloji bölgüyə əsasən türk dilləri ailəsinə mənsubdur.

Türk dilləri ailəsi genetik əlamətlər əsasında təsnif edilən ən böyük dil ailələrindən biridir. Başqa dil ailələrində olduğu kimi, bu ailəyə daxil edilən dillər də bir-birinə leksik, morfoloji və sintaktik cəhətdən çox yaxındır.Nümunə üçün bir neçə sözün müxtəlif türk dillərində necə işlədildiyini nəzərdən keçirək:

Azərbaycan dili türk dilləri ailəsində oğuz dilləri qrupunun oğuz-səlcuq yarımqrupuna daxildir. Bu dil həmin qrup daxilində xüsusi mövqeyə malikdir.Azərbaycan dili türk dilləri ailəsindəki müasir dillərdən daha çox türk (osmanlı), türkmən və qaqauz dilinə daha yaxındır.

## Azərbaycan dilinin tarixinə dair

Hər bir dilin tarixi həmin dildə danışan xalqın tarixi ilə bağlı olur.Azərbaycan dilinin tarixi xalqımızın tarixi ilə əlaqədar olaraq onun kimi çox qədimdir.

Azərbycan dili hazırkı inkişaf səviyyəsinə birdən-birə çatmamışdır. Bu bir sıra əsrlərin məhsuludur. İlk dövrlərdə, başqa dillər kimi, Azərbaycan dilinin də lüğət tərkibi kasıb, qrammatik quruluşu isə bəsit olmuşdur. Lakin xalqımız tarixən inkişaf etdikcə dilimizin səs sistemi tədricən səlisləşmiş, lüğət tərkibi zənginləşmiş və qrammatik quruluşu təkmilləşmişdir.

Tarixdə humanist, sülhsevər, mehriban və xeyirxah xalq kimi məşhur olan, uzun əsrlər boyu həm onu əhatə edən qonşularla, həm də bütün digər xalqlarla dostluq, qardaşlıq münasibətində yaşayan Azərbaycan xalqı tarixin müxtəlif dövrlərində bir sıra işğallarla üz-üzə gəlmişdir. VII əsrdən başlayaraq Azərbaycana ərəb işğalçıları, sonralar isə fars, monqol, türk qəsbkarları basqın etmişlər. Bu yadellilərin məqsədi xalqımızı və eləcə də onun dilini tarix meydanından çıxarmaq idi.

Lakin Azərbaycan xalqı tarix boyu bu mənfur işğalçılarla amansız mübarizə apararaq öz varlığını qoruduğu kimi, öz dilini də mühafizə edib saxlamışdır.

İşğalçıların arzu və əməllərinin əksinə olaraq, Azərbaycan dilində sənət əsərləri yaradılır və dilimiz yavaş-yavaş ədəbi zəmin əsasında formalaşıb inkişaf edirdi. Yadellilərin təqibinə baxmayaraq, XIII əsrdə Həsənoğlu, XIV əsrdə Nəsimi və başqa sənətkarlarımız Azərbaycan dilində gözəl əsərlər yazıb yaratmışlar.

Həmin dövrlərdə (assimilyasiya dövründə) Azərbaycan dili nəinki öz müstəqilliyini qoruyub saxlamış, eyni zamanda "...öz həyatilik və sabitliyini sübut etmiş, hətta öz növbəsində ərəb və xüsusilə də fars dilinə də təsir göstərmişdir". Bu təsir sonralar təkcə həmin dillərə deyil, başqa bir sıra dillərə də olmuşdur.

Bütün tarix boyu öz orijinallığını mühafizə edib saxlayan Azərbaycan dili get-gedə inkişaf edərək XIX əsrdə milli dilə çevrilmişdir. Bu dövrdə Azərbaycan dilinin müstəqilliyinə qarşı olan mübarizə daha da kəskinləşmişdir. Lakin dövrün qabaqcıl adamları və bütün xalq dilin milli varlığını qorumağa başlamışlar. Həmin dövrdə böyük mütəfəkkir M.F.Axundov dilimizin çox nadir və poetik vüsətə malik bir dil olduğunu həm nəzəri, həm də əməli olaraq sübut etməyə çalışmışdır.

XIX əsrin sonu XX əsrin əvvələrində Azərbaycanın görkəmli maarifpərvərləri M.Ə.Sabir, C.Məmmədquluzadə, Ə.Haqverdiyev və başqaları dilimizin milli orijinallığı uğrunda ciddi mübarizə aparmış və bu məsələdə xalqa düzgün istiqamət vermişlər.

Bütün sahələrdə olduğu kimi dil sahəsində də inkişaf üçün geniş imkanlar yarandı. Sovet dövründə Azərbaycan dilinin lüğət tərkibi, qrammatik quruluşu, üslubları bəlkə də min ilə bərabər bir inkişaf yolu keçdi. Hazırda dilimiz öz inkişafını davam etdirir.

**Azərbaycan dilinin başqa dillərə təsiri**

Azərbaycan dili qədim dövrlərdən başlayaraq bir sıra dillərlə qarşılıqlı əlaqədə olmuş, başqa dillərdən söz almış və bəzi dillərə söz vermişdir. Bunun da nəticəsində həm özü zənginləşmiş, həm də başqa dillərin inkişaf etməsində müəyyən rol oynamışdır. Ayrı-ayrı dövrlərdə Azərbaycan dilindən fars, aqul, ləzgi, tabasaran, erməni, rus, gürcü və başqa dillərə çoxlu söz və ifadə keçmişdir. Məsələn:

1. Fars dilinə keçən sözlər: alov, araba, bəzək, bağça, qovurma, qundaq, quş, dəyənək, döşək, otaq, ordu, ocaq, ilxı, sancaq, tənə, ton, çaxmaq, çəkmə, çolaq, çubuq, elçi, yaylaq, şiş və s.

Fars dilinə keçən Azərbaycan sözlərinin tarixi çox qədimdir. Belə ki, hələ XII–XIII əsrlərdə yazıb-yaradan fars yazıçıları öz əsərlərində Azərbaycan sözləri işlətmişlər. Səfəvilər dövründə isə, yəni XV əsrin sonundan başlayaraq XVIII əsrin birinci yarısına qədər (1499–1736) azərbaycanlıların hakimiyyət başında olduqları zaman Azərbaycan dilindən fars dilinə keçən sözlərin sayı daha da çoxalmışdır.

2. Aqul dilinə keçən sözlər: çöl, qum, dustaq, balıq, bulaq, yaylıq, yağ, köhnə, boran, dərin, yorğan, boşqab, biçinçi, qarğa, duz, qalın, doğru və s.

3. Ləzgi dilinə keçən sözlər: ad, bağça, gözəl, güzgü, dərin, düşmən, köhnə, qarpız, qızıl, quş, sərin, çəltik, şirin, yaylaq, turp, paltar, saçaq və s.

4. Rus dilinə keçən sözlər: arbuz (qarpız), anbar, başlıq, sarafan, kalpak, saray, utyuq (ütü), kazak, sazan, almaz, kamış (qəmiş), qaraul (qarovul), barsuk (porsuq), tuman, karandaş, aşuq (aşıq), çerdak, sunbuk (sandıq), izyum(üzüm) və s.

5. Gürcü dilinə keçən sözlər: qonaq, qoçaq, tutsaq, körpə, keçəl, ocaq, otaq, pul, manat, papaq, polad, toxa, çəkmə, çomaq, çolaq, ciyər, çəkic, şüşə, şəkər, yaraq, dolma, çığırtma və s.

Azərbaycan dilindən gürcü dilinə keçmiş sözlər müxtəlif sahələrə aid olaraq həm ədəbi, həm də danışıq dilində işlədilir.

Azərbaycan dili yuxarıda qeyd olunan dillərin əksəriyyətinin lüğət tərkibinin inkişafında həm mənbə, həm də vasitəçi dil olmuşdur. Bunu başqa şəkildə desək, Azərbaycan dili həm öz sözlərini vermiş, həm də başqa dillərdən söz almaqda həmin dillər üçün vasitəçilik etmişdir. Bu dilin vasitəsi ilə gürcü dilinə yüzlərlə ərəb və fars mənşəli sözlər daxil olmuşdur. Məsələn: adəm, adam, bina, qələm, dəzgah, əlbəttə, əfsus, zər, kef, mürəbbə, mütəkkə, mismar, məsləhət, pəncərə, pərvanə, reyhan, saat,

surət, ustad, ümid, fikir, xatir, həkim, cəllad və.s keçmişdir. Belə bir vəziyyət Azərbaycan dilinin geniş təsir dairəsinə malik olduğunu göstərir.

Azərbaycan dilinin başqa dillərə müsbət təsiri hal-hazırda da davam edir. Bunu təkcə Dağıstan dillərində yox, qonşuluqda olan başqa dillərdə də görmək olur. Ümumiyyətlə, başqa dillərə keçmiş Azərbaycan sözləri həmin dillərin lüğət tərkibinin ayrılmaz ünsürünə çevrilmişdir.

## Müasir Azərbaycan ədəbi dilinin üslubları

Ədəbi dilin xarakterik cəhətlərindən biri də onun müxtəlif üslublara malik olmasıdir.

Üslub nədir? Üslub sözü bir çox mənalarda işlənir. Məsələn: dilin üslubu, yazıcının üslubu və s. Dilin üslubu ilə yazıçının üslubu eyni anlayış deyildir. Ona görə bu anlayışlari bir-biri ilə qarışdırmaq olmaz.

Dilin üslubu dedikdə ümumi üslublar nəzərdə tutulur. Lakin yazıçının üslubu onun ümumxalq dilindən, dil vasitələrindən öz arzu və zövqünə, mövzu və məqsədinə görə necə seçib işlətməsi üsulları ilə bağlıdır. Hər bir yazıçının üslubu onun həyata münasibəti, elmi və siyasi biliyi, mədəniyyəti və bacarığı əsasında yaranır. Buna görə də yazıçının dünyagörüşü ilə ifadə tərzinin vəhdəti onun üslubudur. Lakin yazıçının üslubu ümumdil xaricində mövcud deyildir. Bu ümumidən asılı olaraq onun bir hissəsidir. Bədii yaradıcılıqda hər bir sənətkarın öz üslubunun olması əsas şərtlərdəndir. Çünki fərdi üslub sənətkarın yaradıcılıq orijinallığını müəyyən edir və onu başqalarından fərqli bir sənətkar kimi tanıdır. Elə buna görədir ki, Səməd Vurğun demişdir: “öz uslubunu təyin etmək və ona daima sadiq yaşayıb yaratmaq şair üçün səadətdir! Başqalarından söz, düşüncə və duyğu pərdələri altında gizlənib qalmaq isə şair üçün fəlakətdir.”

Dilin üslubları müxtəlif səbəblər nəticəsində əmələ gəlir. Bu hər şeydən əvvəl, insan fəaliyyətinin müxtəlif sahələri ilə əlaqədar olaraq bu və ya başqa şəraitdə fikrin ifadə olunması üçün dil vasitələrindən istifadə edilərkən yaranır. Hər bir üslub dilin milli xüsusiyyətləri əsasında qurulur. Bunların yaranmasında həm yazıçıların, həm də alim-müəllim və digər qrup ziyalıların böyük xidməti olur.

Dildəki üslubların əmələ gəlməsi və digər cəhətlərindən bəhs edən xüsusi elm sahəsi vardır. Buna dilçilikdə üslubiyyat deyilir. Üslubiyyatda dilin ifadə vasitələrinin müxtəlif üslublarda işlənilmə üsulları geniş şəkildə öyrənilir.

Azərbaycan ədəbi dilində, qədim dövrlərdən başlayaraq, zəngin üslubi sistem yaranmışdir. Ədəbi dilimizin ayri-ayri inkisaf mərhələlərində müxtəlif üslublar olmuşdur. Zaman keçdikcə bu üslublar daha da artmış, zənginləşmiş və təkmilləşmişdir. Hazırda Azərbaycan ədəbi dilinin aşağıdakı üslubları vardır. *Bədii* üslub, *elmi* üslub, *ictimai-publisistik* üslub, *rəsmi* üslub. Bu üslubların həm ümumi, həm də hər birinin özünəməxsus fərqli xarakterik cəhətləri vardır.

1.*Ədəbi dilin bədii üslubu.*Fikrin bədii ifadə və təsvir vasitələri ilə ifadə olunmasına bədii üslub deyilir. Bədii üslub eyni zamanda bədii dil də adlanır.

Azərbaycan ədəbi dilində bədii üslub xüsusi yer tutur. Bu üslub tarixən qədim, mahiyyətinə görə isə çox kütləvidir. Bədii üslub ədəbi dilimizin ilk formalaşdığı dövrdən onun əsasını təşkil etmişdir.

Bədii üslubun iki forması vardır: nəzm üslubu və nəsr üslubu.

Bədii üslubun bu formaları bir sıra cəhətlərinə və əlamətlərinə görə bir-birindən fərqlənir.Məsələn, şeirlə yazılan əsərlərdə müəyyən ölcü olur;belə ki, şeirdə hecalara fikir verilir, qafiyə nəzərə alınır və s.

Lakin nəsr əsərlərində isə bu ölçülər hazırkı dövrdə nəzərə alınmır (ədəbiyyatımızda qafiyəli nəsr də olmuşdur).

Bədii üslubun hər iki formasında janrlarla əlaqədar bir sıra üslublar da olur; məsələn, qəzəl üslubu.; qoşma üslubu; hekayə üslubu; dram üslubu; satira üslubu və s.

Ədəbi dilin bədii üslubunun özünəməxsus bir sıra xüsusiyyətləri vardır ki, bunlar onu başqalarından fərqləndirir. Həmin fərqlər, əsasən, aşağıdakı sahələrdə özünü göstərir.

*Söz seçməkdə.* Bədii üslubda yazılan əsərlərdə müxtəlif söz qruplarına müraciət olunur və oradan rəngarəng sözlər seçilib işlədilir. Dildə elə bir söz qrupu ola bilməz ki, bədii üslub oradan istifadə etməsin. Dildə hər nə varsa bədii üslubun ixtiyarındadır. Bədii üslubda bu və ya başqa üslubi məqam, yaxud surətin nitqini fərdiləşdirmək üçün sənət, peşə ilə əlaqədar və ya dialekt sözlərindən istifadə edilir. Bununla bərabər həmin üslubda sözlərin məna qruplarından – eyni səslənməyə malik müxtəlif sözlərdən (omonim); müxtəlif formalı, lakin yaxın məna ifadə edən sözlərdən (antonom) bədii ifadə vasitəsi kimi çox geniş istifadə olunur.Bütün bunlar isə oxucu və ya dinləyicinin bədii zövqünü oxşamağa qüvvətli təsir göstərir.

*Sözlərin işlədilməsində.* Bədii ədəbiyyat dil sahəsində geniş novatorluq meydanıdır. Burada mövcud sözlərə yeni məna vermək, sözə emosional çalarlıq gətirmək və bunları çox müxtəlif formalarda və müxtəlif məqam və vəziyyətdə işlətmək olur.

Bədii ədəbiyyatda ayrı-ayrı sözlərdən yeni mənalarda istifadə olunması. Onların məcazi məna kəsb etməsi imkanları ilə bağlıdır. Hər bir sözün məcazi mənası dildə müəyyən obrazlılıq əmələ gətirir. Bədii ədəbiyyatda məcazların müxtəlif formalarından olduqca geniş şəkildə istifadə edilir. Buna görə də bədii üslub obrazlı olur və bu cəhətinə əsasən digər üslublardan fərqlənir.

*Qrammatik vasitələrin istifadəsində.* Bədii üslubda bəzi dil vasitələrinə bədii meyarla yanaşılır. Bu və ya başqa bir vasitə bədii qanunlara müvafiq olaraq bədii zərurət əsasında işlənilir. Bədii üslubda sintaktik fiqurlar – ritorik suallar, bədii nidalar və xitablar çox işlənir. Bu da öz növbəsində onu başqa üslublardan fərqləndirir.

*Fonetik materialın istifadəsində.* Bədii üslubda dilin səs sistemi bir növ estetik təsir vasitəsinə çevrilir. Xüsusən poeziyada gözəl ahəng, musiqilik səslərlə yaradılır. Eyni zamanda, səslərin fonetik sıralanması vasitəsi ilə bəzən ifadənin təsiri də qüvvətləndirilir. Belə bir vəziyyət, əsasən, bədii üslub üçün xarakterikdir.

*Sitatlardan istifadə.* Bədii üslubda sitatlardan geniş istifadə olunur. Burada işlənilən hər bir poetik sitat öz vəzifəsinə görə elmi sitatdan fərqlənir. Poetik sitatlar bədii surətlərin nitqini fərdiləşdirmək və sair kimi üslubi cəhətlər üçün işlənilir.

*Epiqrafların verilməsində.* Bədii üslubda epiqraflara tez-tez müraciət olunur. Hər bir epiqraf mətnin əvvəlində verilərək həmin mətnin məzmunu ilə uyğun gəlir. Bunların vasitəsilə müəllif ifadə olunan fikrin təsirini daha da artırır.

*Bədii üslub* bütün öz xüsusiyyətləri ilə olduqca obrazlı, emosional və ekspressivdir. Bu üslub başqa üslublara nisbətən xalq danışıq dilinə daha yaxındır. Hazırda Azərbaycan ədəbi dilinin bədii üslubu çox inkişaf etmişdir. Bu üslub ədəbi dilin və xalq danışıq dilinin xüsusiyyətləri əsasında getgedə daha da təkmilləşir.

2.*Ədəbi dilin elmi üslubu*. Fikrin elmi şəkildə ifadə olunması elmi üslub adlanır. Elmi üsluba eyni zamanda elmi dil də deyilir. Elmi üslubda obrazlılıq, emosionallıq olmur. Buraya bütün elmi və metodik əsərlərin dili daxildir.

Azərbaycan ədəbi dilində elmi üslub bədii üslubdan sonra formalaşmağa başlamışdır. Bu üslub tarix boyu geniş təkmilləşmə və inkişaf yolu keçirmişdir. Hazırda elmin bütün sahələrinə dair bu üslubda mükəmməl elmi əsərlər yaradılır. Elmi üslubu digər üslublardan fərqləndirən bir sıra xüsusiyyətlər vardır. Həmin xüsusiyyətlər əsasən aşağıdakılarla müəyyənləşir.

*Fikrin elmi izahı.* Elm – təbiət və cəmiyyət qanunlarını aydınlaşdırır. Buna görə də elm mövcud anlayışlara dair dəqiq izahat tələb edir; müəyyən məsələ şərh olunarkən elmi təfəkkür əsas götürülür. Bu xüsusiyyət elmi üslubu digər üslublardan fərqləndirir.

*Terminlərin çox işlənməsi.* Məlum olduğu üzrə, termin elmin əlifbasıdır. Elə buna görə də elmi üslubda elmin müxtəlif sahələrinə dair aparılan tədqiqatla əlaqədar terminlərdən geniş istifadə olunur.

*Sözün həqiqi mənada işlənməsi.* Elmi üslub üçün əsas əlamətlərdən biri sözü ilk mənasında işlətməkdir. Bu üslubda sözlərin məcazi yaxud bir neçə mənada işlədilməsinə əsasən yol verilmir. Çünki elmi üslubda sözlərin çoxmənalılığı bəzən dolaşıqlığa anlaşılmazlığa səbəb ola bilir.

*Xüsusi ifadələrin işlənilməsi.* Elmi üslubda bu və ya digər məsələ şərh olunarkən "tədqiqat göstərir ki, " "belə nəticəyə gəlmək olur ki, "bu nöqteyi – nəzərdən" və s. kimi xüsusi ifadələrdən tez-tez istifadə olunur. Bunlar elmi üslubun xüsusiyyətləri ilə bağlı ifadələrdir.

*Mürəkkəb sintaktik konstruksiyaların tələb olunması.*Elmi üslubda bu və ya digər anlayışı dəqiq və düzgün ifadə etmək üçün dilin bütün qrammatik vasitələrindən, o cümlədən mürəkkəb sintaktik quruluşlu cümlələrdən istifadə edilir.

*Müxtəlif işarələrin işlədilməsi.* Ayrı-ayrı elm sahələri ilə əlaqədar olaraq elmi üslubda yazılan əsərlərdə müxtəlif işarələr sistemindən istifadə edilir. Dialektlərə aid yazılmış əsərlərdə transkripsiya ilə əlaqədar işarələr buna misal ola bilər.

*Qədim yunan və latın əlifbalarından istifadə olunması.* Bəzi elm sahələrində yunan və latın hərflərinə müraciət olunur. Məsələn, iks (x), iqrik (y) və s.

Bu və ya digər tədqiqat işi elmi üslubda şərh olunarkən hər bir müəllifin fərdi üslubu yaranır. Lakin bu fərdi üslub bədii üslubda yaranan fərdi üslub kimi xüsusi mahiyyətə malik olmur.

Elmi üslub bədii üslub qədər kütləvi xarakter daşımır. Belə ki, bədii üslubda yazılan hər bir parçanı hamı oxuyanda və ya eşidəndə başa düşür, lakin elmi üslubda müxtəlif sahələrə aid yazılan əsərləri hamı dərk edə bilmir.

Qeyd etmək lazımdır ki, ədəbi-tənqidi əsərlər də eyni üslubda yazılır. Bu növ əsərlər elmi üslubu ictimai-publisistik üsluba yaxınlaşdırır.

*3.Ədəbi dilin ictimai-publisistik üslubu.* İctimai və siyasi məsələlərin geniş xalq kütləsinin anlayacağı şəkildə izah edilməsi ictimai-publisistik üslub adlanır. Bu üsluba eyni zamanda kütləvi üslub, kütləvi dil də deyilir. Buraya təbliğat, təşviqat məzmunlu, adi məlumat xarakterli və tənqidi məqalələrin, yazılı məruzələrin, qəzet xülasələrinin və s.dili daxildir.

İctimai-publisistik üslubun əmələ gəlməsində mətbuatın xüsusi rolu vardır. Buna görə də bu üslubu çox zaman mətbuat üslubu da adlandırırlar. Lakin qeyd etməliyik ki, qəzet və jurnallardakı məqalələrin hamısı publisistik üslubda yazılmır; orada müxtəlif üslubda yazılan materiallar olur. Elə buna görə də bütün məqalələri mətbuat üslubu adı altında başa düşmək düzgün deyildir: mətbuat üslubu başqa anlayışdır. Bunun özü iki yerə bölünür: a) qəzet üslubu b)jurnal üslubu. Bunların isə fərqli cəhətləri vardır. Bu fərqlər hər şeydən əvvəl ondadır ki, qəzetdə mənası gec başa düşülən sözlərə, tərkiblərə yer verilmir. Ancaq jurnalda yeni terminlər, tərkiblər, qısaltmalar və sairə çox işlədilir.

Azərbaycan ədəbi dilinin ictimai-publisistik üslubu əsasən XIX əsrdə milli mətbuatın meydana çıxdığı dövrdən formalaşmağa başlamışdır.

*İctimai-publisistik üslubun* janrlara görə müxtəlif qolları olmasına baxmayaraq, bunların hamısının ümumi və digər üslublardan fərqli xüsusiyyətləri vardır. İctimai publisistik üslubun səciyyəvi cəhətləri aşağıdakılardan ibarətdir:

1)Sözün istehza ilə işlədilməsi;

2)Sarkazmlar yaradılması;

3)Frazeoloji vahidlərdən geniş istifadə olunması;

4)Bədii ədəbiyyatdan sitatlar verilməsi;

5)İfşa və tənqid üçün ən kəskin sözlər işlədilməsi.

*İctimai-publisistik üslub,* ümumiyyətlə, aydın üslubdur. Burada xalq danışıq ünsürləri yox olur. Məsələn, "Kirpi'' jurnalındakı məqalələrin əksəriyyətində istənilən qədər xalq ifadə və tərkibləri, adi danışıq dilinə məxsus cümlələr və s. vardır.

İctimai-publisistik üslubda yazılan oçerklər bunu bədii üsluba, xülasə və tənqidi məqalələr elmi üsluba, bəzi materiallar isə rəsmi üsluba yaxınlaşdırılır.

4.*Ədəbi dilin rəsmi üslubu.* Cəmiyyətdə rəsmi münasibətləri bildirmək üçün yazılan dövlət sənədlərinin üslubu rəsmi üslub adlanır. Buraya bütün dövlət sənədlərinin – protokol, akt, nota, əmr, qərar, bəyanat, qətnamə və s. sənədlərin dili daxildir.

Azərbaycan ədəbi dilinin rəsmi üslubu əsasən XIX əsrdə, yəni milli ədəbi dilin sabitləşməsi dövründə formalaşmağa başlamışdır.

Rəsmi üslubda yazılan sənədlərdə fikrin konkret şəkildə izahı tələb olunur. Buna görə həmin üslub üçün aşağıdakı cəhətlər xarakterikdir:

a)hər bir məsələ aydın və olduqca qısa izah edilir;

b)artıq və lüzumsuz sözlərə, təkrarlara, bədii vasitələrə yer verilmir;

c)ikimənalılığa, dolaşıqlığa yol verməmək üçün hər bir anlayışa dair dəqiq terminlər seçilir.

d)hər hansı bir məfhumun izahı üçün ədəbi dilin qrammatik normalarına düzgün riayət olunur;

f)ştamp xarakterli xüsusi tərkiblərdən, ifadələrdən geniş istifadə olunur.

Ədəbi dilin üslubları cəmiyyətin inkişafı ilə əlaqədar olaraq dəyişir və inkişaf edir. Sovet dövründə Azərbaycan ədəbi dilinin üslubları hər cəhətdən geniş inkişaf etmişdir və indi də bu iş davam edir.

Bütün bunlardan başqa müasir Azərbaycan dilçiliyində ədəbi dilin danışıq-məişət,epistolyar,xatirə-memuar, reklam üslubları haqqında da bəhs edilir.

## Azərbaycan ədəbi dilinin inkişafında klassik yazıçıların və mətbuatın rolu

Müasir Azərbaycan ədəbi dilinin hazırkı yüksək inkişaf səviyyəsi uzun əsrlərin məhsuludur. Ədəbi dilimiz tarix boyu mürəkkəb inkişaf prosesi keçirmişdir.

Azərbaycan ədəbi dilinin inkişafı aşağıdakı dövrlərə bölünür:

1)ədəbi dilin formalaşması və tədrici inkişaf dövrü (XIX əsrə kimi);

2)ədəbi dilin sabitləşməsi dövrü (XIX əsrdən 1920-ci ilə qədər);

3)ədəbi dilin geniş inkişaf yolu keçməsi dövrü (sovet dövrü).

Ədəbi dilimizin bu inkişaf mərhələlərində yazıçıların, alimlərin, ictimai xadimlərin, müəllimlərin, milli mətbuatın və mətbuat işçilərinin xüsusi rolu olmuşdur. Bunlardan, xüsusən yazıçılar ədəbi dilimizin formalaşmasında, onun sonrakı dövrlərdəki inkişafı üçün ümumxalq dilindən söz və formalar, yaxud yeni söz və ifadələr yaratmaqda daha böyük rol oynamışlar.

XIII əsrdə Azərbaycan ədəbi dilinin formalaşmasında şair Həsənoğlunun xüsusi rolu olmuşdur. Həmin dövrdə işğalçıların və din xadimlərinin apardıqları siyasətlə bağlı olaraq Azərbaycan dilində yazıb-yaratmağa imkan verilmişdi; bu dildə yazılan əsərlər saray nümayəndələri tərəfindən pis qarşılanırdı. Şairin ancaq aşağıdakı qəzəli bizə gəlib çatmışdır.

*Apardı könlümü bir xoş qəmər yüz, canfəza dilbər,*
*Nə dilbər, dilbəri –şahid, nə şahid şahidi – sərvər.*
*Mən ölsəm sən bütü-şəngül, sürahi söyləmə qül –qül,*
*Nə qül –qül, qül-qüli –badə;nə badə, badeyi -əhmər.*

*Başımdan getmədi hər giz səninlə içdiyim badə,*
*Nə badə, badeyi –məsti, nə məsti, məsteyi-sağər.*

*Şahə, şirin sözün qılur Misirdə bir zaman kasid,*
*Nə kasid, kasidi –qiymət; nə qiymət, qiyməti –şəkkər.*

*Tutuşmayınca dəraməş bəlürməz –xisləti -ənbər,*
*Nə ənbər, ənbəri suziş; nə suziş, suzişi məcmər.*

*Əzəldə canım içində yazıldı surəti –məni,*
*Nə məni, məniyi surət: nə surət, surəti dəfmər.*

*Həsənoğlu sana gərçi duaçıdır, vəli, sadiq,*

*Nə sadiq, sadiqi bəndə*; *nə bəndə, bəndeyi çakər.*

XIV əsrdə şair İmadəddin Nəsimi ədəbi dilin formalaşmasında xüsusi rol oynamışdır. Nəsimi öz əsərlərində Həsənoğluya nisbətən ərəb və fars sözləri əvəzinə Azərbaycan söz və ifadələrinə daha çox yer vermişdir. Beləliklə, o, ədəbi dilə xalis Azərbaycan sözlərinin daxil olmasına xüsusi səy göstərmişdir.

XV əsrdə Azərbaycan dili sarayda işlənmiş və onun təsir dairəsi tədricən genişlənmişdir. Bu əsrdə ədəbi dilimizin formalaşması və inkişafında Şah İsmayıl Xətayinin böyük xidməti olmuşdur. O, Azərbaycan dilini hətta dövlət dili səviyyəsinə qədər yüksəltməyə xüsusi səy göstərmişdir.

XVI əsrdə Azərbaycan ədəbi dilinin inkişafında böyük şair Məhəmməd Füzulinin xüsusi rolu olmuşdur. Məlum olduğu üzrə XVI əsrdə də Azərbaycan dilində əsər yazmaq dəb deyildi (bu dövrdə ərəb və fars dillərində yazmağa böyük əhəmiyyət verilirdi) Füzulinin ədəbi dilimizin inkişafındakı rolu bir neçə cəhətdən xarakterizə olunur, belə ki, o, ilk dəfə olaraq: a)Azərbaycan dilində boyük həcmli əsərlər yazmışdır. b)müxtəlif janrlarda əsərlər yaratmışdır; c)qəzəl janrını ən yüksək zirvəyə ucaltmışdır.

Böyük şair Füzuli öz əsərlərində ümumxalq dilinin incəliklərindən məharətlə istifadə etmiş, beləliklə, yazılı ədəbi dilin şifahi ədəbi dilə yaxınlaşmasında onun xüsusi xidməti olmuşdur. Ədəbi dilin yazılı və şifahi formaları arasındakı fərq XVI-XVII əsrlərdə nisbətən XVIII əsrdə daha çox azalmışdı.

XVIII əsrdə Azərbaycan ədəbi dilinin inkişafında Molla Pənah Vaqif yeni bir dövr açmışdır. Vaqifin bu sahədəki fəaliyyəti aşağıdakı cəhətdən özünü göstərir:

1.M.P.Vaqif özündən əvvəlki dil ənənələrini, xüsusən Füzuli irsini davam etdirmişdir.

2.Dilin xəlqiliyini əsas tutaraq dilimizdəki ərəb və fars sözlərinə qarşı mübarizə aparmış, öz əsərlərində xalis Azərbaycan sözlərinə daha çox yer vermiş və yazılı ədəbi dilimizin şifahi dilə daha da yaxınlaşmasına nail olmuşdur. Elə buna görədir ki, şairin yazdığı şeirlərdən əksəriyyətinin dili tamamilə aydın və sadədir. Bunları oxuduqda canlı Azərbaycan dilinin ruhu, ahəngi və gözəlliyi çox aydın şəkildə hiss olunur.

3.Vaqif qoşma üslubunun formalaşmasında və inkişafında xüsusi rol oynamışdır. Onun qələminin qüdrəti sayəsində XVIII əsrdə qoşma üslubu bədii üslublar sisteminin zirvəsinə ucalmışdır.

Bu dövrdə Vaqiflə bərabər *Molla Vəli Vidadinin* də ədəbi dilimizin inkişafında rolu az olmamışdır.

XIX əsr Azərbaycan ədəbi dilinin sabitləşməsi dövrüdür. Bu dövr öz xüsusiyyətləri ilə digər əsrlərdən əsaslı surətdə fərqlənir. Belə ki, həmin dövrdə kapitalizmin inkişafı, Azərbaycanın digər ölkə və xalqlarla mədəni əlaqələrinin yaranması və s. dilimizin inkişafına da müsbət təsir göstərmiş, Azərbaycan ümumxalq dili inkişaf edərək milli ədəbi dilə çevrilmişdir.

XIX əsrdə Azərbaycan ədəbi dilinin sabitləşməsi və inkişaf etməsində M.F.Axundovu xüsusi olaraq qeyd etmək lazımdır. M.F.Axundov bütün fəaliyyəti boyu Azərbaycan dilinin milli müstəqilliyini qorumuş və onun inkişafı uğrunda ciddi mübarizə aparmışdır. Dil sahəsində M.F.Axundovun fəaliyyəti çoxcəhətlidir. O, dilin elə bir sahəsi, elə bir mühüm məsələsi yoxdur ki, ondan bəhs etməmiş olsun; belə ki ərəb əlifbasının dəyişdirilməsi sahəsində, orfoqrafiya məsələlərinin qaydaya salınmasında, ədəbi dilin terminlərlə zənginləşməsində M.F.Axundovun çox böyük və xüsusi xidmətləri olmuşdur; o ilk dəfə olaraq dildə dram üslubunun əsasını qoymuşdur.

M.F.Axundov, hər şeydən əvvəl, ədəbi dilin xalqa daha yaxın olmasına, ondan hamının asanlıqla istifadə edə bilməsinə xüsusi fikir verirdi. O, dili həqiqi mənada xəlqiləşdirməyə çalışırdı. Bu məqsədlə o, ədəbi dil haqqında bir sıra nəzəri fikirlər irəli sürmüş və həmin fikirlərini öz yaradıcılıq fəaliyyətində əməli surətdə həyata keçirməyə nail olmuşdur. Onun komediyalarının dili bunu aydın surətdə sübut edir.

Ədəbi dilimizin xəlqiliyi, sadəliyi, saflığı uğrunda M.F.Axundovun apardığı mübarizəni onun xələfləri olan N.B.Vəzirov, H.B.Zərdabi kimi maarifçilər davam etdirmişlər.

Məlumdur ki, ədəbi dilin lüğət tərkibinin, üslublarının inkişafında orfoqrafik və digər ədəbi normalarının səlisləşməsində, sabitləşməsində mətbuat xüsusi rol oynayır. Bu cəhətdən ədəbi dilimizin inkişafında 1875-ci ildə nəşrə başlayan "Əkinçi" qəzetinin böyük rolu olmuşdur. Həmin qəzetin vasitəsilə müxtəlif sahələrə dair bir sıra yeni-yeni terminlər ədəbi dilimizə daxil olmuş və onun lüğət tərkibini daha da zənginləşdirmişdir. "Əkinçi" qəzetində müxtəlif üslublarda dərc edilən məqalələr ədəbi dilimizin, eyni zamanda, üslublarının inkişafına da təsir göstərmişdir. Bütün bu məsələlərdə qəzetin redaktoru H.B.Zərdabinin böyük xidməti olmuşdur. O, dil məsələsini də qəzetinin ümumi məqsədindən kənarda qoymamışdır.

XX əsrdə Azərbaycan ədəbi dili öz inkişafının çox mürəkkəb bir dövrünə qədəm qoyur. Bu dövrdə dilimizə qarşı hücumlar daha da qüvvətlənmişdi. Burjua millətçiləri, pantürkistlər Azərbaycan dilinə qarşı həyasızcasına hücum çəkir, bu dili hər vasitə ilə pisləməyə, onu sıradan çıxarmağa çalışırdılar. Dövrün qabaqcıl adamları doğma dilimizi hər addımda müdafiə edir və onun inkişafına mane olanlara müntəzəm və ciddi mübarizə aparırdılar. Belə şəxsiyyətlərdən biri C.Məmmədquluzadə idi.

C.Məmmədquluzadə ədəbi dilimizin inkişafında həm nəzəri, həm də əməli cəhətdən fəaliyyət göstərirdi. Onu həmişə dilin təmizliyi, saflığı düşündürür və buna görə də dildə lüzumsuz olaraq ərəb və fars sözləri işlədilməsinə qarşı ciddi mübarizə edirdi O deyirdi: "Bəzi yazıçılar dilimizdə olan sözləri dəyişdirirlər, habelə Azərbaycan dilinin tərkiblərini və qanunlarını kənara qoyub, fars və ərəb tərkibləri qanunlarını işlədirdilər. Hələ "pədər", "madər", "nan" kimi sözlər səhldir, ərəb və fars dilindən elə bir xoruz səsi eşitməyən kəlmələr və ibarələr lüzumsuz yerə işlədirdilər ki, dəxi onları ərəb və farsca az savadlılar oxuyub başa düşmür və bu icad etdikləri qatış –bulaş dilin adını ədəbi dil qoyub, açıq ana dilini çoban dili adlandırdılar..."

C.Məmmədquluzadə öz bədii yaradıcılığı ilə bərabər, redaktoru olduğu "Molla Nəsrəddin" jurnalının vasitəsi ilə dilimizin inkişafı tarixində böyük fəaliyyət göstərmişdir.

*"Molla Nəsrəddin"* jurnalı: a) Azərbaycan dilinin milli müstəqilliyi, orijinallığının mühafizə olunmasında və b) ədəbi dilimizin daha da sadələşdirilməsində, onun şifahi danışığa yaxınlaşmasında xüsusi rol oynamışdır.

XX əsrin əvvəllərində mürtəce fikirli millətçilər digər mənfi ideyaları ilə yanaşı, Azərbaycan ədəbi dilinin inkişafına da mane olmaq üçün öz mətbuatlarını yaratmışlar. Millətçilərin 1906-cı ildə nəşrinə başladığı "Füyuzat" jurnalının əsas məqsədlərindən biri Azərbaycan dilinin müstəqilliyini inkar etmək, onu osmanlılaşdırmaqdan ibarət idi. Buna görə idi ki, həmin jurnal osmanlı dilində, həm də çətin ərəb və fars sözləri ilə dolu olan dolaşıq və anlaşılmaz bir dildə dərc olunurdu.

Eyni ildən, yəni 1906-cı ildən nəşr olunan demokratik "Molla Nəsrəddin" jurnalı həmin mürtəce xarakterli jurnalın tamamilə əksinə bir istiqamət və mövqe tuturdu. Bu jurnalın məqsədi xalqın mənafeyinə xidmət etmək, o cumlədən dilimizi qorumaq və inkişaf etdirməkdən ibarət idi.

"Molla Nəsrəddin" jurnalı xalqın başa düşəcəyi dildə yazmağı özü üçün yeganə prinsip qəbul etmişdi. Jurnal 1913-cü ildə nəşrə başlayan və "Füyuzat"ın ideyasını davam etdirməyə çalışan "Şəlalə"nin də dilini tənqid edərək onun nöqsanlı olduğunu göstərirdi,

XX əsrin əvvəllərində ədəbi dilimizin inkişafında, onun daha da püxtələşməsində və sadələşməsində M.Ə.Sabirin, Ə.Haqverdiyev və başqalarının da xüsusi rolu olmuşdur. Sovet dövründə Azərbaycan ədəbi dilinin nə qədər sürətlə və hərtərəfli inkişaf etməsini aşağıdakılarla səciyyələndirmək olar:

a)ədəbi dilimizin lüğət tərkibi yeni-yeni sözlərlə zənginləşmişdir;

b)bütün elm sahələrinə aid saysız-hesabsız terminlər yaradılmışdır;

c)ədəbi dilimiz xalqa daha da yaxınlaşdırılmışdır;

d)yazımız asan və mükəmməl əlifba əsasında qurulmuşdur;

e)dilimizin orfoqrafiyası elmi əsaslar üzərində qurulmuş və onun normaları qaydaya salınmışdır;

f)dilimizin qrammatik quruluşu daha da təkmilləşmiş və zənginləşmişdir;

g)ədəbi dilimiz ifadə tərzi cəhətdən daha da zənginləşmiş və müxtəlif üslublar meydana çıxmışdır.

## FONETİKA

Fonetika dilçiliyin bir bölməsidir.Fonetika yunan sözüdür, fone-səs, tikos- elm deməkdir.Fonetika dildəki danışıq səslərini, onlann əmələ gəlməsini,inkişafını və xüsusiyyətlərini öyrənir. Daha dəqiq elmi qrammatika dilində desək müasir Azərbaycan ədəbi dilinin fonemlər sistemindən fonetik qanunlarından, fonetik hadisələrindən və paçalardan bəhs olunur. Ahəng qanunu, heca və vurğu da fonetikanm mövzularına daxildir.

Danışarkən tələffüz etdiyimiz səslər danışıq səsləri adlanır. Bu səslər danışıq üzvlərinin köməyi ilə yaranır. Dodaqlar, dil və səs telləri danışıq səslərinin yaranmasında daha fəal iştirak edir. Danışıq səslərini tələffüz edir və eşidirik. Yazıda onlar hərflərlə işarə olunur. Hərfləri isə görür və yazırıq. Səsləri hərflərdən fərqləndirmək üçün dərslik kitablarında onlar böyük mötərizə içərisində verilir. Məsələn: [a]

Danışıq səsləri fərqli xüsusiyyətlərinə görə iki növə bölünür: **saitlər,samitlər**

**Saitlər** agız boşluğunda sərbəst və maneəsiz tələffüz olunur. Buna görə də onlar aydın şəkildə və avazla səslənir. Saitlərin daha bir xüsusiyyəti heca əmələ gətirməsidir.

**Samitlərin** tələffüzündə isə ağız boşluğunda müxtəlif maneələr olur.

Saitlərin bölgüsü

Dilimizdə 9 sait səs var: [a], [e], [ə], [i],|ı], [o], [ö], [u], [ü]. Yaranma vəziyyətinə görə saitlərin aşağıdakı üç bölgüsü var.

**1.** Dilin arxa və ön hissəsində deyilməsinə (dilin **üfüqü** vəziyyətinə) görə:

Qalın saitlər: [a], [ı], [o], [u]

İncə saitlər: [e], [i], [ə], [ö], [ü]

Qalın saitlər dilin arxasında, incə saitlər dilin önündə yarandıqları halda, e saiti əslində dilin ortasında yaranır.Buna görə də o çox vaxt dilortası sait adlandırılır.

Başqa sözlə, [e] saiti yaranma yerinə görə dilortası, səslənməsinə görə incə saitdir.Səslənmə cəhəti nəzərə alınıb [e] saiti incə saitlərin içərisində verilir.

**2**. Dilin üst damağa doğru yuxarı qalxması və nisbətən aşağı enməsi vəziyyətinə (dilin **şaquli** vəziyyətinə) görə:

Qapalı saitlər: [1], [i], [u], [ü]

Açıq saitlər: [a], [e], [ə], [0], [ö]

Qapalı saitlərin tələffüzündə alt çənə yuxarıya doğru qalxır və ağız boşluğu daralır. (Buna görə də onlara dar saitlər də deyilir). Bu saitləri asan yadda saxlamaq üçün dilimizdəki dörd cür yazılan şəkilçiləri (-çi, -çi, -çu, çü,-lıq,-lik,- luq, -lük və s) yadda saxlamaq lazımdır, belə şəkilçilərin tərkibində qapalı saitlər iştirak edir. Açıq saitlərin tələffüzündə isə alt çənə aşağı düşür və ağız boşluğu genəlir. (Buna görə də onlara gen saitlər də deyilir).

**3.** Dodaqların vəziyyətinə görə:

Dodaqlanan saitlər [0], [ö], [u], [ü]

Dodaqlanmayansaitlər: [a], [e], [ə], [1], [i].

Dodaqlanan saitlərin tələffüzündə dodaqlar bir qədər irəliyə gəlir və dairəvi şəkil alır. Dodaqlanmayan saitlərin tələffüzündə isə bu hal baş vermir.

Sait səslərin növlərini aşağıdakı cədvəldə daha aydın şəkildə görmək olar:

| | Açıq | | Qapalı | |
|---|---|---|---|---|
| | Qalın | Incə | Qalın | Incə |
| Dodaqlanmayan | A | e,ə | 1 | i |
| Dodaqlanan | 0 | ö | u | ü |

Cədvəldən göründüyü kimi, hər bir saitin üç növü var. Məsələn: [a] saiti qalın, açıq, dodaqlanmayan; [ü] saiti incə, qapalı, dodaqlanandır.

**Bəzi saitlərin uzun tələffüzü**

Dilimizdə, əsasən, ərəb mənşəli bir sıra sözlər var ki, onlarda bəzi saitlər bir qədər uzun tələffüz olunur.

Məsələn: Arif, alim, Sabir, şikayət, əfsanə sözlərindəki [a:] səsi; Etibar, elan, nemət sözlərindəki [e:] səsi; möcüzə, şölə, mötəbər sözlərindəki [ö:] səsi; məna, bəzi, tətil sözlərindəki [ə:] səsi uzun tələffüz olunur. Göründüyü kimi, [e], [ö] saitlərinin uzun tələffüz edildiyini bildirmək üçün yazıda çox vaxt bu saitlərdən sonra apostrof işarəsi qoyulur. Bəzi sözlərdə [i], [ü] və [o] saitləri də uzun tələffüz olunur. Məsələn: vəsiqə, həqiqət, zinət sözlərində [i] saiti; Füzuli, musiqi, xüsusi sözlərində [u] saiti uzun tələffüz olunur. Dovşan, sonra, dovğa, lovğa və s. kimi sözlərdə [o] saiti uzun tələffüz olunur, belə sözlərdə o hərfindən sonra gələn

v samiti (bəzən də n samiti) tələffüzdə düşür [do:vşanJ, [so. raj, [lo:ğa] Eyni hal tövbə, lövbər, bənövşə və s. kimi sözlərin tələffüzündə də baş verir :jfö:bə], [lö:bər], [bənö. şə].

Dilimizdəki [1] və [ü] saitləri isə uzun tələffüz olunmur. Üfüqi sözünün ikinci hecasındakı [ü] saitinin uzanması istisnadır.

**Qoşasaitli sözlərin yazılışı və tələffüzü**

Dilimizdə bəzi sözlər var ki, onlarda iki sait səsi ifadə edən hərflər yanaşı gəlir. Belə sözlər qoşasaitli sözlər adlanır. Qoşasaitli sözlərin çoxunun yazılışı və tələffüzü fərqlənir. Bu aşağıdakı qaydada olur:

**1.**Eynicinsli qoşa saitləri ifadə edən iki hərf bir uzun sait kimi tələffüz olunur. Məsələn: saat - [sa:t], maaş-[ma:ş], camaat - [cama:t], təəssüf - [tə:ssüf], mətbəə - [mətbə:], bədii- [bədi:], təbii - [təbi:] və s.

**2**.Tərkibində ai, ei, ie, (bəzən də io, ia, eə, ea) hərf birləşmələri olan sözlər bu saitlər arasına y samiti əlavə olunmaqla tələffüz edilir. Məsələn: ailə [ayilə], dairr - [dayima], zəif - [zəyifj, Səidə - [Səyidə], təbiət - [təbiyət], müdafiə - [müdafiyə] radio - [radiyo], dialoq - [diyaloq], iaşə - [iyaşə], maneə - [maniyə].

**3.**Tərkibində əa, üa, üə hərf birləşmələri olan sözlərdə birinci sait dəyişilir, ikincisi isə bir qədər uzun tələffüz edilir. Məsələn: səadət - [saadət],fəaliyyat -[fa:liyət], müalicə - [malicə], müəyyən - [məyyən], müəllim - [məllim] və s.

Qeyd 1: Əliağa, əmioğlu əliaçıq, bacıoğlu, dayıoğlu, xalaoğlu, başıaçıq və s. kimi qoşasaitli mürəkkəb sözlərin tələffüzündə də yanaşı gələn saitlərdən birincisi deyilmir, lakin ikincisi uzun tələffüz olunmur: Əliağa - [Əlağa, əmioğlu - [əmoğlu], əliaçıq - [əlaçtx], bacıoğlu - [bacıoğlu], xalaoğlu - [xaloğlu] və s.

Qeyd 2: Şüar, şücaət, məcmuə, sual, mətbuat, seans, bəraət, şüəra, riayət və s. kimi qoşasaitli sözlərdə bunlarin heç biri baş vermir.

**Samitlər**

Ağız və boğaz boşluğunda maneəyə rast gələrək tələffüz eedilən, küyün iştirakı ilə əmələ gələn səslər samit səslər adlanır.

Səs tellərinin iştirakına görə samitlər iki yerə bölünür:

**1.Cingiltili samitlər.**Cingiltili samitlərin tələffüzü zamanı səs telləri gərginləşir, tələffüz zamanı səsdən, az da olsa istifadə edilir.Cingiltili samitlər bunlardır:

[b], [c], [d], [g], [ğ], [j], [1], [m], [n], [r], [v], [y], [z].

Cingiltili samitlərdən [1], [m], [n], [r] səslərinin tələffüzü zamanı səs küydən daha çox olur.Bu səslər sonor adlanır və onların kar qarşılıqları yoxdur.

**2.Kar samitlər.**Bu samitlərin tələffüzündə səs telləri iştirak etmir, onlar yalmz küyün iştirakı ilə əmələ gəlir.Kar samitlər bunlardır:

[ç], [f], [h], [x], [x’], [k], [k’], [p], [s], [ş] [t].

Samit səslərdən 14-ü cingiltili, 11-i isə kar samitlərdir.Nəzərə almaq lazımdır ki, 11 kar samit səs 9 hərflə ifadə olunur.Azərbaycan dilində samit səslərin ümumi sayı 25-dir.K hərfi müvafiq olaraq [k] və [k'] səslərini ifadə edir.

[m] və [n]səslərinin əmələ gəlməsində hava axını, əsasən, burun boşluğundan çıxır.Buna görə də həmin samitlərə burun samitləri deyilir.

## Ahəng qanunu

Sözdə eynicinsli səslərin bir-birini izləməsinə ***ahəng qanunu*** deyilir.Ahəng qanunu Azərbaycan dili üçün çox mühümdür.Bu qanunu bəzən türk dillərinin dəmir qanunu adlandınrlar.Dildə saitlərin ahəngi əsasdır.Belə ki, ahəng qanunu, əasaən, saitlərin ahəngi üzrə qurulur. Saitlərin ahəngi iki cür olur:

1.İncə saitlərin ahəngi

2.Qalın saitlərin ahəngi

Qalın saitlərin qalın, incə saitlərin incə saitləri izləməsi damaq ahəngi adlanır. Ahəngin bu növündə dodaqlanan və dodaqlanmayan saitlər də qalın və ya incə olmaqla götürülür, yəni burada saitin yalnız qalın və ya incəliyi əsas sayılır. Dilimizdə sözün ahəng qanununa tabe olması daha çox damaq ahəngi ilə müəyyənləşir.Dilimizdə məhdud şəkildə dodaq ahəngi mövcuddur:odunçu,üzümçü

## Heca

Tələffüz zamanı sözün asanlıqla bölünən hissələrinə ***heca*** deyilir.

Sait səslər heca yaradan səslərdir. Sözdəki hecaların sayı saitlərin sayma bərabərdij Sait səslə qurtaran heca açıq heca, samit səslə qurtaran heca isə qapalı heca adlanır.

## Fonem

Sözün mənasını dəyişən səs ***fonem*** adlanır.

Dilimizdə dil vahidləri müstəqil və qeyri-müstəqil olmaqla iki yerə bölünür:

Müstəqil dil vahidləri (söz, cümlə) dilin formalaşmasında aparıcı rol oynayır. Qeyri-müstəqil dil vahidləri isə söz və ya cümlənin formalaşması vasitəsi kimi çıxış edir.Fonem belə bir qeyri-müstəqil dil vahidlərindən biridir.

## Vurğu

Azərbaycan dilində vurğunun üç növü vardır: heca vurğusu, məntiqi vurğu, həyəcanlı vurğu.

Sözdə hecalardan birinin o birinə nisbətən qüvvətli deyilməsi ***heca vurğusu*** adlanır .Üzərinə vurğu düşən heca vurğulu heca adlanır.Dilizdəki sözlərin çoxunda vurğu son hecadakı sait səsin üzərinə düşür. Cümlədəki sözlərdən birinin digərinə nisbətən qüvvətli tələffüzünə ***məntiqi vurğu (söz vurğusu)*** deyilir. Hiss və həyəcanları ifadə etmək üçün cümlədə və ya abzasda sözün, yaxud ifadənin qeyri-adi şəkildə tələffüz olunmasına ***həyəcanlı vurğu*** deyilir.

## İntonasiya

Nitqin ahəngi (səsin yüksəlməsi və ya alçalması), ritmi (vurğulu və ya vurğusuz hecanın nisbəti, əlaqəsi), nitqin tempi və ya sürəti (müəyyən vaxt ərzində sürətlə və ya yavaş-yavaş tələffüzü), intensivliyi, məntiqi vurğusu, tembri kimi hadisələrin məcmusundan ibarət olan mürəkkəb dil hadisəsi intonasiya adlanır. İntonasiya danışanın məqsədi, istək və arzulan ilə əlaqədar olduğundan modallıq bildirir.Onun vasitəsilə məumat vermə, sual və əmr intonasiyalan fərqləndirilir. İntonasiya cümlə üzvlərinin düzgün qruplaşdınlmasım təmin edir, sadə və mürəkkəb cümlələrin, habelə tabelilik və tabesizlik əlaqələrinin şərtləndirilməsinə xidmət edir.Bundan əlavə, intonasiya məntiqi vurğunun, ara sözlərin müəyyən olmasma imkan yaradır.İntonasiya, əasasən, sintaktik münasibətləri əks etdirir və bununla əlaqədar sadalama, aydınlaşdırma və s. bildirən intonasiyalar fərqləndirilir.

# AZƏRBAYCAN DİLİNİN ORFOQRAFİYA QAYDALARI

**Saitlərin yazılışı**

**1.**O saitli alınma sözlər a və ya o ilə deyilməsindən asılı olmayaraq o ilə yazılır: avtomat, biologiya, velosiped, ensiklopediya, kollektiv, kombinat, laborant, obyekt, poeziya, poema, poçtalyon, problem, professor, solist, motor, polkovnik.

**2.**Ü saitli alınma sözlər ü ilə də yazılır: alüminium, bülleten, büro, jüri.

**3.**Aşağıdakı sözlər ədəbi tələffüzdə olduğu kimi, iki heca ilə yazılır: qəbir, qədir, eyib, ətir, zehin, isim, nəsil, ömür, səbir, sətir, sinif, fəsil, fikir, şəkil, heyi£, meyil, əsil, şeir.

**4**.Əslində sonu a ilə bitən alınma sözlərdən aşağıdakılar a-sız yazılır: anket, aptek, armatur, atmosfer, vitrin, qəzet, idiom, kayut, kaset, kontor, konfet, lent, maşın, perspektiv, pyes, planet, reklam, sistem, sitat.

**Samitlərin yazılışı**

**5.**Birinci hecasındakı samiti həm n,həm də m ilə deyilən sözlər n ilə yazılır: anbar, qənbər, zənbil, günbəz, sünbül, şənbə. Kombayn, kombinat, kömbə, pambıq sözləri istisnadır.

**6.**Əslində sonu qoşa samitlə bitən iki və ya çoxhecalı sözlər bir samitlə yazılır: ekspres, kilovat, kiloqram, konqres, metal, mühüm, proses, sərhəd, hüsnxət.

**7.**Sonu -iy, -skiy ilə qurtaran xüsusi və ümumi alınma isimlərin sonundakı y yazılmır: Qorki, Yaroslavski, Mayakovski, ssenari, planetari, profilaktori, sanatori.

***Qeyd.*** Kimyəvi element adları əslinə uyğun olaraq yazılır: kalium, maqnezium, natrium.

**8.**Rus dilində tərkibində **ц** olan ümumi isimlər **s** ilə yazılır: dosent, konsert,, sex, sirk, sement, lisey. Vitse sözü istisnadır .Xüsusi isimlərdə sözün əvvəlində **s**, sözün ortasında və axırında **ts** yazılır.Setkin, Siolkovski, Vorontsov, Kuznetsov, Motsart, Muromets.

**9.**Rus dilində tərkibində **щ** olan alınma sözlərin əvvəlində və axırında bir **ş**, sözün ortasında isə iki **ş (şş)** yazılır: Şedrin, Şerba, şotka, borş, Vereşşaqin, Quşşin, meşşan.

**10.**Əsli **h** samitli alınma sözlər **h** ilə yazılır: Heyne, hektar, Hegel, hegemon, hidrogen, himn, hospital, hotel.

**11.**Əsli **c** samitli alınma sözlər **c** ilə də yazılır: Cek London, cemper, Siciliya.

**12.**Əsli **q** samitli alınma sözlər incə saitli hecalarda **g** ilə yazılır: biologiya, dialektologiya, genezis, general, geologiya, gigiyena, gimnastika, gitara.

## Sözün müxtəlif yerlərindəki qoşa sait və samitlərin yazılışı

**13.**Qoşa saitlə deyilən sözlər qoşa saitlə də yazılır: maaş, saat, camaat, bədii,əmtəə.

**14.**Təkhecalı sözlərin sonunda qoşa samitin hər ikisi yazılır: vatt, zənn, zidd, küll, rədd, sirr, fənn, xətt, haqq, hiss.Bu sözlərə samitlə başlanan şəkilçi əlavə olunduqda söz kökündəki qoşa samitdən biri düşür: zid-dir, sir-daş, fən-lər, xət-siz, his-siz.

**15.**İki sait arasında gələn qoşa samitlər qoşa samitlə yazılır: ballada, kassa, şassi, vassal, kapella, klassik, libretto, operetta, nəqqaş, səyyar, kəmiyyət.

***Qeyd.*** Qruppa, antenna, tonna, apparat, parallel sözləri və -ma hecası ilə qurtaran sözlər aşağıdakı kimi yazılır: qrup, anten, ton, aparat, paralel, diaqram, proqram, stenoqram, teleqram.

## Şəkilçilərin yazılışı

**16.**Sözdüzəldici şəkilçilər aşağıdakı kimi yazılır:

1.Bir cür yazılan şəkilçilər: 1) -i və ya -vi şəkilçisi: daxili, tarixi, həyati, cənubi, şimali, dairəvi, kimyəvi, kütləvi, Gəncəvi;2) -vari şəkilçisi: buynuzvari, qalxanvaıi, yüngülvari, üzükvari.

2.İki cür yazılan şəkilçilər:Kar samitlə bitənlərdə: -qan, -kən; cingiltili samitlə bitənlərdə -ğan, -gən şəkilçiləri: yapışqan, çalışqan, döyüşkən, sürüşkən, burulğan, deyingən.

3.Dörd cür yazılan şəkilçilər: 1) -kı, -ki, -ku, -kü şəkilçiləri: axşamkı, bildirki, səhərki, onunku, gündüzkü, bugünkü;2) sifət və isim düzəldən SHri, -u, -ü şəkilçiləri: badımcanı, darçını, narıncı, ceyranı, dərbəndi, çərkəzi,novruzu, gümüşü;3) fel köklərindən isim və sifət düzəldən şəkilçilər:
sonu kar samitlə bitənlərdə:a) -ki, -qı, -kü, -qu: seçki, bıçqı, sürtkü, pusqu; b) - kin, -qm, -kün, -qun: bitkin, satqm, ötkün, tutqun; sonu cingiltili samitlə bitənlərdə:a) -gi, -ğı, -gü, -ğu: vergi, çalğı, bölgü, vurğu; b) -gin, -ğm, -gün, -ğun: əzgin, qırğın, düzgün, yorğun. 4) -ıstan, -istan, -ustan, -üstan şəkilçiləri samitlə bitən sözlərdə: Dağıstan, Türkmənistan, Monqolustan, Türküstan.
Qeyd. Saitlə bitənlərdə -stan yazılır.

## Rəqəmlə yazılan miqdar saylarında şəkilçilərin yazılışı

**17.**Rəqəmlə yazılan miqdar saylarına mənsubiyyət və hal şəkilçiləri əlavə edildikdə şəkilçidən əvvəl defis qoyulur: 20-dən, 3-də, 2-yə, 6-nın, 5-i, 17-si.Ərəb rəqəmlərindən sonra ahəngə görə sıra sayının şəkilçisi ixtisarla (-cı, -ci, -cu, -cü) yazılır. 6-cı, 2-ci, 10-cu, 3-cü.

## Mürəkkəb sözlərin yazılışı

**18.**Bir vurğu ilə deyilən mürəkkəb sözlər bitişik yazılır: arabir, balacaboy, beşillik, beşmərtəbə, qalxanabənzər, qanunvericilik, qurultayqabağı, dilucu, günəbaxan, gülərüz, müxtəliftərəfli, özbaşınalıq, soyuqqanlı, ümumbəşəri, ucdantutma, bugünkü, hərgecəki, ilbəil, günbəgün, qaçaqaç, Bülbüloğlu, Qənbərqızı, Həsənoğlu, Çərkəzqızı, Əliağa.

**19.**Tərkibindəki sözlərin səciyyəsindən asılı olaraq, aşağıdakı hallarda defisdən istifadə edilir: 1) qoşa sözlərdə: adda-budda, az-maz, qara-qura, qarma-qarışıq, qonaq-qara, dedi-qodu, əzik-üzük, kağız-kuğuz, sür-sümük, aşıq- aşıq, top-top;2) tərkibində qeyri, əks, külli, anti, eks, vitse, kontr, ober, super

sözləri işləndikdə: qeyri-adi, qeyri-iradi, əks-inqilab, əks-hücum, külli-ixtiyar, vitse-admiral, kontr-admiral, ober-leytenant, super-market;3) izafət tərkiblərində: tərzi-hərəkət, nöqteyi-nəzər, həddi-buluğ, tərcümeyi-hal ;4) tərkibində mənaca bir-birinə yaxın və ya zidd sözlər işləndikdə: ab-hava, alış-veriş, ölüm-itim, kafe-restoran, kilovat-saat, cənub-qərb, şimal-şərq, az-çox, elə-belə, gec-tez, ağıllı-kamallı, ucsuz-bucaqsız, pis-yaxşı, fabrik-zavod, iki-üç, gedər-gəlməz, yazar-yazmaz, bitməz-tükənməz, dinməz-söyləməz.

## Köməkçi sözlərin yazılışı

**20.*İdi, imiş, ikən*** köməkçi sözləri adlardan (isim, sifət, say, əvəzlik) və saitlə qurtaran fellərdən sonra ayrı, samitlə bitən fellərdən sonra həm ayrı, həm də ilk saiti buraxılaraq, şəkilçiləşmiş variantlarda bitişik yazılır: ata idi, ata imiş, ata ikən, uşaq idi, uşaq imiş, uşaq ikən, gəlməli idi, gəlməli imiş, gəlməli ikən, gəlmişdi, gəlmişmiş, gəlirkən, gəlmiş imiş...

**21.**Qoşmalar iki cür yazılır:1) birhecalı qoşmalar (-can, -cən, -dək, -tək) aid olduqları sözə bitişik yazılır: dağacan, evəcən, küçəyədək, quştək;2) ikihecalı qoşmalar (qədər, kimi, ötrü,, təki, təkin, üçün, ilə) aid olduqları sözdən ayrı yazılır: evə qədər, adam kimi, ondan ötrü, sənin təki, şagird üçün***.Qeyd.*** İlə qoşması samitlə bitən sözlərdə ahəng qanununa uyğun olaraq -la, -lə şəklində bitişik yazıla bilər.

**22.**Mənşəcə mürəkkəb olan aşağıdakı bağlayıcılar bitişik yazılır: yaxud, nəinki, habelə, halbuki, həmçinin, hərgah, hərçənd, çünki.

**23.**İki sadə bağlayıcıdan və sadə bağlayıcı ilə başqa nitq hissələrindən əmələ gələn bağlayıcılar və bağlayıcı sözlər bir-birindən ayrı yazılır: belə ki, buna görə də, bununla da, bunun üçün, və ya, və yaxud, daha da, demək ki, yoxsa ki, guya ki, odur ki, ona görə, ona görə də, onun üçün də, tutaq ki, həm də.

**24.**Ədatlar sözlərdən ayrı yazılır: di get, gör ha, dedim də, sən ki, daha gözəl, lap pis, ən yaxşı.
-mı, -mi, -mu, -mü və -sana, -sənə ədatları istisnadır.Onlar aid olduqları sözlərə bitişik yazılır: Kitabdırmı? Qəşəngdirmi? Oxudumu? A kos-kosa gəlsənə, torbam doldursana?

Qeyd, -mı, -mi, -mu, -mü sual ədatı -da, -də ədatından ayrı yazılır: Sən də mi gedirsən? O yenə də mi danışacaq?

**25.**Eyni nidanın təkrarından əmələ gələn nidalar defislə yazılır: bəh-bəh, vay- vay, pəh-pəh, uy-uy, ha-ha-ha.

**26.**Müxtəlif sözlərdən əmələ gələn nidalar ayrı yazılır: ay aman, ay haray.

## Birinci hərfi böyük yazılan sözlər

**27.**Xüsusi isimlərin (yardımçı sözlərdən başqa) birinci hərfi böyük yazılır: Səməd Vurğun, Üzeyir bəy Əbdülhüseyn oğlu Hacıbəyli, Uzun Həsən, Süleyman Rüstəm, Süleyman Sani, Bəxtiyar Vahabzadə, İsgəndərlər, Mehdi Hüseynzadələr, Nizamilər, Hacı Qaralar...

**28**.Bədii əsərlərdə heyvanlar və cansız əşyalar surət kimi işlədildikdə onların adlarının birinci hərfi böyük yazılır: Qırat, Alapaça, Bozdar, Məstan.

**29**.Tarixi hadisələrin, dövrlərin, sülalələrin, nomenklatur terminlə işlənən yer adlarının, eləcə də qədim yazılı abidələrin və s. adlarının birinci sözünün birinci hərfi böyük yazılır: Vətən müharibəsi,

Yeddiillik müharibə, Versal sülhü, Dəmir dövrü, Orxon-Yenisey abidələri, Çaldıran döyüşü, Sasanilər dövrü, Səfəvilər sülaləsi, Xəzər dənizi, Azadlıq meydanı, Şuşa qalası...
Belə mürəkkəb adlara fərqləndirici söz əlavə olunduqda onun da birinci hərfi böyük yazılır: Orta Paleolit dövrü, Son Paleolit dövrü.

**30.**Ölkələrin, muxtar respublikaların, vilayət və diyarların rəsmi adlarının tərkibindəki bütün sözlərin ilk hərfi böyük yazılır: Azərbaycan Respublikası, Naxçıvan Muxtar Respublikası, Bakı Şəhər İcra Hakimiyyəti.

**31.**Yüksək dövlət vəzifələri (Azərbaycan Respublikasının Prezidenti, Azərbaycan Respublikasının Baş naziri, Azərbaycan Respublikası Milli Məclisinin Sədri), fəxri adlar, habelə nazirlik, komitə, birlik, cəmiyyət, qurum, akademiya, universitet, texnikum, teatr, filarmoniya, siyasi partiya, eləcə də tarixi günlərin və s. adlarının tərkibindəki bütün sözlərin (yardımçı sözlərdən başqa) birinci hərfi böyük yazılır: Azərbaycan Respublikasının Milli Məclisi, Azərbaycan Respublikasının Nazirlər Kabineti, Azərbaycan Respublikasının Xarici İşlər Nazirliyi, Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu, MMaqomayev adma Azərbaycan Dövlət Filarmoniyası, Heydər Əliyev adına Bakı Beynəlxalq Aeroportu, Azərbaycan Dövlət Nəşriyyatı, MMirqasımov adına Respublika Klinik Xəstəxanası, Beynəlxalq Qadınlar Günü, Ağstafa Rayon Təhsil Şöbəsi... ’

**32.**Orden, medal, bədii əsər, opera, balet, kinofilm, qəzet, jurnal, kinoteatr, mehmanxana, həşriyyat, kafe, restoran, düşərgə, yeməkxana, mağaza və s. adları dırnaqda və böyük hərflə yazılır: "İstiqlal" ordeni, "Azərbaycan Bayrağı" ordeni, "Ata və oğul" povesti, "Yeddi gözəl" baleti, "Uzaq sahillərdə" filmi, "Azərbaycan" qəzeti, "Cücələrim" kafesi, "Bahar" mağazası, "Badamlı", "İstisu" mineral suları....

***Qeyd.*** Dırnaqda yazılan belə adlara artınlan şəkilçi dırnaqdan kənarda yazılır: "Xalq qəzeti"nin bugünkü nömrəsi, "Yeddi gözəl"in ilk tamaşası:

**33.**Mirzə, hacı, şeyx, seyid, şah, soltan, ağa, bəy, bəyim, xan, xanım və S; , sözlər rütbə, ləqəb və titul bildirib sözlərdən əvvəl gəldikdə böyük, sözlərdən sonra gəldikdə isə kiçik hərflə yazılır: Mirzə Fətəli, Hacı Qara, Şeyx Nəsrullah, Seyid Əzim, Şah İsmayıl, Soltan Mahmud, Abbas mirzə, Nadir şah, Abbasqulu ağa, Fətəli xan, Heyran xanım:

## İxtisarlar (abreviaturalar)

**34.**İxtisarlar üç cür yazılına) tam ixtisarlar aid olduqları sözlərə (xüsusi və ya ümumi isimlər) uyğun olaraq böyük və ya kiçik hərflə yazılır: AR (Azərbaycan Respublikası), BMT (Birləşmiş Millətlər Təşkilatı), MM (Milli Məclis), m.(metr), c. (cild)..;b) yarımçıq ixtisarlar aid olduqları sözlərə uyğun olaraq, böyük və kiçik hərflərlə, mürəkkəb adların tərkib hissələri isə bitişik yazılır: akad. (akademik), prof. (professor), Azərkitab (Azərbaycan kitabı), AzərTAc (Azərbaycan Dövlət Teleqraf gentliyi)..;c) sözün orta hissəsinin düşməsi ilə yaranan ixtisarlar defislə yazılır: d-r loktor), z-d (zavod):

**35.** İxtisarlara əlavə edilən şəkilçilər onların son hecasına uyğun olaraq yazılır: ME A-dan, BMT-yə, MDB-nin.

## Sözün sətirdən sətrə keçirilməsi

**36.** Sözlər yeni sətrə hecalarla keçirilir: və-tən, mək-təb-li-lər
Bir saitdən ibarət hecalar istisnadır: ai-lə-li...

## AZƏRBAYCAN DİLİNİN ORFOEPİYA QAYDALARI

Müasir ədəbi tələffüzümüzün əsasını Azərbaycan ziyalılarının danışığı təşkil edir. Bu ziyalılar müxtəlif rayonlardan olmalarma baxmayaraq, yazılı dilin təsiri altmda ümumiləşmiş ədəbi dildə danışırlar. Ədəbi tələffüz həmin ziyalıların danışığından qidalanaraq öz qaydalarını süzgəcdən keçirir.
Müasir dilimizin orfoqrafıyası danışıq dili əsasında qurulduğundan bir sıra orfoqrafiya qaydaları eynilə orfoepiya üçün də qəbul edilə bilər.
Müasir dilimizin orfoqrafıyası ilə orfoepiyası arasında ümumi və ayrılan cəhətlər vardır. Fərqlənən çəhətlər orfoepiyanm xüsusiyyətləri ilə bağlıdır. Bu xüsusiyyətlər, başlıca olaraq, aşağıdakılardan ibarətdir:

**1.**Ədəbi tələffüzün əsas prinsipi tələffüzdə ağırlıq törədən, kobud səslənən, dilin ahənkini pozan cəhətlərdən qaçmaq, asanlıqla, sürətlə tələffüz edilən və zərif, incə, gözəl səslənən cəhətləri saxlamaqdan ibarət olmalıdır. Orfoqrafiyada morfoloji prinsipin tələbi üzrə felin şərt və arzu formaları keçmiş zamanda iki variantlı şəkilçilərlə (-sa, -sə, -a, -ə) verilirsə; məs.: alsa idi, gəlsə idi, ala idi, gələ idi, orfoepiyada **–say**$^2$, **-ay**$^2$-lə ifadə olunur,alsaydım, alaydım.

**2.**0rfoepiyada ümumxalq danışıq xüsusiyyəti daşıyan cəhətlərə yer verilir, dar dialekt xüsusiyyətləri isə nəzərə alınmır.

Məlum olduğu üzrə, orfoqrafıya morfoloji | prinsipdən çıxış edərək assimilyasiya hadisəsinə yol vermir, orfoepiyada isə, bunun əksinə olaraq,assimilyasiyadan geniş surətdə istifadə edilir. Lakin elə assimilyasiya tipləri vardır ki, onlar dar dialekt xüsusiyyəti daşıyır. Əlbəttə, assimilyasiyanın bu tipləri orfoepiyaya daxil ola bilməz. Məsələn, **-lar** şəkilçisi **n** səsi ilə bitən sözlərdən sonra gəldikdə ümumxalq danışıq xüsusiyyəti daşıyır və ədəbi tələffüzə daxil olur (danışannar, qalannar, odurmar və s.) lakin bu şəkilçi **m** səsindən sonra gəldikdə, məs.: adamnar dar dialekt xüsusiyyəti daşıdığı üçün orfoepiyaya daxil ola bilmir və bu söz yazıldığı kimi (adamlar) tələffüz olunur.

**3.**Orfoepiyada saitlərin uzun və qısa tələffüzü xüsusi əhəmiyyətə malikdir.
**4.**Şəkilçilərin tələffüzündə də ahəng qanunu əsasən gözlənir;S|lakin. orfoepiyamn prinsipləri ilə əlaqədar olaraq bəzi şəkilçilərin tələffüzündə ahəng qanunundan kənara çıxma hallan nəzərə çarpır.
**5.**Assimilyasiya və səs düşümü hadisəsi şifahi dilin xüsusiyyəti ilə bağlı olduğu üçün bunlar orfoepiyada daha geniş yer tutur.

## ŞƏKİLÇİLƏRİN TƏLƏFFÜZÜ

Tələffüzdə şəkilçilər əsasən ahəng qanununa tabe olur. Bununla yanaşı, bəzi hallarda söz əsasının son samitinin təsiri altında şəkilçinin əvvəlinci samiti assimilyasiya hadisəsinə uğrayır (bu hal xüsusən L səsi ilə başlanan şəkilçilərə aiddir).

**SÖZDÜZƏLDİCİ ŞƏKİLÇİLƏRİN TƏLƏFFÜZÜ**

1. **-çı, -çi, -çu, -çü:** *çayçı, əməyçi, quşçu, döyüşçü və s.*
2. **-li, -lu, -lü, -dı, -di, -du, -dü, -n, -ri, -ru, -rü, -m, -ni, -nu, -nü:** *yağlı, irəli, yuvalı, yüklü, gilli, qollu, atdı, ətdi, duzdu, süddü, narrı, tərri, nurru, ömürrü, qarını, sinni, enni, yunnu, yönnü və s.*
3. **-lığ, -liy, -luğ, -lüy, -dığ, -diy, -duğ, -duy, -rığ, -riy, -ruğ, -rüy, -nığ, -niy, - nuğ, -nüy:** *atalığ, meşəliy, qumluğ, üzümlüy, ağajdığ, tərsdiy, otduğ, döşdüy, narrığ,- tərriy, zorruğ, ömürrüy, aydınnığ, dənniy, odunnuğ, gönnüy və s.*
4. **-cığ, -ciy, -cuğ, -cüy:** *uşaqcığ, evciy, quzucuğ, gözcüy və s.*
5. **-cığaz, -ciyəz, -cuğaz, -cüyəz:** *uşaqcığaz, gəlinciyəz, quşcuğaz, gözcüyəz və s.*
6. **-ça, -çə:** *meydança, bağça, dəftərçə və s.*
7. **-lağ, -dağ:** *çaylağ, yaylağ, qışdağ və s,*
8. **-daş:** *yoldaş, sirdaş, əməkdaş və s.*
9. **-ca, -cə:** *düşüncə, əyləncə və s.*
10. **-ciy:** *körpəciy, kiçiciy və s.*
11. **-ımtıl, -umtul:** *sarımtıl, bozumtul və s. .*
12. **-rağ, -rəy:** *yaxşırağ, gödərəy və s.*
13. **-sız, -siz, -suz, -suz:** *başsız, dilsiz, duzsuz, sözsüz*
14. **-ı,.-i, -u, -ü:** *yazı, çəki, qorxu, sürü.*
15. **-ıcı, -ici, -ucu, -ücü:** *atıcı, bilici, qurucu,*
16. **-ğı, -ğu, -gi, -kü, -ki:** *çalğı, asğı, silgi, duyğu, pusğu, itki, içki, seçki və s.*
17. **-ım, -im, -um, -üm:** *atım, geyim, udum, bölüm və s.*
18. **-ığ,-iy, -uğ, -üy, -ağ, -əy**: *qalığ, biliy, buruğ, hörüy, yatağ, kəsəy və s.*
19. **-ış, -iş, -uş, -üş:** *yarış, gediş, gəliş, duruş, görüş və s.*
20. **-ın, -in:** *axın, sağın, biçin, əkin və s.*
21. **-ıntı, -inti, -untu, -üntü**: *axıntı, tikinti, ovuntu, töküntü və s.*
22. **-ınc, -inc, -unc, -ünc:** *qaxınc, qorxunc, sevinc, gülünc və s. .*
23. **-ma, -mə:** *qazma, süzmə və s.*
24. **-ğın, -gin**: *yanğın, gərgin və s.*
25. **-acağ, -əcəy:** *çapaçağ, siləcəy və s.*
26. **-anağ, -ənəy:** *tozanağ, döyənəy və s.*
27. **-ır, -ir:** *yatır (dövlət) ,gəlir (mədaxil) və s.*
28. **-ğan:** *yapışğan, qudurğan və s.*
29. **-mağ:** qazmağ, cırmağ və s.
30. **–gə:** süpürgə, döngə və s.

## SÖZDƏYİŞDİRİCİ ŞƏKİLÇİLƏRİN TƏLƏFFÜZÜ

### Cəm şəkilçiləri

Cəmlik bildirən **-lar, -lər** şəkilçisi tələffüzdə müxtəlif şəkildə özünü göstərir; belə ki, **t, d,** s, **z,** ş, **r, n** səsləri ilə bitən sözlərdən sonra assimilyasiya nəticəsində dəyişilir və aşağıdakı şəkildə tələffüz edilir: **-lar, -lər, -dar, -dər, -rar, -rər, -nar, - nər:** *uşağlar, adamlar, atdar, kolxozdar, itdər, daşdar, dərsdər, narrar, yerrər, qadınnar, gəlinnər* və s.

**Hal şəkilçiləri**

Hal şəkilçiləri yazıda olduğu kimi, tələffüzdə də, əsasən, eyni şəkildə işlənir. Lakin fərq sonu **m, n** səsləri ilə bitən sözlərə ismin çıxışlıq halında **-nan, -nən** şəkilçilərinin qoşulması ilə meydana çıxır.

*Yiyəlik hal*. -ın, -in, -un, -un (samitlə bitənlərdə): *kitabın, ətin, unun, bütün* və s.: -nın, -nin, -nun, -nün (saitlə bitənlərdə): *atanın, Əlinin, qutunun, ütünün* və s.

*Yönlük hal*. **-a, -ə** (samitlə bitənlərdə), **-ya, -yə** (sait lə bitənlərdə): *kitaba, quşa, evə, çölə, quzuya, körpüyə* və s.

*Təsirlik hal* **-ı, -i, -u, -ü** (samitlə bitənlərdə), **-nı, -ni, -nu, -nü** (saitlə bitənlərdə): *atı, iti, otu, südü* və s.; *qapını, əlini, qutunu, düyünü* və s.

*Yerlik hal***. -da, -də**: *otağda, dəftərdə* və s.

*Çıxışlıq hal.* **-dan, -dən, -nan, -nən:** *anadan, işdən, sürüdən, nənəmnən, nənənnən,işimnən,işinnən,bostannan, meydannan* və s.

**Mənsubiyyət şəkilçiləri**

Tələffüzdə də mənsubiyyət şəkilçiləri yazıda olduğu kimidir. Lakin saitlə bitən əsaslardan sonra gələn I və II şəxs cəmin mənsubiyyət şəkilçilərinin ilk saiti qısa tələffüz edilir.

*I şəxs təkdə:* **-ım, -im, -um, -üm (samitlə bitənlərdə), -m (saitlə bitənlərdə); məs.:** *kitabım, qələmim, quşum, gözüm, anam, nənəm* və s.

*I şəxs cəmdə:* **-ımız, -imiz, -umuz, -ümüz** (samitlə bitənlərdə), **-mız, -miz, - muz, -müz** (saitlə bitənlərdə); məs ***.atımız, işimiz, qolumuz, sözümüz, atamız, nənəmiz*** və s.

*II şəxs təkdə:* **-ın, -in, -un, -ün** (samitlə bitənlərdə), **-n** (saitlə bətənlərdə), məs.: ***başın, əlin, qollun, gözün, atan, məqalən*** və s.

*II şəxs* ***cəmdə:*** **-ınız, -iniz, -unuz, -ünüz** (samitlə bitənlərdə), **-nız, -niz, -nuz, - nüz** (saitlə bitənlərdə); məs ***.’.ayağınız, beliniz, yurdunuz, sözünüz, yazınız, nənəniz, yuxunuz, sürünüz*** və s.

*II şəxs tək və cəmdə:* **-ı, -i, -u, -ü** (samitlə bitənlərdə), **-sı, -si, -su, -sü** (saitlə bitənlərdə); məs.: ***papağı, işi, qolu, gözü, yazısı, nəvəsi, quzusu, ütüsü.***

## Xəbərlik şəkilçiləri

Xəbər şəkilçilərinin işlənməsində yazıdan fərqli olaraq tələffüzdə gözə çaıpan. xüsusiyyət *II şəxs cəmdə* **-sınız, -siniz, -sunuz, -sünüz** şəkilçiləmin əvəzinə **-sız, -siz, -suz, -süz** şəkilçilərinin işlənməsidir.

*I şəxs təkdə:**-əm,*** -əm (samitlə bitənlərdə),-yam, -yəm (saitlə bitənlərdə); məs.: qardaşam, ma:vinəm, yaxşıyam, mənəm, işçiyəm, tələbəyəm, tələbeyəm*, yazıram, kələcəyəm.

## Sıra say şəkilçiləri

Sıra say şəkilçiləri də tələffüzdə yazıda olduqu kimi **-mcı, -inci, -uncu, - üncü** (samitlə bitənlərdə), **-ncı, -nci** (saitlə bitənlərdə) şəkilçiləri ilə ifadə olunur; məs.: *qırxıncı, birinci, onunçu, üçüncü, yeddinci...*

## Felin inkar şəkilçiləri

Ədəbi tələffüzdə də felin inkar şəkilçiləri yazıda olduqu kimi**-m, -ma, - mə** şəkilçiləri ilə ifadə olunur. Lakin bu şəkilçilərdən sonra **y** səsi ilə başlanan şəkilçilər gəldikdə **y** səsinin təsiri altında şəkilçinin **a** səsi **ı** səsi ilə, **ə** səsi isə **i** səsi ilə **əvəz** olunur; məs.: ***almır, gəlmir, yazmamış, gəlməmiş, yazmıyacağ, gəlmiyəcəy*** **və** s.

### Felin zaman şəkilçiləri

*Şühudi keçmiş:* **-dı, -di, -du, -dü: *aldı, gəldi, oxudu, gördü.***

*Nəqli keçmiş:* **-mış, -miş, -muş, -müş; *almış, gəlmiş, durmuş, döymüş* və s.**

Nəqli keçmişin *II şəxs tək və cəmində* tələffüzdə zaman şəkilçisinin sonunda gələn ş səsi düşür və zaman şəkilçiləri **-mı, -mi, -mu, -mü** ilə ifadə olunur; məs.; *dözmüsən, yazmısız, demisiz, durmusuz, düşmüsüz* və s.Bundan əlavə, nəqli keçmiş *(birinci şəxsdən başqa)* **-ıb, -ib, -ub, -üb** şəkilçiləri ilə də ifadə olunur; məs.: *alıbsan, gəlibsən, alıbsız, gəlibsiz, alıb, gəlib* və s.

*İndiki zaman:* **-ır,-ir,-ur, -ür** (samitlə bitənlərdə); **-yır, -yir, -yur, -yür** (saitlə bitənlərdə); məs.: *atır, deyir, durur, görün, oynuyur,gözdüyür, quruyur, durulur...*

*Qəti gələcək zaman:* **-acağ, -əcəy**(samitlə bitənlərdə), **-yacağ, -yəcəy** (saitlə bitənlərdə); məs.: *danışacağ,.gəzəcəy, oxuyacäğ, gözdiyəcəy, deyəcəy və* s.

*Qeyri-qəti gələcək zaman:* ***-sır,*** **-ər** (samitlə bitənlərdə), **-yar, -yər** (saitlə bitənlərdə); məs.: *yıxar, tikər, axar, içər, başdıyar, işdiyər, bürüyər, gözdiyər*

### Xəbər formasının hekayəsinin şəkilçiləri

*Xəbər formasının hekayəsi* **-dı, -di, -du, -dü** şəkilçiləri ilə ifadə olunur; məs.: *danışırdı, almışdı, gedäcəydi, oxuyardı və s.*

*Xəbər formasının rəvayəti* **-mış, -miş, -muş, -müş** şəkilçiləri ilə ifadə olunur. məs.: *yazırmış, getmişmiş, deyəcəymiş, oxuyarmış* və s.

### Felin forma şəkilçiləri

***Əmr formasının şəkilçiləri***

*I şəxs təkdə:* **-ım, -im, -um, -üm** (samitlə,bitənlərdə), **-yım, -yim, -yum, -yüm** (saitlə bitənlərdə); məs.: *alım, gedim, qurum, görüm başdtyım, işdiyim, oxuyum, bürünüm* və s.

*I şəxs cəmdə:* **-ağ, -əy** (samitlə bitənlərdə), **-yağ, -yəy** (saitlə bitənlərdə); məs.: *yayağ, gedəy, başdıyağ, işdiyəy* və s.

*IIşəxs cəmdə:* **-ın, -in, -un, -ün** (samitlə bitənlərdə) **-ym, -yin, -yun, - yün** (saitlə bitənlərdə); məs.: *açın, tikin, durun, hörün, bağlıyın, işdiyin, qoruyun, bürüyün* və s.

*III şəxs tək və cəmdə:* **-sın, -sin, -sun, -sün;** məs.: *qalsın, getsin, uçsun, görsün, oxusun, düşünsün, başdaşın, işdəsin* və s.

**Arzu formasının şəkilçiləri**

Tələffüzdə arzu formasının keçmişinin işlənməsində gözə çarpan xüsusiyyət bupdan ibarətdir ki, burada yazıdan fərqli olaraq, forma şəkilçisi bir cür, yəni sözün ahənginə tabe olmayaraq -ey şəklində işlənir.

*İndiki zamanda:* **-a, -ə** (samitlə bitənlərdə), **-ya, -yə** (saitlə bitənlərdə); məs.: *yaza, gələ, oxuya, sürüyə* və s.

*Keçmiş zamanda:* **-əydi, -aydı, -əymiş, -aymış, -yəydi, -yaydı;** məs.: *alaydı, gedəydi, yeriyəydi, oxuyaydı, görəydi, sürəydi, qaçaymış* və s.

**Şərt formasının şəkilçiləri**

Tələffüzdə şərt formasının keçmişi **-səy** şəklində ifadə olunur.

*İndiki zamanda:* **-sa, -sə***; məs: görsə, oxusa, bürüsə və s.*

*Keçmiş zamanda:* **-səydi, -saydı, -səymiş, -saymış**; *məs: alsaydı, getsəydi, oxusaydı, versəymiş, yazsaymış və s.*

*İndiki zamanda:* **-mah, -məli**; *məs:: almalı, gəlimli, oxumalı, görməli ;yə*

*Keçmiş zamanda:* **-malıydı, -məliydi, -malıymış, -məliymiş;** *məs: yazmalıydı, getməliydi, görməliymiş, qaçmalıymış və s.*

**Lazım formasının şəkilçiləri**

*İndiki zamanda:* **-ası, -əsi** (samitlə bitənlərdə**),-yası, -yəsi** (saitlə bitənlərdə), məs.: *qazası, verəsi, oxuyası, bürüyəsi və s.*

*Keçmiş zamanda:* **-asıydı, -əsiydi, -asıymış, -əsiymiş** (samitlə bitənlərdə**), -yasıydı, -yəsiydi, -yasıymış, -yəsiymiş** (saitlə bitənlərdə); *məs: uçasıydi&gedəşiydi, oxuyasıydı, yeyəsiydi, oxuyasıymış, görəsiymiş və s.*

**Davam formasının şəkilçiləri**

*İndiki zamanda:* **-mağda, -məydə;** *məs.: yazmağda, getməydə və s.*

*Keçmiş zamanda:* **-mağdaydı,-məydəydi, -mağdaymış, məydəymiş**; *məs.: qaçmağdaydı, görməydəydi, qalmağdaymış, kəzməydəymiş və s.*

*Sual şəkilçiləri:* **-mı, -mi, -mu, -mü;** *məs.: aldımı, getdimi, oxudumu, gördümü və s.*

**Feli bağlama şəkilçiləri**

**1.-ıb, -ib, -ub, -üb** (samitlə bitənlərdə), **-yıb, -yib, yub, -yüb** (saitlə bitənlərdə); feli bağlama şəkilçilərinin axırdakı b səsi bir qədər kar tələffüz edilir; məs.: *alıb, gəlib, oxuyub, bürüyüb, işdiyib* və s.

**2.-arağ, -ərəy (samitlə bitənlərdə), -yarağ, -yərəy (saitlə** bitənlərdə); məs.: *qaçar ağ, deyərəy, başdıyarağ, işdiyərəy* **və s.**

**3.-anda, -əndə (samitlə bitənlərdə),-yanda, -yəndə (saitlə bitənlərdə); məs.:** *alanda,gələndə, oxuyanda, sürüyəndə* **və s.**

**4.-ınca, -incə, -unca, -üncə (samitlə bitənlərdə), -ymca, -yincə, -yunca, - yuncə (saitlə bitənlərdə);** *məs.'.çıxınca, girincə, uçunca, üzüncə, oxuyunca, görüncə, bilincə, bürüyüncə* **və s.**

**5.-dığca, -diycə, -duğca, -düycə**; məs.: *danışdığca,dediycə, oxuduğca, gördüycə* və s.

**6.-dığda, -diydə, -duğda, -düydə**; məs.: *axtardığda; bildiydə,' qurduğda, sökdüydə* və s.

**7.-dığdan, -diydən, -duğdan, -duydən;** məs.: *axtardığdan, oxuduğdan, kördüydən* və s.

**8.-annan, -ənnən** *sonra;* məs.: yazannan *sonra*, görənnən *sonra* və s.

**9.-madan, -mədən**; məs.: *almadan, görmədən* və s.

**10.-mamış, -məmiş**; məs.: *almamış, getməmiş* və

**11.-arkan, -ərkən** (samitlə bitənlərdə), -yarkən, yərkən (saitlə bitənlərdə); məs.: *bağlıyarkan, birləşərkən, qaçarkən, yeyərkən* və s.

**12.-mışkən, -mişkən;** məs.: *aparmışkən, gətirmişkən* və s.

**13.-ar, -maz, -ər, -məz**; məs.: *yazar, yazmaz, kələr, kəlməz* və s.

**14.-alı, -əli** (samitlə bitənlərdə),-yalı, -yəli (saitlə bitənlərdə); məs.: *yazalı, gedəli, oxuyalı* və s.

**15.-anı, -əni;** məs.: *yazanı, gələni* və s.

**Məsdər şəkilçiləri**

**-mağ, -məy;** məs.: *yazmağ, görməy, oxumağ* və s.

**Zərf şəkilçiləri**

**1.-ca, -cə;** məs.: *məncə, qabağca, rahatca və s.*

**2.-casma, -cəsinə**; məs.: *qəhrəmancasına, kommunistcəsinə və s.*

**3.-cadan, -cədən**; məs.: *yavaşcadan, öncədən və s.*

**4.-nən, -nan**; məs.: *tədricnən, asannığnan və s.*

**5.-dan, -dən**; məs.: *çoxdan, tezdən, bərkdən və s.*

## Alinma sözlərin tələffüzü. Ərəb və fars mənşəli sözlərin tələffüzü

1 .Ərəbcə və farscada ğ ilə deyilən sözlər tələffüzdə q səsi ilə ifadə olunur; məs.: *qalib, qeyrət, qərb, qüssə, qəflət, qəribə vəs.*

2.Təkhecalı sözlərin sonunda gələn qoşa samitlərdən biri tələffüz olunmur; məs.: *zən, zid, rəd sir, tib,fən, xət, həd, həl,* his və s.

Belə sözlərə saitlə başlanan şəkilçilər qoşulduqda sözün axınndakı qoşa səslər qalır; məs.: *haqqında, ziddinə, xəttin və* s.

3.Ərəbcədə sözlərin ortasında i ilə yazılan sözlər tələffüzdə yi ilə ifadə olunur; məs.: *ay ilə, bayis, dayim, dayirə, mayil,fayiz, xayinvə* s.

4.Bir qisim ərəbcə və farsca sözlər dilimizin ahənginə tabe edilərək tələffüz olunur, lakin bir qisim sözlər də vardır ki, əslində olduğu kimi, yəni ahənginə tabe edilməyərək tələffüz olunur.

a) *ahəngə tabe olanlar;* məs.: *nahar, zaman, nağıl, naxış, rahat, davam, qadağan, babat, qala, xata, xırman, fağır, farağat, bəxt, bəxtəvər, vərəq, dənə, təqsir, tərəzi, xəmir, xətir* və s.

b) *ahəngə tabe olmayanlar;* məs.: *bərabər, qəbul, qərar, zəmanə, xatirə, istirahət, iştaha, səfa, kənar, macəra, güzəran, məhsul* və s.

5.Ərəbcə və farsca sözlərin əsasən birinci hecasında gələn ə, i, ü səslərinin tələffüzü.

**a)** ə səsi ilə tələffüz olunur; məs.: *qənaət, əmtəə, nəhayət, rəyasət, səyahət, cəhət* və s.

**b)** i səsi ilə tələffüz olunur; məs.: *Vidadi, qiraət, nicat, rica, siyasət* və s.

fi səsi ilə tələffüz olunur; məs.: *Füzuli, fürsət, hücum və s.*

6.Sonu saitlə bitən sözlərə saitlə başlanan şəkilçilər qoşulduqda iki sait «Jlndan, y vəs səsləri tələffüz olunur; məs.: ***sənayenin, sənayeyə, sənayesi, mənbəyi, mənşəyi, taleyi, ixtirası, misrası*** və s.

7.Əslində sifət şəkilçisi iyyə, məsdər şəkilçisi iyyət və bunların cəmi olan iyyat bir y ilə tələffüz olunur; məs ***.'.maliyə, şəviyə, əhəmiyət, cəmiyət, ziddiyət, kəmiyət, müvəffəqiyət, ictimaiyət, ədəbiyat, külliyat*** və s.

8.Farsca bi, na, həm kimi ön şəkilçilər sözlərə bitişərək olduğu kimi ***tələffüz*** edilir; məs.: ***bisavad, naxoş, namərd, həmcins*** və s.

9.Farsca sözün axırında gələn sifət şəkilçisi tələffüzdə də i (samitlə bitənlərdə), vi (saitlə bitənlərdə).ilə ifdə olunur,: *lazımi, təsadüfi, iqtisadi, Gəncəvi, kimyəvi və s.*

10.Farsca yer bildirən -stan, -ıstan, -istən, -ustan, -üstan şəkilçiləri yazıldığı kimi də tələffüz edilir; *məs.ıGürcüstan, Ermənistan, Dağıstan, Hindistan, Monqolustan, Kürdüstan və s.*

11.Sözlərin axırına qoşulan farsca namə, xana sözləri yazıldığı kimi də tələffüz olunur; məs.: ***kitabxana, çayxana, şəhadətnamə, bəyannamə*** və s.

## RUS VƏ AVROPA MƏNŞƏLİ SÖZLƏRİN TƏLƏFFÜZÜ

1 .Ruscada sözün tərkibindəki **q** səsindən sonra **e** və **i** səsləri kələrsə, **q** səsi **g** səsi kimi tələffüz olunur; məs *.'.geologiya, biologiya, gimnastika, gitara, general, geodeziya, gerb və s.*

2.Əslində **h**, ruscada isə bəzən **q** və bəzən də **x** ilə deyilən sözlər **h** səsi ilə tələffüz olunur; məs.: *humanizm, himn, Hekel, harmoniya, hektar, Bethoven və-s.*

3.Əslində c, rusçada isə **dj** ilə deyilən sözlər cilə tələffüz olunur; məs.: *caz, cemper, Caparidze, Cek London* və s.

4.Sözlərin tərkibindəki **ts** səsi **s** ilə tələffüz olunur; məs.: *sirk, sex, resept, dasent, kansert* və s.

5.Sözlərin əvvəlində kələn **tş** səsi **ş** səsi ilə tələffüz olunur; məs.: *Şerba, Şedrin, şotka və* s.

6.Ruscada **o** səsi ilə yazılıb, **a** səsi ilə deyilən sözlər **a** səsi ilə də *tələffüz* olunur; məs.: *praqram, prablem, Maskva, Adessa, Qançarov, Talstoy, mator, parovoz, samavar* və s.

7.Sözlərin tərkibində **ia** səsləri **iya** kimi tələffüz olunur; məs.: *diyalektika, imperiyalizm, materiya, materiyalizm sosiyalizm* və s.

8.Sözün müxtəlif yerlərində gələn eynicinsli qoşa samitlərdən biri tələffüz olunmur; məs.: antena, aparat, masaj, pasaj, tunel, rejisor, sesiya, teleqram və s.

9.Ruscada sonu **a** ilə bitən sözlər tələffüzdə **a-sız** deyilir; məs.: *qəzet, qrup,*

10. Ruscada sonu **ik** ilə bitən və sözün vurğusu bu şəkilçidən əvvəlki hecanın üzərinə düşən ixtisas və məşğuliyyət bildirən sözlər ruscada olduğu kimi *tələffüz* olunur; məs.: *fizik, botanık, akademik, texnik.*

## Leksikologiya, semasiologiya və frazeologiya haqqında ümumi məlumat.

Söz dilin əsas vahididir. Dildəki sözlərin hamısı birlikdə dilin lüğət tərkibini, yəni leksikasım təşkil edir. Dilin lüğət tərkibini öyrənən elm leksikologiya adlanır. Leksikologiya yunanca iki sözdən-lexikos (söz) və loqosdan (təlim) ibarətdir. Leksikologiya dilçiliyin bir bölməsi olub, dildəki bütün sözləri öyrənir. Sözlər, əşyaları, hərəkəti, əlaməti, miqdarı və s. ifadə etməyə xidmət göstərir. Hər bir sözün birbaşa ifadə etdiyi mənaya onun leksik mənası deyilir. Sözlərin leksik mənası izahlı lüğətlərdə öz ifadəsini tapır. Məs.: Kərə-əridilmiş yağ, şit yağ, Maya - I.Qıcqırma əmələ gətirən rtıaddə, rüşeym, döl, müəyyən bir şeyə qoyulan pul, II.Dişi dəvə. Sözün leksik mənası ilə, yanaşı, qrammatik mənası da olur. Məs.: Dəryaz sözünün ot çalmaq üçün uzun saplı, dişsiz orağa oxşayan alət olması onun leksik mənasıdır; isim olması, adlıq halda işlənməsi isə qrammatik mənasıdır. Əsas nitq hissələrini təşkil edən bütün sözlər leksik və qrammatik mənaya malik olur. Amma köməkçi nitq hissələrinin yalnız qrammatik mənası olur.İzahlı lüğətlərdə sözlərin leksik mənaları, orfoqrafiya lüğətində onlarm düzgün yazılış qaydaları, orfoepiya lüğətində düzgün tələffüz qaydaları və s. əhatə olunur. Lüğətlərin növləri çoxdur: orfoqrafiya, orfoepiya, lesika, termin lüğətləri və s. Bunların hamısında sözlər əlifba sırası ilə düzülür.

1) Bütün sözlərin leksik niənası olmur.
2) Sözün leksik mənası onun məzmununu əks etdirir.
3) Sözün qrammatik mənası sözlərin hansı nitq hissələrinə aid olması və həmin nitq hissəsinə xas olan xüsusiyyətləri ifadə etməsi ilə müəyyənləşir.

Bütün sözlərin qrammatik mənası olur. Sözün leksik mənasım müxtəlif yollarla izah etmək olar:

1. Həmin sözə yaxm mənalı söz seçməklə (özül-təməl-bünövrə, qaçmaq-yüyürmək)
2. Əşyanm, hərəkətin əlamətlərini izah etməklə (şütümək-sürətlə ötüb keçmək)
3. Mürəkkəb sözün hissələrinin mənasını açmaqla (meşəbəyi-meşə gözətçisi)
4. Sözə əks mənalı sözü seçməklə: gözəl-çirkin.

## Müasir Azərbaycan dilində işlənən söz qrupları

Dilin leksik tərkibini təşkil edən bütün vahidlər hər cəhətdən bir-birinə oxşamır. Dildəki hər bir leksik vahidin özünəməxsus xüsusiyyətləri və üslubi vəzifələri vardır. Buna görə də bəzi sözlər dilin bütün üslublarında işlənə bildiyi halda, digər qrup sözlər müəyyən üslubi məqsəd üçün yalnız bir üslubda işlənir. Bundan başqa, dildə bəzi sözlərdən az, bəzi sözlərdən isə çox istifadə olunur və s.

Bütün bu cəhətlər nəzərə alınaraq müasir Azərbaycan ədəbi dilinin leksikası, əsasən, aşağıdakı söz qruplarına bölünür: *ümumişlək sözlər, poetik sözlər, köhnəlmiş sözlər, neologizmlər, terminlər, dialektizmlər, loru sözlər, vulqar sözlər*.

ÜMUMIŞLƏK SÖZLƏR

*Cəmiyyət və kainata aid əşya, hadisə, əlamət və s. anlayışların adını bildirib dildə çox işlənən sözlərə ümumişlək sözlər deyilir.* Bunlar hamı tərəfindən eyni dərəcədə və eyni mənada başa düşülür; Məsələn:

Yenə də yamyaşıl geyinir dağlar,
Göz kimi durulur qaynar bulaqlar.
Əriyir güneylər döşündəki qar,
Yağış da isladır o göy çəməni,
Təbiət ilhama çağırır məni!

Bu misralardakı sözlərin hamısı ümumişləkdir. Çünki bunlar və bu qəbildən olan digər sözlər Azərbaycan dilində danışanlar üçün eyni dərəcədə aydındır.

Ümumişlək sözlər dilin leksik tərkibinin başlıca olaraq, əsas hissəsini təşkil edir və ən zəruri, həyati anlayışları əks etdirir. Belə sözlər maddi varlığa və eləcə də insan fəaliyyətinin bütün sahələrinə aid olur; məsələn:

a)ad bildirənlər: ata, ana, ev, ot, ət, yağ, bal, baş;
b)əlamət və keyfiyyət bildirənlər: yaxşı, pis, ağ, qırmızı, acı, şirin;
c)miqdar və kəmiyyət bildirənlər: beş, on, yüz, az, çox;
d)hal və hərəkət bildirənlər: yatmaq, oxumaq, yemək, gəlmək, getmək.

Ümumişlək sözlər dilin hər bir üslubunda, yəni bədii, elmi, ictimai, rəsmi üslublarında işlənə bilir və işləndiyi nitqdə fikrin bütün dərinliyi ilə sadə və təbii ifadə olunmasına imkan verir.

POETİK SÖZLƏR

*Yüksək obrazlılığa, emosianallığa və ifadəliliyə malik olan sözlərə poetik sözlər deyilir*.Poetik söz nitqə incəlik verir və onu bədiiləşdirir; məsələn:

Ey əzəli can ilə cananımız!
Eşqi-ruxundur əbədi şanımız!
(Nəsimi)

Hə, balam, doğrusu, ay dadaş mən dəxi
Məsləhət ondan o yana bilmərəm.
(M.Ə.Sabir)

Bu misralardakı canan və dadaş sözləri poetik sözlərdir. Bunlar ümumişlək və digər sözlərdən öz xüsusiyyətlərinə görə fərqlənir.

Ədəbi dildə poetik sözlər müxtəlif yollarla meydana gəlir. Bunlardan bir neçəsinə nəzər yetirək.

1)Bəzi poetik sözlər xalq poeziyasından gəlir; məsələn:

Düşüb can dara, yerdə,
Qalıb qanara yerdə
Öldürdü canan məni,
Getdi can ara yerdə.

Tarixən folklor poeziyası üçün xarakterik olan canan sözü öz poetikliyini saxlayaraq ədəbi dilə keçmişdir.

2)Bəzi poetik sözlər ədəbi dilin yeni söz yaratmaq imkanları əsasında əmələ gəlir; məsələn:

Kürün qırağında, Muğan düzündə,
Zəmisi, tarlası suyun gözündə,
Salmanlı adlanan bir kəndciyəz var.

(S.Vurğun)

Bu misralardakı kənd sözü şəkilçi vasitəsi ilə kəndciyəz formasında poetikləşdirilmişdir.

3)Başqa dillərdən keçmiş bəzi sözlər poetik xarakter almışdır. Məsələn; mənşəcə başqa dillərə məxsus olan əlvida, səma, sayə, əfsus, acaba, mavi və s. Kimi sözlər dilimizdə əsasən fikrin obrazlı ifadə olunmasına xidmət etdiyi üçün poetikləşmiş vahidlərdir.

Dildə poetik sözlər olduğu kimi poetik ifadələr də vardır; məsələn:

Mən qartalam, qıy vuranda havada
Düşmənlərim tir-tir əsir yuvada.

(Ə.Qasımov)

Bu misaldakı qıy vurmaq tir-tir əsmək ifadələri poetik xarakter daşıyır. Dildəki poetik söz və ifadələrin hamısı poetizm adlanır. Poetizmlər əsasən ədəbi dilin bədii üslubunda işlənir.

<u>Köhnəlmiş sözlər</u>

Fəal şəkildə istifadədən qalan sözlərə köhnəlmiş söz deyilir. Azərbaycan dilinin lüğət tərkibində müəyyən miqdar köhnəlmiş söz vardır. Bunlara aşağıdakıları misal göstərmək olar: ağa, nökər, bəy, girvənkə, çuxa, arxalıq, qul, cüt və s.

Dildə bu və ya başqa bir sözün köhnəlməsi olduqca mürəkkəb bir prosesin nəticəsidir. Buna görə də bu və ya digər sözün köhnəlməsi süni olaraq sərhəd qoymaq mümkün deyildir. Söz dildə ya uzun illər fəal vahid kimi ömür sürür, ya da bəzi səbəblərlə əlaqədar olaraq müəyyən dövrdən sonra köhnələ bilir. Hər bir sözün taleyi onun ifadə etdiyi məna ilə və xidmət etdiyi xalqın düşüncəsi ilə bağlı olur.Bütün bunlara əsasən də sözün köhnəlməsi obyektiv qanunauyğunluq əsasında meydana çıxır.

Bəs köhnəlmiş sözlər necə müəyyən edilir? Bu qrup sözlərin müəyyənləşdirilməsi üçün əsas meyar dilin müasir vəziyyətidir. Köhnəlmiş hər bir söz dilin bugünkü vəziyyəti ilə yoxlanılır, onun nə

dərəcədə işlənib-işlənmədiyi aydınlaşdırılır. Köhnəlmiş söz müəyyənləşdirilərkən tarixilik prinsipi əsas götürülür. Yəni hər bir fakta tarixilik cəhətdən yanaşılır; məsələn: XIX əsrdə M.F.Axundov əsərlərində yüzbaşı, murov, yasavul və s. kimi sözlər işlənilmişdir. Bu sözlər hazırkı dövr üçün köhnəlmişdir. Lakin XIX əsrdə bunlar fəal istifadə olunan adi sözlər idi. Deməli bu və ya başqa bir söz bir dövr üçün adi, digər dövr üçün arxaik ola bilir.

Dildə köhnəlmiş sözlərin köhnəlmə dərəcəsi eyni olmur. Belə ki, bəzi sözlər az, bəzi sözlər isə çox köhnəlir. Bu nöqteyi-nəzərdən Azərbaycan dilindəki köhnəlmiş sözləri iki qismə bölmək olar:

a)Ancaq müasir ədəbi dil üçün köhnəlmiş sözlər. Bu qrup sözlər vaxtı ilə ədəbi dildə də olub, hazırda ümumxalq Azərbaycan dilinin yalnız dialekt və şivələrində işlənir; məsələn:

Səndən neçə min can ayrı düşdü,
Tən ya çürüdü, ya sayru düşdü.
(Xətayi)
Can mey andırdı əhl mövbəyə məkrar gül
(M.Füzuli)
Ünümdən titrədi tamam vilayət
Elə sandılar ki, qopdu qiyamət.
(M.P.Vaqif)

Bu misralardakı *sayru* sözü *xəstə* mənasında, *andırmaq* sözü *yada salmaq, xatırlamaq* mənasında dilimizin bir sıra dialekt və şivələrində işlənməkdədir. Səs mənasında olan *ün* sözü isə bəzi dialekt və şivələrdə hələ də yaşayaraq *səs* sözü ilə qoşalaşmış şəkildə işlənir.

b)Ümumdil üçün köhnəlmiş sözlər. Bu qrup sözlər vaxtı ilə dildə işlənib, indi isə nə ədəbi dildə, nə danışıq dilində istifadə olunmayan sözlərdir. Belə sözlərə əsasən qədim abidələrin dilində təsadüf olunur; məsələn:

Oğlun sağdır əsəndir avdadır.(Kitabi Dədə Qorqud)

Bu misaldakı əsən sözü X-XI əsrlərdə salamat mənasında işlənmiş, indi isə demək olar ki, tamamilə köhnəlmişdir.

Dildə istər az, istərsə də çox dərəcədə köhnəlmiş olan hər hansı bir söz bu və ya digər qohum dillərdə fəal söz kimi işlənə bilir. Bunu başqa şəkildə desək qohum dillər üçün ortaqlı olan sözlərin bir dildə köhnəlməsi həmin sözün digər dillərdə də köhnəlməsi üçün şərt ola bilmir və ola da bilməz.

Köhnəlmiş sözlərin hamısı eyni əlamətə malik olmayıb, bir qrupu digərindən bu və ya başqa xüsusiyyətləri ilə fərqlənir. Bunlardan bəziləri ifadə etdikləri məfhumdan ayrılaraq, bəziləri isə məfhumla bərabər köhnəlmişdir. Bu nöqteyi-nəzərdən Azərbaycan dilindəki köhnəlmiş sözlər iki qrupa bölünür: tarixizmlər və arxaizmlər.

## TARİXİZMLƏR

İfadə etdikləri əşya və hadisə ilə birlikdə köhnəlmiş sözləri şərti olaraq tarixizm adlandırmaq olar; məsələn: yasavul, darğa, qazı və s.

Tarixizmlər əsasən dövlət quruluşu, ictimai vasitə və münasibətlərlə bağlı meydana çıxan köhnəlmiş sözlərdir. Buna görə də tarixizmlərin ifadə etdikləri anlayışların köhnəlməsi başlıca olaraq cəmiyyətin və ictimai quruluşun yüksək tərəqqisi və inkişafı ilə əlaqədardır. Bu qrup sözlər müxtəlif dövrlərdə meydana çıxdığı üçün bunların bəzisi qısa, bəzisi isə uzun tarixə malikdir. Məsələn: qolçomaq, rəncbər, mədrəsə, mollaxana və s. Kimi sözlər təxminən 40 il bundan əvvəl köhnəlməyə başlamışdır. Lakin bəzi sözlər, hətta lap yaxın zamanlarda köhnəlmiş, yaxud da köhnəlməkdədir. Hazırda dilimizdəki patefon sözü belə bir prosesi keçirməkdədir.

Tarixizmlər müxtəlif sahələrə aid ola bilir; məsələn:
*Vəzifə adı bildirənlər*: koxa, darğa, onbaşı, kəndxuda
*Silah adı bildirənlər:* qalxan, şeşpər
*Ölçü adı bildirənlər:* misqal, batman, girvənkə
*Geyim adı bildirənlər*: çuxa, əba, arxalıq
*Alət adı bildirənlər*: xış, cüt
*Dini anlayış bildirənlər*: falçı, şeyx, zəkat, dərviş
*Müəssisə adı bildirənlər: qazamat, mədrəsə, mollaxana*

Deməli, köhnəlmiş sözlərdən tarixizmləri müəyyən edən əsas meyar həm sözün, həm də onun ifadə etdiyi anlayışın fəal istifadədən qalmasıdır; bunların hər ikisinin köhnəlməsidir. Arxaizm geniş anlayışdır. Dilin bütün sahələrində, yəni səs sistemində, lüğət tərkibində, qrammatik quruluşunda, orfoqrafiyasında, orfoepiyasında arxaizm hadisəsi vardır. Buna əsasən arxaizmlər bir neçə növə bölünür: fonetik, lüğəvi və qrammatik arxaizmlər. Bunlardan lüğəvi arxaizmlər leksikologiya bəhsində öyrənilir.

## LÜĞƏVİ ARXAİZMLƏR

*Sözün ifadə etdiyi anlayışla bağlı olan əşya və hadisənin qalması lakin ya sözün özünün, ya da onun ancaq mənasının köhnəlməsinə lüğəvi arxaizm deyilir*. Dildə lüğəvi arxaizmlər əsasən bu və ya başqa anlayışı ifadə edən sözlə bərabər ikinci bir sözün əmələ gəlməsi və bunların bir-birini sıxışdırması əsasında yaranır. Məsələn; hələ lap qədim zamanlarda çalıb-oxuyan şəxs mənasını bildirmək üçün dilimizdə ozan sözü işlənmişdir: Qolça qopuz götürüb eldən-elə, bəydən-bəyə ozan gəzər. Lakin müəyyən bir vaxtdan sonra bu və ya digər səbəblərlə əlaqədar olaraq aşıq sözü meydana çıxmış və bu söz ozan sözünü istifadədən salmışdır. Beləliklə ozan sözü arxaikləşmişdir.

Dilimizdə sözlərin arxaikləşməsinin müxtəlif təzahürləri vardır. Belə ki, bəzi sözlərin özü, bəzi sözlərin isə mənası köhnəlir. Buna görə də arxaik sözlər bir-birinin eyni olmayıb müxtəlif növlüdür.

Azərbaycan dilində lüğəvi arxaizmlərin iki növü vardır: leksik arxaizmlər və semantik arxaizmlər.

## LEKSİK ARXAİZMLƏR

Əşya və hadisəni ifadə etməkdən ayrılıb tamamilə arxaik plana keçən sözlər leksik arxaizmlər adlanır; məsələn: ayıtmaq, əsrük, iraq və s.

Bu sözlər dilin lüğət tərkibinin passiv hissəsinə keçmişdir və müasir ədəbi dilimizdə fəal işlənmə iqtidarı olan leksik vahidlər hüququna malik deyildir. Bunlar unudulmuş, ya da unudulmaq prosesini keçirən sözlərdir.

SEMANTİK ARXAİZMLƏR

Öz əvvəlki formasını saxlayıb ancaq, mənası köhnəlmiş sözə semantik arxaizm deyilir. Məsələn; keçmişdə kişi sözü adam insan mənasında işlənmişdi;

Həm səbru qəraru taqətim yox,
Dəxi kişi ilə ülfətim yox.

(Xətai)

Bu söz insan, adam sözlərinin meydana çıxması ilə əlaqədar olaraq öz mənasından uzaqlaşmış, onun əvvəlki mənası arxaikləşmişdir. Hazırda bu söz əsasən cins mənasında işlədilir. Beləcə də ər sözü qədimdə kişi mənasını bildirmiş, sonradan ailə üzvü mənasında işlədilmişdir.

Deməli, semantik arxaizmin leksik arxaizmdən əsas fərqlərindən biri odur ki, semantik arxaizmə uğramış söz başqa mənada yenə də dilin lüğət tərkibində işlənir. Lakin leksik arxaizm istifadədən düşür.

Köhnəlmiş sözlər xüsusi üslubi imkanlara malikdir. Bunlardan həm tarixə aid elmi əsərlərdə, həm də bədii yaradıcılıqda istifadə edilir. Köhnəlmiş sözlər müasir Azərbaycan ədəbi dilində başlıca olaraq aşağıdakı üslubi məqsədlər üçün istifadə edilir.

1)Təsvir və tədqiq olunan dövrün tarixi xüsusiyyətlərinin real əks etdirmək üçün. Elmi üslubda – tarixə aid əsərlərdə tarixizm və arxaizmlər keçmiş hadisə və anlayışların dəqiq və olduğu kimi ifadə edilməsinə xidmət edir. Lakin bədii üslubda-bədii əsərlərin dilimdə isə daha çox bədii vəzifə daşıyır.

Bədii yaradıcılıqda tarixi mövzular işlənərkən bunlardan zəruri ifadə və təsvir vasitəsi kimi istifadə olunur; məsələn: Bahar bir müddət rəncbərə nökərçilik etdi. Onu gah xırman sürməkdə, gah da cütə minməkdə işlədirdilər. Töylə səkisində Bahara yer vermişdilər. O, gecəni 3-4 saat burada şirin yuxuya gedərdi. Gizildəyən dizlərini bükər, arxalığını üstünə çəkər, axur süpürgəsini başı altına qoyub yatardı. Göründüyü kimi yazıçı bu parçada təsvir etdiyi dövrün ictimai bərabərsizliyini, kənd təsər-rüfatının və mədəniyyətin zəifliyini ifadə etməkdə rəncbər, nökərçilik, cüt və arxalıq sözlərindən istifadə etmişdir. Demək, bədii əsərdə köhnəlmiş sözlərdən istifadə etmək ehtiyacı əsərin tələblərindən irəli gəlir.

2)Nitqdə istehza kinayə, məsxərə, zarafat çalarlığı yaratmaq üçün. Köhnəlmiş sözlər satira və yumor üçün müvafiq vasitələrdəndir. Bunların vasitəsi ilə nitqdə kinayə və istehza, məsxərə və zarafat çalarlığı daha aydın ifadə oluna bilir; məsələn:

Sən ağa, mən ağa
İnəkləri kim sağa.

Bu misradakı ağa sözü vasitəsi ilə bütün ifadələrin məzmununa kinayə, istehza tonu verilmişdir.

3)Nitqdə təntənə çalarlığı yaratmaq üçün. Bədii üslubda təntənəli nitq yaratmaqda da köhnəlmiş sözlər xüsusi rola malikdir; məsələn:

Dostun dar günündə dost üz çevirməz,
Ey könül! Bir quş ol, ellər dolan, gəz.
De ki: yağılardan öc almayınca,
Qisas qılıncımız qınına girməz!

Bu misradakı öc sözü qisas mənasını bildirir, şeirə bədii zərurət əsasında gətirilmişdir.Təntənə çalarlığı üçün köhnəlmiş sözlərdən ən çox nəzm əsərlərində istifadə olunur.

## NEOLOGIZMLƏR

Dildə təzəcə yaranan, yaxud da dilə yenicə daxil olan sözlərə neologizmlər deyilir. Neologizm-iki yunan sözündən, yəni neos və logos sözlərindən əmələ gəlmişdir. Neologizm hadisəsi arxaizmin tam əksini təşkil edir.

Dilin lüğət tərkibinə müxtəlif dövrlərdən başlayaraq daxil olan yeni sözlər həmişə neologizm olaraq qalmır. Bunlar zaman keçdikcə işlənmə məqamından, nə vaxt meydana çıxmasından, anlaşılma dərəcəsindən asılı olaraq get-gedə dəyişilir. Buna görə də *yeni söz*, *təzə* söz anlayışları nisbi və şərti götürülərək dövrlərlə əlaqədar olan hadisə kimi başa düşülür. Dilin lüğət tərkibinin passiv hissəsinə keçən bu və ya başqa bir söz təşəkkül tapdığı dövr üçün neologizm, özündən sonrakı dövr üçün isə neologizm kateqoriyasından çıxıb lüğət tərkibinin fəal hissəsinə keçərək işlək sözlərə çevrilə bilir. Məsələn, Azərbaycanda Sovet hakimiyyəti qurulduqdan sonra ilk dövrlərdə *kolxoz, traktor, komsomol, pioner, maqazin, muzey, vaqon, telefon, kino, avtomobil, aqronom, mexanik, ton, rayon, raykom, əməkgünü, zərbəçi* və s. kimi sözlər dilimiz üçün neologizm hesab edilirdi. Lakin hal-hazırda bunlar demək olar ki, neologizm deyildir. Çünki bu sözlər dilimizin lüğət tərkibinin fəal hissəsinə keçmişdir, orada özünə müəyyən mövqe tutaraq digər işlək sözlərdən fərqlənmir. Eyni zamanda bunlar danışıq prosesində ciddi üslubi rəngarəngliyə malik olan təzə söz kimi də təsəvvür edilmir.

Bütün bu qeyd olunan xüsusiyyətlərə əsasən, demək olar ki, dildə yeni sözün neologizm hesab edilməsinin əsas meyarı onun daxil olduğu dövrdəki işlək sözlərdən fərqlənməsi, təzəlik əlamətlərini saxlaması yenilik çalarlılığını əks etdirən üslubi keyfiyyətini mühafizə etməsidir.

Müasir Azərbaycan dilində yenilik ruhunu mühafizə edən kibernetika, kosmodrom və s. kimi sözlər yuxarıda deyilən digər cəhətlərə görə də ümumişlək sözlərdən fərqləndiyi üçün hal-hazırda əsl neologizmlər hesab edilir.

*Neologizmlərin əmələ gəlməsi.* Neologizmlər istehsalatın, elmin, mədəniyyətin, inkişafı üçün əlaqədar olaraq yeni yaranmış anlayış, hadisə və keyfiyyətləri bildirmək üçün əmələ gəlir. Neologizmlərin yaranmasında elmin rolu xüsusilə böyükdür.

Müxtəlif sahələrə dair zəngin neologizmlərin əmələ gəlməsi sosializm cəmiyyəti üçün daha xarakterik olan hadisədir. Çünki sosializm əlamətdar hadisələr, böyük kəşflər dövrüdür. Burada

yaranan bütün yeniliklər, bütün ixtiralar isə söz vasitəs ilə öz əksini dildə tapır. Elə buna görə də, müasir dövrdə də Azərbaycan ədəbi dilinin lüğət tərkibinə müxtəlif sahələrə dair yüzlərlə neologizm daxil olmuşdur. Bu neologizmlər iki mənbədən-birinci, öz dilimizin daxili imkanları əsasında (azadlıq, yeddiillik, solçuluq, bərabərlik və s.) ikincisi, başqa dillərdən söz almaq əsasında (sosializm, marşal, kapitan, direktor və s.) yaranmışdır.

*Neologizmlərin tipləri.* Neologizmlərin əmələgəlmə mənbələri müxtəlif olduğu kimi, əmələgəlmə səbəb və məqsədləri də müxtəlifdir. Bunlardan bəziləri yeni anlayış və hadisələri adlandırmaq üçün yaranır, bəziləri isə üslubi məqsəd üçün əmələ gəlir. Buna görə də, neologizmlər iki yerə bölünür: ümumi neologizmlər, fərdi-üslubi neologizmlər.

*Ümumi neologizmlər.* Müəyyən tələbata müvafiq olaraq ümumxalq dilində meydana çıxan neologizmlər *ümumi neologizmlər* adlanır. Məsələn, marksizm, kommunist, təyyarəçi, radio, televizor, kino, teatr, sülhsevər, aktyor, arxiv, aptek, bayraqdar, bayramqabağı, balet, opera, respublika, qənaətləndirici, kollektivçilik, demokratikləşdirmə, elektrikləşmə və s. Dilimizin lüğət tərkibinə tarixən külli miqdarda bu qəbildən olan neologizmlər daxil olmuşdur.

*Fərdi-üslubi neologizmlər.* Şair və yazıçıların, alim və mətbuat işçilərinin müəyyən məqsədlərlə əlaqədar yaratdıqları neologizmlər *fərdi-üslubi neologizmlər* adlanır. Bu qrup neologizmlər iki cür olur; birincisi, müstəqil neologizmlər, ikincisi, kontekst neologizmləri. Bu ikinci forma neologizmlər sırf bədii sənətkarlıqla bağlıdır.

Şair və yazıçıların üslubunun söz yaradıcılığı cəhəti ilə bağlı olaraq yaranan sözlərin bəziləri ümumi neologizmlər sırasına daxil olur, bəziləri isə belə bir əlamət və keyfiyyyət kəsb edə bilmir. Məsələn,

*Qərbi sarmışdı dumanlar, sislər,*
*Acılar duydu içindən Azər.*
*Özləyib Şərqi, həmən çıxdı yola,*
*Bəlkə bir düşgünə yardımcı ola.*

Bu misradakı özləmək şairin fərdi üslubu ilə bağlı sözdür. Ümumiləşmədiyi üçün ədəbi dilin fəal tərkibinə keçə bilməmişdir.

*Neologizmlərin növləri.* Azərbaycan ədəbi dilinin lüğət tərkibində mövcud olan neologizmlər məna və formalarına görə müxtəlif şəkillidir. Bunlar təxminən üç növə bölünür.

1)*Leksik-semantik neologizmlər.* Dildə həm məna, həm də forması yeni olan neologizmlər *leksik-semantik neologizmlər* adlanır; məsələn, artel, proletar, diktatura, feodalizm, kommunizm və s.

2)*Leksik neologizmlər.* Ancaq formaca yeni olan neologizmlər *leksik neologizmlər* adlanır. Məsələn: şura (hökumət) – sovet (hökuməti), darülfünun – universitet və s.

Bu misallardakı sovet və universitet sözləri dilimizdə sonradan meydana çıxmışdır.

3)*Semantik neologizmlər.* Yalnız mənası təzə olan neologizmlər *semantik neologizmlər* adlanır. Məsələn: müqəddəs, yoldaş və s.

Bunlardan müqəddəs sözü keçmişdə dini anlayışla bağlı olaraq toxunulmaz mənasını ifadə edirdi; hazırda isə hər şeydən üstün, əziz mənasında (müqəddəs ana, müqəddəs vətən) işlənilir. Həmçinin *yoldaş* sözü əvvəllər birgə səfərə çıxan, yol gedən mənasını bildirdiyi halda, indi həyat yoldaşı, həmfikir və s. mənaları ifadə edir.

Azərbaycan dilində neologizmlərin birinci tipinə-leksik semantik neologizmlərə aid sözlər daha çoxdur.

*Lüğəvi neologizmlərin taleyi.* Dildə meydana çıxan neologizmlər bütün fəaliyyətləri boyu neologizm olaraq qala bilmədikləri üçün iki istiqamətdə dəyişilir:

a)bunların bir qrupu dilin lüğət tərkibinin fəal hissəsinə keçərək ümumişlək xarakter alır. Müxtəlif dövrlərdə əmələ gəlmiş və yarandığı dövrlərdə neologizm kimi tanınan həmin sözlərin əksəriyyəti bu yolu keçmişdir.

b)neologizmlərin digər qrupu az müddətdən sonra köhnəlir, arxaikləşir. Bunlardan bəziləri əvvəl dilin lüğət tərkibinin fəal hissəsinə keçir, sonradan köhnəlir. Bəziləri isə passiv lüğətdə olduğu zamandan arxaikləşir.

## TERMINLƏR

Dilin lüğət tərkibini təşkil edən söz və ifadələr öz təbiətlərinə görə eyni xarakterə malik deyildir. Belə ki, bəzi sözlər xüsusiləşmiş məna kəsb edərək, xüsusi sahələrlə əlaqədar müəyyən anlayışı bildirirsə (sait, samit, isim, fel və s.), bəzi sözlər isə kainat və məişətə aid əşya adını, yaxud da insanın və digər canlıların bu və ya başqa cəhətinə məxsus əlamət, keyfiyyət, hal, hərəkət və sairi (gözəl, yaxşı, görmək, baxmaq, bilmək və s.) bildirərək işlənir. Bu cəhətdən sözlər ümumi şəkildə iki cür qruplaşdırılır: adi sözlər və terminlər.

Adi sözlər nəyə deyilir? Dilimizdəki ot, su, adam, torpaq, sarı, yaşıl, boz, beş, on, iyirmi, mən, sən, gəlmək, getmək, söyləmək, baxmaq və s. adi sözlərdir.

Adi sözlərin hamısı nitq prosesində ancaq adi söz kimi qalmır. Bunlardan bəzisi dildə həm adi söz, həm də termin şəklində işlənir. Məsələn:

| Adi söz kimi | Termin | |
|---|---|---|
| Sifət | Sifət | dilçilik termini |
| Quruluş | Quruluş | fəlsəfə termini |
| İz | İz | geologiya termini |
| Turşu | Turşu | kimya termini |

Bu cəhəti nəzərə almaqla sözləri, daha konkret olaraq üç yerə bölmək olar:

a)ancaq adi söz: danışmaq, gülmək, yerimək və s.
b)həm adi söz, həm də termin: səs, say, dil və s.

c)yalnız termin: fonetika, orfoepiya, qrafika və s. olan sözlər qrupuna da bölmək olar.

Bəs termin nədir? Bu suala təxminən belə cavab vermək olar: termin-elm, texnika, siyasət və mədəniyyətə aid xüsusiləşmiş mənalı söz və ifadələrdir.

Terminlərə aid aşağıdakı söz və ifadələri misal göstərmək olar:

*Dilşünaslığa dair terminlər:* abzas, arqo, arxaizm, tabelik, səba, ikihecalı, dialekt, idiom, inversiya, birləşmə, intonasiya, təsnif, monoftonq, diftonq, qoşma, turizm, semasioloq, sintaksis, uzlaşma, tire, frazeologiya, etimoloq, nitq hissəsi, sözdüzəldici şəkilçi və s.

*Ədəbiyyatşünaslığa dair terminlər*: antiteza, ballada, variant, dialoq, disput, dram, dramaturgiya, janr, klassik, kuplet, lirika, lirik, monoloq, novella, oçerk, pafos, povest, portret, poema, proloq, pyes, replika, roman, simvol, sujet, tin, traktat, folklor, şarj, epizod, epopeya və s.

*Pedaqogika və psixologiyaya dair terminlər:* abituriyent, attestasiya, ikiilci, dalmanizm, dekan, didaktika, direktor, dis-sertasiya, dominant, dosent, instinkt, inteqrasiya, laborant, metod, metodika, metodist, pedaqogika, professor, dərs ili, ali məktəb, əmək tərbiyəsi, giriş müsahibəsi, körpələr evi və s.

Müasir dilimizdə bütün elm sahələrinə aid bu kimi çoxlu miqdarda termin vardır.

Hər bir elmi termin elmi anlayışı əks etdirir. Elmi anlayışları bildirən bütün terminlər aid olduğu elmin yaranmasında, formalaşması və inkişaf etdirilməsində xüsusi əhəmiyyətə malikdir. Elə buna görə də terminlərə elmi münasibət bəsləməmək, onları qarışdırmaq kimi hallar elmin tərəqqisinə mənfi təsir göstərir.

Terminlər quruluşlarına görə iki cür olur:

*1)Bir sözdən ibarət terminlər.* Məsələn: fonem, cümlə, zərf, tamamlıq, təyin, sintaksis, qrammatika, üslub, fənn, dekanlıq, dahilik, fərziyyə, intizam, məşğələ, əzbərçilik, yayılma, həqiqilik, hafizə, irsiyyət, təkrar, məşq, ədəb və s.

*2)Bir neçə sözdən ibarət terminlər*. Məsələn:ahəng qanunu, budaq cümlə, vasitəli nitq, ismin halları, dilin lüğət tərkibi, sözün məna quruluşu, dərs planı, uşaq bağçası, evristik müsahibə, məhsuldar təxəyyül, əxlaqi tərbiyə, kamal attestatı, təbii əyanilik, psixi fəaliyyət, təbii nəticələr üsulu, hissələrin qeyri-sabitliyi və s.

Terminlər, adətən, təkmənalı (monosemantik) olur və hər hansı bir məfhumu dəqiq ifadə edir. Buna görə də terminlər işləndiyi mətndən, əhatə edildiyi sözlərdən və sairdən asılı olmayaraq, hər yerdə eyni mənada başa düşülür. Məsələn;

Əlindədir səadətlər sarayının açarı,
Baharına çata bilməz min illərin baharı,
(Süleyman Rüstəm)

Onun tunc vəhdətini
Saxladıq şərəflə biz
Məhv edir düşmənlərin

min qara niyyətini,
Qoruduq proletariatın
biz hakimiyyətin.

(Rəsul Rza)

Üzünün buğlanan tərini sildi...
Kəskin nəzərləri bizə dikildi:
Ey əməkçi dostlar! El qabağında
Biabır oluruq... Bir qulaq asın,
Olarmı maşınlar boş bekar qalsın
İşin gücün belə qızğın çağında?
Axşamlar yığışıb öyrənirdiniz-
Sürə bilərsiniz traktoru siz.

(Osman Sarıvəlli)

Göründüyü kimi, bu şeir parçalarındakı kommunist, partiya, proletariat, komsomolçu, maşın, traktor sözləri şifahi danışıqda, siyasətdə hansı mənada işlənirsə, bədii üslubda yazılmış əsərlərdə də həmin mənadadır.

Terminlər işlənmə dairəsinə görə iki yerə bölünür:

*a)Ümumişlək terminlər*; sovet, kolxoz, sovxoz, kommunizm, partiya, komsomol, pioner və s.

*b)Xüsusi terminlər*. Məsələn: semantika, fonologiya, tembr, akustika...

Terminlər emosional və obrazlılıq cəhətə malik deyildir. Eyni zamanda bu qrup sözlərdə nəvazişlik çalarlığı da olmur. Məsələn:

Odur... odur... Qəhrəmanım toz içində nəfəs alır,
Ekskavator boz dağlara haray çəkir, nərə salır...

Yaxud:

Ekskavator tənələri lay-lay açıb, lay-lay qazır,
Qoca alim saxsı yığıb yer altında tariz yazır...

(Səməd Vurğun)

Bu misallardakı ekskavator sözü öz mənasında işlənilərək maşının bir növünün adını bildirir və bundan əlavə heç bir emosionallıq və sair xüsusiyyətə malik deyildir.

Lakin terminlər ədəbi dilin bədii üslubundan başqa digər üslubları üçün, xüsusən elmi üslub üçün xarakterik dil vahidləridir. Ümumiyyətlə, terminlər elmi üslubu şərtləndirən ən başlıca ünsürlərdir. Bunlarsız elmi üslub təsəvvür edilə bilməz.

Termin necə yaranır? Bu suala ətraflı cavab vermək üçün hər şeydən əvvəl qeyd edilməlidir ki, dildəki terminlərin hər biri müəyyən tələbat əsasında əmələ gəlir. Zərurət olmadan, özbaşına heç bir termin yaranmır.

Termin yaradıcılığında iki mənbədən istifadə olunur. Bunlaradan birinci və başlıcası dilin öz daxili imkanları, ikincisi isə başqa dillərin vasitələridir. Hazırda termin tətbiqi işində, başqa dillərdən ən çox rus və Avropa dillərinə müraciət edilir.

Yuxarıda göstərilən hər iki mənbə əsasında termin yaradıcılığının bir neçə prinsipi vardır. Termin tərtib edilərkən dilimizin öz xüsusiyyətləri nəzərə alınmır, onun qayda və qanunlarına əsaslanırlar.

Termin yaradıcılığında aşağıda qeyd olunan üç əlamət hökmən diqqət mərkəzində durmalıdır:

*1)Terminin təkmənalılığı.* Təkmənalılıq termin üçün ən başlıca əlamətlərdən biridir. Termin çoxmənalı olduqda onun elmi əhəmiyyəti nisbətən azalır, çünki çoxmənalı terminlər elmi anlayışların aydın əks olunmasına lazımi imkan yaratmır.

Dilimizdəki terminlərin, o cümlədən dilçiliyə dair terminlərin bəziləri çoxmənalıdır. Məsələn, frazeologiya termini iki mənada – birincisi, dildə olan ifadə və ibarələrin məcmusu (frazeoloji tərkib), ikincisi isə frazeoloji tərkib haqqında elm mənasında işlənilir. Eləcə də ifadə və ibarə terminləri dilçilik ədəbiyyatında ayrı-ayrı dilçilər tərəfindən çox müxtəlif mənada işlədilir. Bəzi dilçilər ifadə termini altında iki və daha artıq sözdən ibarət olan hər cür birləşmələri nəzərdə tutur, bəzi dilçilər isə, əksinə, həmin mənada ibarə terminindən istifadə edir və s.

Dilimizdə bu kimi çoxmənalı terminlər bəzən anlaşılmazlıq və dolaşıqlıq yaradır. Lakin bu, keçici xarakter daşıyan haldır; gec-tez belə terminlərin dəqiqləşdiriləcəyinə şübhə etmək olmaz.

2)Terminin az komponentliyi. Terminlərin az komponentli olması da onun yaxşı əlamətlərindəndir. Məlumdur ki, müəyyən anlayış bir sözlə əks olunanda onu mənimsəmək, yadda saxlamaq və ondan istifadə etmək də asan olur: məsələn, nida, neologizm, həmcins, xitab, sadalama, lüğət, filoloq, dodaqlanma, məsdər, tarixizm, şəkilçi, əlifba və s.

Termin tətbiqində bu və ya digər anlayışın, imkan daxilində, bir sözlə əks etdirilməsi vacibdir.

3)Terminin sinonimsizliyi. Terminlərin əsas əlamətlərindən biri də onların sinonimlərinin olmaması ilə əlaqədardır. Bu əlamətə əsasən dildə hər bir anlayış ancaq bir terminlə əks olunmalıdır. Bir anlayışa dair bir neçə terminin, yəni terminoloji dubletlərin olması elmi anlayışların mənimsənilməsini müəyyən dərəcədə çətinləşdirir.

Müasir dilimizdə bir anlayışın müxtəlif terminlərlə ifadə edilməsi halları vardır; məsələn: Lüğətçi – leksikoqraf, lüğətçilik – leksikoqrafiya, lüğətşünas – leksikoloq, lüğətşünaslıq – leksikologiya, mənaşünaslıq – semasilogiya, mənşəşünaslıq – etimologiya, fəal – aktiv və s.

Geniş şəkildə müvazi işlənən bu terminlərin və həmin qəbildən olan digər terminlərin birini müəyyənləşdirib istifadə etmək, şübhəsiz ki, daha məqsədə müvafiq hesab edilməlidir.

Hər bir elm sahəsinə aid terminlər sistem təşkil edir. Lakin bu sistem həmişə stabil olaraq qalmır, müəyyən dövrlər ərzində onda bəzi dəyişikliklər etmək dürüstləşdirilmə, dəqiqləşdirilmə aparmaq ehtiyacı doğrudur ki, bunun da nəticəsində terminlər sistemi daha da təkmilləşir.

Terminlər sistemindəki dəyişiklik bir neçə səbəbdən baş verə bilir. Həmin səbəblərdən ən başlıcaları bunlardır:

*a)*Terminin ifadə etdiyi anlayışın xarakterinin, yaxud həmçinin dəyişilməsi əsasında.

*b)*Terminin aid olduğu elmin inkişaf etməsi nəticəsində.

Bu səbəblərə görə terminlər sistemindəki bir sıra termin tamamilə köhnələ bilir. Azərbaycan dilçiliyində vaxtilə işlənən bəzi terminlərin köhnələrək yeni terminlərlə əvəz olunmasını buna misal göstərmək olar:

| Köhnəlmiş terminlər | Yeni terminlər |
|---|---|
| Sövtiyyat | fonetika |
| Sərf | morfologiya |
| Nəhv | sintaksis |
| Sərf-nəhv | qrammatika |
| İzafət | yiyəlik hal |
| Məfulu ileyh | yönlük hal |
| Məfulu beh | təsirlik hal |
| Məfulu fih | yerlik hal |
| Məfulu ənh | çıxışlıq hal |
| Zəmir | əvəzlik |

Nəhayət, yeri gəlmişkən qeyd etməliyik ki, vaxtı ilə terminin düzgün tərtib edilməməsi və ya ayrı-ayrı müəlliflərin bu və ya digər terminlə razılaşmaması əsasında mövcud terminlərdə müəyyən dəyişikliklər baş verir. Məsələn, dildə *heca yazısı* əvəzinə hecayi yazı, *səs yazısı* əvəzinə səsli yazı terminləri də işlənilir. Belə hal bəzən ümumiləşərək nəticədə terminlərin qoşalaşmasına səbəb olur, yaxud da məntiqsizliyə gətirib çıxarır ki, bu da elmdə xoşagəlməz bir vəziyyət yaradır.

<u>Dialektizmlər</u>

Dildə dialektizm də çox geniş anlayışdır. Dialektizm, əsasən qeyri – ədəbi dil ünsürləri hesab edilən söz, ifadə, səs xüsusiyyəti və qrammatik formalarıdır. Adətən, dialektizmlər ədəbi zəmin əsasında qurulmuş nitqdə yaxud bu və ya digər bədii əsərin dilində nəzərə çarpa bilir.

Dialektizmlərdə şivə və ləhcələrin müxtəlif xüsusiyyətləri, yəni həm səslərə, həm sözlərə, həm də qrammatik quruluşa aid xüsusiyyətlər əks olunduğu üçün bunların aşağıdakı növləri vardır: a) fonetik dialektizmlər, b) qrammatik dilaektizmlər, c) lüğəvi dialektizmlər

*Fonetik dialektizmlərdə* bu və ya başqa şivənin ədəbi dildən fərqli olan müəyyən fonetik xüsusiyyəti əks etdirilir; məsələn:

Dahilər yaradan ey böyük ana,
Şerimin hər sözü alqışdır sana!
(S.Vurğun)

Burada sənə əvəzinə sana işlənmişdir. Belə bir vəziyyət, yəni şəxs əvəzliklərindən II şəxsin təki yönlük halda işlənərkən qərb qrupu dialekt və şivələrində sana formasında tələffüz edilir.

*Qrammatik dialektizmlərdə* ayrı-ayrı dialekt və şivəyə məxsus olan morfoloji və sintaktik xüsusiyyət ifadə edilir. Belə bir cəhət M.İbrahimovun "Kəndçi qızı" adlı əsərindəki bəzi surətlərin dilində aydın müşahidə olunur.

*Lüğəvi dialektizmlərdə* isə müxtəlif şivəyə aid olan lüğəvi dialekt xüsusiyyətləri əks olunur. Buna görə də bu və ya başqa dialekt və şivəyə məxsus olub, ədəbi dildə işlənmiş sözlərə, ifadələrə lüğəvi dialektizm deyilir.

Ədəbi dildə dialektizm kimi tanınan vahidlərin çoxu elə dialektizm olaraq qalır, bəziləri isə dialektizm çərçivəsindən kənara çıxa bilir; məsələn:

Ulduzlar sayrışır mavi göylərdə,

İnsanlar çalışır, yaradır yerdə

(S.Vurğun)

Misaldakı sayrışmaq sözü öz tarixinə görə lüğəvi dialektizmdir. Şair tərəfindən işlənilmiş bu söz hazırda ədəbi hüquq qazanaraq ədəbi dilin lüğət tərkibinə daxil olmuşdur.

Lüğəvi dialektizmlər xarakterlərinə görə, əsasən dörd cür olur: leksik, leksik – semantik, semantik və frazeoloji dialektizmlər.

Leksik dialektizmlər. Ədəbi dildə qarşılığı olan dialektizmlər leksik dialektizm adlanır; məsələn: *qəlbi* (uca), *becit* (tez) və sair.

Bu qrup dialektizmlərə dilçilik ədəbiyyatında xüsusi dialektizmlər də deyilir. Lakin, əslində bunlar sinonim dialektizmlərdir. Ona görə ki, bu cür dialektizmlərin ifadə etdiyi mənaların özünəməxsus ədəbi şəkildə ifadə forması – yəni sözü olur. Bu dialektizmlər isə öz dialekt çalarlığını saxlayaraq həmin sözlə qoşalaşır və beləliklə də, sinonimik vahidlər meydana çıxır. Əgər bu qrup dialektizmlərin ədəbi dildə dialekt çalarlığı nəzərə alınmasa, onlar sadəcə dublet dialektizm olar.

*Leksik – semantik dialektizmlər*. Müəyyən ərazidə, yaxud ərazilərdə yaşayan kütlə üçün xarakterik məfhumu bildirən sözlər leksik – semantik dialektizmdir. Bu cür dialektizmlərdə müəyyən ərazi ilə bağlı geyim adları, hadisə, əşya və sair adlarını misal göstərmək olar. Məsələn, *dələmə* sözünə fikir verək. Bu dialektizm Tovuz, Qazax, Borçalı, Zəngilan ərazisində pendir hazırlamaq üçün südün maya tutmuş formasına deyilir.

Belə dialektizmlər, eyni zamanda etnoqrafik dialektizm də adlanır. Bu, etnoqrafik adlanır ona görə ki, müəyyən yerlə, müəyyən qrup insanın işi, fəaliyyəti və sair ilə bağlıdır.

Deməli, etnoqrafik dialektizmlərdə həm məfhum, həm də onu ifadə edən söz dialektə aid olur.

*Semantik dialektizmlər*. Ədəbi dildə olan bu və ya digər bir sözün dialektdə başqa mənada işlənməsi nəticəsində semantik dialektizm əmələ gəlir. Məsələn, ədəbi dilimizdə işlənən qara sözü ağ sözünün əksinə olan mənanı bildirir. Lakin həmin səs kompleksi dialekt və şivələrimizdə mürəkkəb, ey, yazı, on iki dərz və sair mənalarda işlənir. Bu mənaların heç biri ədəbi dil üçün səciyyəvi deyildir. Məhz elə buna görə də bunlar semantik dialektizmlərdir. Ədəbi dilə məxsus olmayan sabit ifadə və ibarələr isə frazeoloji dialektizm adlanır. Bunlardan da bədii əsərlərdə geniş istifadə olunur.

Hazırda Azərbaycan ədəbi dilindən fərqli olaraq, dialekt və şivələrdə çoxlu miqdarda səciyyəvi sözlər vardır; məsələn: cələfsiz (arıq), zağar (qısa boy), salaxana (avara), ətmək (əppək, çörək), taytamaq (axsamaq), cöyüz (qoz), zərdə (yerkökü), tüpü (qar boranı), şoqqax (qırıq, sınıq); cinqoy (əsəbi) və s.

Dialekt sözləri bədii üslub üçün yararlı ifadə və təsvir vasitələrindən sayılır. Buna baxmayaraq bədii əsərin dilinə hər cür dialekt sözünü gətirmək olmaz. Bədii ədəbiyyatda həmin sözlərdən başlıca olaraq, *yerli kolorit yaratmaq, surətin nitqini fərdiləşdirmək, hadisəni real əks etdirmək üçün istifadə olu*nur.

Bu məqsədlər üçün bədii əsərin dilində dialektizmlərin işlədilməsi yazıçıdan olduqca böyük sənətkarlıq tələb edir. Çünki həddindən artıq dialekt sözü işlətdikdə yazıçının dili qəlizləşir və anlaşılmazlıq yaradır; bu isə əsərin bədii effektini azaldır, onun təsir gücünü zəiflədir.

Azərbaycan dilinin zəngin dialekt və şivələri, demək olar ki, bütün dövrlərdə söz sənətkarlarının nəzər – diqqətini cəlb etmişdir. Klassik şair və yazıçılarımız bu vasitələrdən geniş istifadə etmişlər.

Dildə ifadə etdiyi mənasına görə nisbətən *elvarı*, *saya* xarakterli olan söz qrupu da vardır ki, bunlar loru sözlər adlanır; məsələn:

Nə deyim, Hacı Cəlalın pulu məndə olaydı, görərdin lələşin nə lələşdir.

(Ə.Haqverdiyev)

...Vəqta ki, danışdız, vüzəra oldu xəbərdar,
Mütləq gö rəcəklər ki, cibişdana zərər var.

(M.Ə.Sabir)

Misallardakı lələş, cibişdana *loru* sözlərdir. Dilizdəki ləlimək (yalvarmaq), qanmaq (anlamaq), dartmaq (çəkmək), yollamaq (göndərmək), baldır (qıç) və s. kimi sözlər də saya, yəni loru xarakterlidir.

Loru sözlər, çox güman ki, öz yerlilik xüsusiyyətlərini get-gedə itirmiş olan dialekt ünsürləridir. Bunu keçid xarakterli bəzi sözlərdə görmək olur; məsələn:

Yaşıl otlar öpər dəqiqədə bir,
Pənbə tombul lətif ayaqlarını,
Axışıb ən kiçik sular xəndan,
Ninni söylər o şux üçün hər an

(H.Cavid)

Bu misaldakı *tombul* və *ninni* sözləri artıq məhdud dairədə mənimsənilmə çərçivəsindən çıxıb bir çox dialekt və şivələrdə eyni mənada işlənməkdədir.

Loru sözlə dialekt sözü arasındakı əsas fərq ondan ibarətdir ki, birinci qrup sözləri, yəni loru sözləri hamı başa düşür, leksik dialektizmlər isə ancaq müəyyən qrup yerli əhali tərəfindən işlədilir.

Loru sözlərdən də bədii əsərlərin dilində hadisəni real və canlı təsvir etmək, surət nitqini fərdiləşdirmək və s. məqsədlər üçün istifadə olunur.

VULQAR SÖZLƏR

Kobud və qeyri-adi sözlər vulqarizm, yaxud vulqar sözlər adlanır: məsələn: veyllənmək (gəzmək əvəzinə), goplamaq (danışmaq əvəzinə), kaftar, donquldanmaq, dəmdəmə, səksəkə və s.

Vulqar sözlər öz mənalarına görə iki qrupa bölünür: kobud sözlər, söyüş xarakterli sözlər:

a)Kobud sözlər. Bu qrup sözlər anlayışın az və ya çox dərəcədə kobud şəkildə ifadə olunmasına xidmət edir. Məsələn, yemək əvəzinə tıxmaq, gumbuldatmaq, çoxdanışan əvəzinə heyvərə sözləri işlədildikdə məna kobud ifadə edilmiş olur. Eyni zamanda bunların vasitəsi ilə haqqında danışılan əşya və ya şəxsə müraciət olunan şəxsə mənfi münasibət bəsləndiyi bildirilir: məsələn;

İndi, ey heyvərə, varınsa hünər,
Söylə, təbirini bilirsən əgər ?!

(S.Vurğun)

Misaldakı heyvərə sözü ilə müraciət olunan şəxsə qarşı təhqiramiz məna, mənfi münasibət ifadə edilmişdir.

b)Söyüş xarakterli sözlər. Vulqarizmlərdən bu qrup sözlərin ifadə etdikləri mənada söyüş çalarlığı mövcud olur; məsələn:

Görsən tanımazsan yarımsaqqalı,
Çıxıb əndazədən dövləti, malı.
Xandəmirov çaldı, çapdı mahalı,
O, ki var tutub özün keçəl qurumsaq.

(Q.Zakir)

İtil, cəhənnəm ol, nadürüst! Mən səni tanıyıram, sən nə yuvanın quşusan.

(A.Səhhət).

Gəl bundan sonra nanəcibə yaxşılıq elə. Çörəyini belə adama yedirincə, itə tullasan bundan min dəfə yaxşıdır

(Ə.Haqverdiyev)

Bu misallardakı qurumsaq, nadürüst, nanəcib sözləri öz mənalarına görə söyüş xarakterli vulqarizmlərdir.

Bədii əsərlərdə vulqar sözlərin əsas üslubi vəzifələri surətin nitqini fərdiləşdirməyə, onun daxili aləmini açmağa, mədəni keyfiyyətini müəyyənləşdirməyə kömək etməkdən ibarətdir. Bu qrup sözlər də bədii üslubda müəyyən bədii zərurət və tələb əsasında işlənilir.

Bədii əsərlərin dilinə hər cür vulqar sözü gətirmək olmur. Çünki vulqarizmlər ehtiyatla işlənilmədikdə əsərin bədii keyfiyyətinə təsir edir, onu zəiflədir. Ədəbi janrlardan, xüsusən dramatik əsərlərin dilində vulqar sözlərin işlənilməsi müsbət hadisə deyildir. Belə ki, dram əsərləri kütləvi tamaşa əsəri olduğundan, hətta aktyorun ifadə edə bildiyi vulqar sözlər belə tamaşaçıya pis təsir göstərir.

## Sözün həqiqi və məcazi mənası.

Dəmir qapı birləşməsində dəmir sözü qapmın materialının dəmirdən olduğunu ifadə edir. Dəmir yumruq birləşməsində isə dəmir sözü «möhkəm», «güclü» mənalarını bildirir. Gördüyümüz kimi, dəmir metaldır, qapı dəmirdən hazırlanır, yumruğun isə metalla heç bir əlaqəsi yoxdur. Deməli, ilk baxışda dəmir sözünün göstərilən mənaları bir-birindən çox uzaqdır. Lakin dəmirdən hazırlanan hər bir əşya çox möhkəm, davamlı olduğu üçün, söz birləşməsində dəmir sözü məhz bu mənada, yəni möhkəm, dözümlü, davamlı mənalarında işlədilir. Demək, dəmir sözünün həqiqi mənası ilə yanaşı, məcazi mənası da var. Sözlər tarixi inkişaf prosesində bəzən həqiqi mənasmdan başqa, yeni törəmə məna da ifadə edir. Sözün həqiqi mənasma dominant məna, yəni ilkin məna deyilin Qazandığı yeni, törəmə məna isə məcazi məna adlanır. Sözün məcazi mənası çox zaman insanlara məxsus müəyyən hərəkətləri cansız əşyalara aid etmək nəticəsində meydana çıxır. Məs.: Təbiət oyandı. Günəş dağların arxasında gizləndi. Bu cümlələrdə oyanmaq, gizlənmək felləri insanlara məxsus hərəkəti bildirir.

Bənzətmə vasitəsi kimi də bədii əsərlərdə sözün məcazi mənalarından geniş istifadə olunur. Məs.: coşqun dəniz - insan dənizi; çiy ət - çiy söz; uşağın yuxusu - təbiətin yuxusu; gözəl mənzərə - gözəl fikir; dumanlı dağ - dumanlı fikir; ağır yük - ağır xasiyyət.

1)Bütün əsas nitq hissələrinə aid sözlərin həqiqi mənası olur.

2)Bütün sözlər məcazi məna malik olmur.

3)Məcazi məna, əsasən, bədii üslubda işlədilir.

4)Sözün məcazi mənasının olması onun çoxmənalı olması deməkdir.

5)Bütün frazeoloji birləşmələrdəki sözlər məcazi mənada olur, amma bütün məcazi mənada olan sözlər frazeoloji birləşmə deyil: Külək yatdı. Gözlə görünə bilməyən hərəkəti ifadə edən fellər heç vaxt məcazilik qazana bilmir: düşünmək, sevmək, xəyala dalmaq və s.

## Təkmənali və çoxmənalı sözlər

Yalnız bir leksik mənası olan sözə təkmənali söz deyilir. Məs.: moruq, böyürtkən, avtobus, yaşıl və s. Eyni leksik məna ilə bağlı bir-birinə yaxın müxtəlif mənaları bildirən sözə isə çoxmənalı söz deyilir. Məs.: üz-adamm üzü, suyun üzü, yorğanın üzü; göz - adamın gözü, bulağın gözü, şkafın gözü və s. Çoxmənalılıq yaradan sözlər həmişə eyni nitq hissəsinə aid olur. Məs.: Həqiqi məna Məcazi məna,

polad balta (isim), polad bilək (isim); gözəl mənzərə (sifət) ,gözəl fikir (sifət).Bu zaman həmin sözlər və birləşmələr bir-biri ilə oxşar əlamətlərə malik əşyaları ifadə edir. Beləliklə, sözlərin çoxmənalılığı yaranır. Məs.: alovun dili, çəkmənin dili, insanın dili, heyvanın dili. Bu söz Birləşmələrindən insamn dili, heyvanın dili nümunələrində leksik dahidi həqiqi mənada, alovun dili, çəkmənin dili nümunələrində isə məcazi mənada işlənib. Çoxmənah sözjpr bu və ya digər cəhətdən bir-birinə oxşar əşyaları, yaxud oxşar əlamət və hərəkəti bildirir. Məs.: kağız sözü bir neçə mənada işlənir. Kağız-üzərində yazı yazılan, yazı çap edilən xüsusi materialdır. Kağız-hər cür rəsmi sənəddir (yaş kağızı, icazə kağızı və s). Bu mənaların ikisində də bir-birinə yaxınlıq var.

- Bütün sözlər çoxmənalı ola bilməz.
- Çoxmənalı sözlər əsasən bədii üslubda işlədilir.
- Çoxmənali sözlərə dilimizin, demək olar ki, bütün əsas nitq hissələrində təsadüf olunur. Bunların

içərisində isimlər, fellər və sifətlər daha çoxdur. İsim: Onun əli bağlı idi. (həqiqi məna) Bu işdə kiminsə əli var.(məcazi məna). O, bizə əl açdı. Adam uşağa əl qaldırmaz. Sifət: Bu, çox gözəl mənzərədir (həqiqi məna) .Gözəl fikirlər bizə lazımdır Həyat gözəldir.. Fel: Stəkan yerə düşdü (həqiqi məna). Yolçu yola düşdü İşlər rahatlıqla yoluna düşdü. Motor işə düşdü O, hamının gözündən düşdü. Düşmən əsgəri əsir düşdü. Aşağıdakı sözlər daha çox çoxmənali söz kimi işlənir: qol, maşın, baş, ağız, keçmək, çəkmək, almaq, saymaq, qaş, burun, göz, dil, kağız, şirin, acı, yumşaq, dolu, kök, güclü, dumanlı, polad, yol, yaymaq, qaçmaq, ayaq, ağ, ağır,bişmək, çevirmək, çıxmaq, ətək, yüngül, kəsmək, getmək, yüksək, soymaq, salmaq, baxmaq.

## SÖZLƏRİN MƏNA QRUPLARI

### 1.Omonimlər

Çoxmənalı sözlərdə mənalardan biri əsas, digərləri isə ondan törəmə olur. Yəni çoxmənalılıq sözün əsas mənasının məcazlaşması yolu ilə yaranır. Məs.: ət maşını, minik maşını, təbliğat maşını və s. Əgər sözün mənaları arasında heç bir bağlılıq, yoxdursa, deməli, bunlar ayrı-ayrı leksik vahidlərdir, yəni omonimlərdir. Məs.: ləpə- su dalğası, ləpə-qoz ləpəsi.

Deyilişi və yazılışı eyni olan, lakin leksik mənalarına görə tamamilə fərqlənən sözlərə omonimlər deyilir.

• Lüğətlərdə omonimlər ayrı-ayn sözlər kimi verilir və onların üzərində sıra nömrəsi qoyulur: Divan$^1$ – oturmaq üçün vasitə; Divan$^2$ – şeirlər külliyyatı.

- Çoxmənalı sözlərdən fərqli olaraq, omonimlər ayn-ayn mənaları bildirir. “Balıq tutmaq” sözü ilə kiminsə “fikrini tutmaq” birləşmələrindəki “tut” sözləri çoxmənalıdır, amma “tut yemək” birləşməsi ilə “topu tut” ifadələrindəki “tut” sözləri omonimdir.
- Çoxmənalı sözlərdən fərqli’olaraq, omonimlər yalnız həqiqi mənada olur.
- Çoxmənalı sözlərdən fərqli olaraq, omonimlər həm eyni, həm də ayrı-ayrı nitq hissələrinə aid olur. Məs.: “adamın üzü”, “kitabın üzü” ifadələrindəki “üz” sözləri çoxmənalı sözlərdir və isimlerdir, “kitabın üzü” ifadəsi ilə “dənizdə üz” ifadəsindəki “üz”lərdən birincisi isim, ikincisi isə feldir. ,

Aşağıdakı sözlər omonim kimi götürülə bilməz:

1. Ümumi və xüsusi isimlər: çiçək – gül Çiçək – xüsusi ad; 26 alim-elm sahibi Alim- xüsusi ad.

2. Eyni cür yazılıb, vurğularına görə fərqlənən sözlər: əki’n (fel)- əki’n (isim) ;a’lın (fel) –alı’n (isim). Belə sözlər omoqraf adlanır.
3. Yazılışı və tələffüzü eyni olan, lakin kökləri müxtəlif olan sözlər: əs-ir (fel) -əsir (isim); daşı (fel)-daş-ı (isim); Belə sözlər omoform adlamr.
4. Xüsusi isimlər: Araz (çay)-Araz (ad);
5. Səslənməsinə görə eyniləşən, lakin yazılışı fərqli olan sözlər: xeyr-xeyir, mətn- mətin. Belə

sözlər paronim adlanır. Dilimizdə elə sözlərə də rast gəlinir ki, həmin sözlər həm çoxmənah, həm də omonim ola bilir. Məs.: boğaz, yar, say, al, at, inci, quru, ağn, kök, dil, tut, bel, yay, qaş, qol, yol, düz, dolu və s. Belə sözlərin çoxmənalılığından danışarkən mütləq konkret bir nitq hissəsindən bəhs olunmalıdır. Məs.: tut felinin çoxmənalılığından, kök sifətinin çoxmənalılığından. Omonimlərdə isə söz bütöv şəkildə götürülür, sözün mövcud fərqli mənaları məhz sonradan, zərurət yarandıqda, habelə nitq hissələrinə mənsubluğu cəhətdən fərqləndirilir. Aşağıdakı, sözlər daha çox omonim olurlar: ağıl, dəf, cır, zindan, yara, tala, dava, aşıq, qaz, qır, don, balaq, qurd, boylu, boğaz, qol, lil, dolu, ay, kiit, yel, dil, bel, çən, şiş, üz, tut, qat, qurum, ləpə, ox, ov, çay, bənd, qoşma, koç, kürək, kütlə, aşıq, ayrı, az, daş, düz, din, divan, yağ, biz, bağ, dağ, var, en, əqrəb, uçmaq, saç, bar, bal, tək, inci, mürəkkəb, qan, yaş, top, bit, it, min, qarış, an, çağ, çal, sap, rəng, qat, əsər, bulud, şor və s.

***Qeyd:*** Dilimizdə elə omonimlər var ki, onların leksik mənaları bir-biri ilə antonimlik təşkil edir: yaman (bir mənası pis – yaman adamdır, digər mənası yaxşı- yaman qızdır ha).

## 2.Sinonimlər.

Bəzən eyni bir əşya, eyni bir əlamət və ya hərəkət dildə müxtəlif sözlərlə ifadə olunur. Məs.: müharibə, dava isimləri eyni bir əşyanm adıdır; yüksək, hündür sifətləri eyni bir əlaməti bildirir; odlamaq, alışdırmaq felləri eyni bir hərəkəti ifadə edir. Belə sözlər sinonim adlanır. Yazılışı və deyilişi müxtəlif olan, lakin eyni və ya yaxın mənalan bildirən sözlərə sinonimlər deyilir. Sinonimlər eyni mənam bildirsə də, onların nitqdə işlənməsində incə fərqlər var. Məs.: qaçmaq - yüyürmək sinonimlərindən ikincisində hərəkət daha güclüdür. Yaxud böyük, iri, yekə sinonimləri eyni əlaməti bildirsələr də, bunlardan birincisini hadisə sözünə, ikincisini isə kompyuter sözünə aid etmək mümkün deyil.

- Sinonimləri təşkil edən sözlər eyni bir nitq hissəsinə aid olur. "Kal" və "yetişməmiş", "şəkər" və "şirin" tipli sözlər sinonim hesab edilmir. Çünki kal sifət, yetişməmiş feli sifətdir, şəkər isim, şirin sifətdir.
- Sinonimlər fikri daha dəqiq ifadə etməkdə mühüm rol oynayır, sözləri yersiz təkrar etməyin qarşısını alır.
- Sinonimlik özünü daha çox isim, sifət və fellərdə göstərir. Sinonimlərdən, əsasən, bədii üslubda istifadə olunur.
- Eyniköklü sözlər sinonim ola bilmir: bivəfa-vəfasız

## 3.Antonimlər

Mənaca bir-birinin əksi olan sözlərə antonimlər deyilir; Məs.: alçaq-hündür, sülh- müharibə, oyanır-yatır, çalışqan-tənbəl, müxtəsər-geniş, nağd-nisyə.

- Kökü eyni olan sözlər antonim sayılmır: dadlı-dadsız;
- inkarda olan fellər antonim deyil: getmək-getməmək;
- Antonimlər, əsasən bədii üslubda istifadə olunur;
- Antonimlər həmişə eyni nitq hissəsinə aid olur.

## Mənşəyinə görə söz qrupları.

Azərbaycan dili türk dilləri ailəsinə mənsub olsa da, qədim zamanlardan bəri bir sıra, başqa dillərlə də əlaqə və münasibətdə olmuşdur. Bunun nəticəsində Azərbaycan dilinin lüğət tərkibində də müəyyən dəyişikliklər əmələ gəlmişdir. Bu cəhətdən dilimizdəki sözlər mənşəyinə görə milli və alınma olmaqla iki qrupa bölünür. Amma yadda saxlamaq lazımdır ki, dilimizin lüğət tərkibindəki sözlərin böyük əksəriyyəti mənşəyinə görə əsl Azərbaycan sözlərindən ibarətdir. Məs.: su, daş, ürək, dağ, dəniz, mən, biz, altı, doqquz, yazmaq, daramaq, islanmaq, elat, dəvəquşu və s. Xüsusən əvəzliklərin, sayların (sıfır, həştad, milyon, milyard, trilyon saylarından başqa qalan bütün müəyyən miqdar saylan), sadə fellərin, demək olar ki hamısı əsl türk mənşəli sözlərdir. Bundan başqa bədən üzvlərinin adları (saç, qulaq, baş, üz, göz, burun və s.) qohumluq münasibəti bildirən sözlər (ata, ana, bacı, qardaş və s. istisna: “əmi” sözü alınma sözdür) türk mənşəli sözlər hesab olunur. Amma sözlər özləri də iki qrupa bölünür: 1) Ərəb-fars dillərindən alınma sözlər; 2) Rus və Avropa dillərindən alınma sözlər. Əsl Azərbaycan sözlərini alınma sözlərdən fərqləndirən xüsusiyyətlər:

1. Vurğusunun son hecaya dlişməsi; yazıçı', ata' (ba'yaq, dü'nən, sa'nkij ;ya'lnız və s. sözlər istisnadır).
2. Ahəng qanununa tabe olması: ana, nənə, oğul, qarnı (işıq, ilğım, elat, islanmaq, quşüzümü və s. sözlər istisnadır)
3. Sözün əvvəlində iki samitin yanaşı işlənməməsi: plan, şkaf. Bu sözlər Avropa mənşəlidir.
4. Sözdə iki saitin yanaşı işlənməməsi: ailə, saat, səadət, camaat, təbii.
5. Sözün r, z, f hərfi ilə başlanmaması: razı, rəfiqə, rabitə, radio. İstisna: zoğ, zoğal
6. Saitin uzun tələffüz olunmaması: bəzi, bəzən, alim, arif, kamil, nazir, Sabir, stisna: dovğa [do:ğa], qovurma-[qo:urma], ovuşdurmaq- [o:uşdurmax].
7. Fleksiyaya uğramaması. Fleksiyaya uğrayan sözlər ərəb mənşəlidir: şəkil-təşkil- mütəşəkkil; elm-alim-übma; nəsr-nasir-mənsur;- nəzm-nizam-Nizami-Nazim-mənzum, tərəf-ətraf; eşq-aşiqməşuq-məşuqə və s. İstisna: (bunlar türk mənşəlidir) çaq-alçal, sarı-saral, kiçik-kiçil, uzun-uzat, dağıt-dağıl-dağınıq.
8. Sonu -at$^2$ (cəm şəkilçisidir) şəkilçisi ilə bitən sözlər almmadır; bu sözlər ərəb ənşəlidir: məlumat, həqiqət, hökumət, təbliğat, hesabat. İstisna: gedişat, elat türk ənşəlidir. On şəkilçili sözlər almmadır: bivəfa, laməkan, namünasib, baməzə, ıormal. İstisna: nadinc, nakişi, natəmiz milli sözlərdir.
9. Daxilində təkrar olunan qoşasamitli sözlərin bəzisi alınmadır: mədəniyyət, əvvəl, LOİla, qüvvə, təəccüb, professor, rejissor və s. İstisna: əlli, yeddi (bu cür bütün lylar).

10. Sonu eynicinsli qoşa samitlə bitən təkhecalı sözlər alınmadır: xətt, sirr, hədd, hiss, bb və s.
11. Tərkibində j səsi olan sözlər alınmadır: janr, jurnal, jalə, müjdə, bioloji və s.

Qeyd: Azərbaycan dilində söz əvvəlində ı saiti işlənmir. Vaxtilə işıq, ılıq, ildırım sözləri ı ilə başlamışdır. Sonralar ı səsi i-yə keçdiyi üçün bu ana dili sözlərimizdə ahəng qanunu pozulmuşdur. Bugünkü ildırım, ilan sözləri əvvəllər yıldırım, yılan imi işlənmişdir.

12. Azərbaycan dilində söz sonunda o, ö, e saitləri gəlməz. Belələri alınma sözlərdir: kino, büro, Nitşe
    və s.
13. Azərbaycan dilində o, ö, e saitləri ilə şəkilçilər işlənməz; (-lov, -sov,-ey tisnadır).
14. nıs, mo, mö, mü, qü, tə hecaları ilə başlayan sözlər, adətən, alınma olur. Mömin, məşhur, motor, mübariz, qüssə, mükalimə, müalicə, müasir və s. Azərbaycan dilinə, ərəb, fars, rus və rus dili vasitəsilə Avropa dillərindən sözlər keçmişdir.
15. Sözün h hərfi ilə bitməməsi: Allah, şah, günah və s.
16. Sözdə "ənc", əng” parçaları olarsa, alınmadır: qəşəng, pəncərə, fişəng və s. Ərəb dilindən keçən sözlərin əksəriyyəti təhsillə, tədrislə və islam dini ilə bağlı sözlərdir. Məs.. Allah, Əkbər, Məhəmməd, Əli, Həsən, Hüseyn və s. İstisna: tanrı, inam, inanc. (Əsl Azərbaycan sözləridir)

- Fars dilindən keçən sözlərin əksəriyyəti poetik ifadələr və sözlərdir. Məs.: gül, dilbər, bülbül və s.
- Rus dilindən keçmiş sözlər: samovar, paroxod, parovoz, vedrə.
- Latın dilindən keçmiş sözlər: veksel, molbert, kurort, qalstuk, şayba
- İngilis dilindən keçmiş sözlər: mitinq, klub, rels, trolleybus, keks, futbol və s. Başqa

dillərdən sözlər alınması müəyyən səbəblərlə bağhdır: a) bu və ya digər ölkədə yeni bir əmək aləti, nəqliyyat vasitəsi, silah növü və s. meydana çıxanda ona hansı dildə ad verilirsə, həmin ad başqa dillərə də keçir; Məs.: buldozer, ekskavator, maqnitofon, samovar, qaboy və s. b) oxşar əşyaları, hadisələri fərqləndirmək üçün almma sözlərdən istifadə olunur; Məs.: keks-pirojna; mürəbbə-cem; mehmanxana-motel (avtoturistlər üçün mehmanxana) və s. Alınma sözlərin bir çoxunun Azərbaycan dilində qarşılığı vardır. Nitqdə alınma sözlərdən elmi, qismən də bədii və publisistik üslublarda termin kimi istifadə etmək mümkündür. Lakin danışıqda, məişət üslubunda belə terminlərdən istifadə olunmasına ehtiyac yoxdur. Almma sözlərin bir çoxu nitqimizi zənginləşdirir, onu dəqiq və ifadəli edir. Lakin onlardan yerli-yersiz istfadə etmək dili korlamağa aparıb çıxarır. Alınma sözlərin əksəriyyəti, xüsusən ərəb-fars mənşəli sözlərin bir çoxu dilimizin ümumişlək sözlərinə elə qaynayıb-qarışmışdır ki, onları öz sözlərimizdən fərqləndirmək çətindir. Bu cür sözlərə aşağıdakıları nümunə göstərmək olar: qanun, qayda, qələm, fayda, uşaq, məktəb,mələk, bədbin, bəxtəvər, dövlət,həkim,kitab, şagird, cücə, xoruz, din, məscid, namaz, çarpayı, xörək, qənd, şəkər, bahar, şirin, vətən, məclis, məşğələ, rahat, sərhəd, əsir, səliqə şəhid, tərbiyə, vərəq, sinif, şəkil, bülbül, gül, nəsil, çörək, əmi və s. Fəsil adlarından payız və bahar fars mənşəlidir. Qış və yay isə milli mənşəli sözlərdir. Azərbaycan dilinə başqa dillərdən söz keçdiyi kimi, Azərbaycan dilindən də başqa dillərə söz keçmişdir. Məs.: fars dilinə təppe (təpə), curab (corab), xanum (xanım), bey (bəy) və s., rus dilinə alça (alça), arşin (arşın), arbuz (qarpız) və s. Bizim dilimizdəki alınma sözlərin bir qismi dünya dillərinin çoxunda işlədilir: teatr, futbol, qol, kompyuter, parlament, deputat, firma, fonetika və s. Belə sözlər beynəlmiləl sözlər adlanır.

***Qeyd:*** 1. Dilimizdə bir sıra alınma sözlər var ki, Azərbaycan dilinin fonetik xüsusiyyətlərini qəbul etmişdir: qazeta-qəzet, maşina-maşın. 2.Elə alınma sözlər var ki, ahəng qanununa tabe olur və vurğu son hecaya düşür: dəftər', rahat', həsrət' və s.

Dil ictimai hadisədir. O, cəmiyyətlə birlikdə yaşayır və inkişaf edir. Tarixi hadisələr, cəmiyyətdəki dəyişikliklər dildə əks olunur, yeni sözlər meydana gəliri digərləri isə köhnəlir. Bu baxımdan dilin lüğət fondunda fəal (aktiv) və qeyri-fəal (passiv) leksika formalaşır. Dilin lüğət fondunun aktiv hissəsinə mənası hamı tərəfindən başa düşülən ümumişlək sözlər daxildir. Dilin lüğət fondunun passiv hissəsi isə iki hissəyə bölünür: köhnəlmiş sözlər və yeni sözlər. Köhnəlmiş sözlər özü də iki qrupa bölünür:   1. Tarixizmlər; 2. Arxaizmlər

Tarixizmlər. Tarixi inkişaf prosesində əşya və ya hadisələrin bəzilərinin ömrünü başa vurması ilə əlaqədar onların adlan da qeyri-fəal leksikaya çevrilir. Belə sözlər tarixizmlər adlanır. Məs.: darğa, çuxa, abbası, batman, koxa, dinar, qorodovoy, mədrəsə, konka, dəbilqə, çanq, güyüm, təhnə, qalxan, xurcun, daqqa, toppuz və s. Tarixizmlər keçmiş həyat və məişətin aradan çıxması, dəyişməsi ilə əlaqədar olaraq fəal istifadədən qalsa da, bədii əsərlərin dilində həmin həyatı canlandırmaq üçün onlardan istifadə olunur.

Arxaizmlər. Əşya və ya hadisənin admı ifadə edən söz köhnələrək yenisi ilə əvəz olunur. Bu cür köhnəlmiş sözlərə arxaizmlər deyilir. Tarixizmlərdən fərqli olaraq, arxaizmlər elə sözlərdən ibarətdir kı, onların ifadə etdiyi əşya və ya hadisələr indinin özündə belə mövcuddur, lakin onlar başqa sözlərlə ifadə olunur. Məs.: arı (təmiz), yaşınmaq (gizlənmək), yey (yaxşı), seyvan (eyvan), iraq (uzaq), ər/ərən (igid), ayaq (qədəh), tanıq (şahid), sayru (xəstə), us (ağıl),əsən (sağ-salamat), damu (cəhənnəm), uçmaq (cənnət), düş (yuxu), altun (qızıl), güz (payız), ayıtmaq (demək), varmaq (getmək), dəyə (komaçıq), qısqı (sıxışdırma), qənşər (qarşı tərəf), bəndərgah (düşmənin keçə bilməyəcəyi yol, keçid), yazı (çöl), pitik (yazı), baqqal (dükançı), əllaf (taxıl, ot alverçisi) və s. Tarixizmlərdən bədii dilin üslub xüsusiyyətlərini vermək üçün istifadə edilir. Hər hansı bir yazıçı keçmiş həyatın müəyyən tarixi bir dövrünü və o dövrdə yaşamış bu və ya digər surəti qabarıq vermək istədikdə, dövrün müəyyən dil xüsusiyyətlərini nəzərə çatdırmaq istədikdə tarixizmlər işlədilir. Köhnəlmiş sözlər daha çox atalar sözləri və məsəllərin tərkibində mühafizə olunub. Məs.: Aydan arı, sudan durudur. Cadu-pitik eləmək. Yeni sözlər: İctimai həyatda baş verən bir sıra yeniliklərlə əlaqədar olaraq, elmə, texnikaya, mədəniyyətə, məişətə və s. aid yeni əşyaları, hadisələri yeni sözlərlə ifadəyə ehtiyac yaranır: Məs.: kosmodrom, sərinkeş, biznesmen, ekologiya, alışqan, telefılm və s. Elmin, texnikanın inkişafı ilə əlaqədar yaranan yeni anlayışların adlarını ifadə edən sözlər yeni sözlər- neologizmlər adlanır. Dil ictimai hadisə olaraq daim inkişafdadır, hərəkətdədir. Buna görə də, dildə yeni yaranan sözlər - neologizmlər bir müddətdən sonra ümumişlək sözlər sırasına keçə bilər. Zaman keçdikcə köhnələrək dildən çıxa da bilər. Məs.: komsomol, pioner, kolxoz və s. sözlər XX əsrin 20-30-cu illərində neologizm, 40-80- ci illərində ümumişlək söz, 90-cı illərində isə tarixizm olmuşdur. Yadda saxlamaq lazımdır ki, yeni sözlər dildə hələ sınaq mərhələsindədir. Onlar dildə işlənməyə də bilər. Yeni sözlər iki yolla düzəlir: 1) dildə əvvəlcədən mövcud olmuş söz ehtiyatı əsasında: çimərlik, duracaq, açıqca, bölgə və s. 2) başqa dillərdən almma yolla: denominasiya, spiker, investisiya, distribüter və.s.

***Qeyd:*** Aşağıdakı sözlər həm arxaik, həm də ümumişlək söz kimi işlənə bilər: ayaq, an, yazı, ağac, uçmaq, dəli və. s.

## Frazeoloji birləşmələr.

Dildə iki cür söz birləşməsi mövcuddur: sərbəst və sabit söz birləşmələri. Sabit söz birləşmələri frazeoloji birləşmələr (frazeoloji vahidlər, frazemlər və ya frazeologizmlər) adlanır. Nitqdə ayrı-ayrı sözlərlə yanaşı, bütövlükdə, müəyyən bir leksik mənanı ifadə edən frazeoloji birləşmələrdən geniş istifadə olunur. Frazeoloji birləşmələr dedikdə, tərkibcə dəyişməz, hazır şəkildə işlənən məcazi mənalı birləşmələr nəzərdə tutulur; Məs.: lovğalanmaq mənasında gözü ayağının altını görməmək; qorxmaq mənasında-siçan deşiyinə girmək; şübhələnmək mənasında gözü su içməmək; yorulmaq mənasında əldən düşmək və s. belə birləşmələr frazeoloji birləşmələr adlanır. Frazeoloji birləşmələrin tərkibindəki ayrı-ayn sözlər öz həqiqi mənalamıı itirir, birlikdə yalnız məcazi məna ifadə edir. Əgər sərbəst söz birləşmələrinin tərkibindəki sözlər ayrı-ayrılıqda leksik mənaya malik olurlarsa, frazeoloji vahidlər bütövlükdə bir məna ifadə edir. Məhz buna görə frazeoloji birləşmələr sintaktik baxımdan parçalanmır, bir cümlə üzvü olur, tərəfləri arasında heç bir sintaktik əlaqə olmur. Frazeoloji birləşmələr dildə hazır şəkildə olur. Frazeoloji birləşmələr omonimlik, sinonimlik, antonimlik yarada bilir. Frazeoloji birləşmələrin omonimliyi:

***Qeyd:*** Frazeoloji birləşmələr omonim, sinonim, antonim olduqda onların məna taylan da frazeoloji birləşmə olmalıdır: Kiminsə yola düşməsi ilə, qal amin yola düşməsi omonim ola bilməz. Frazeoloji birləşmələrin sinonimliyi: ağzma su almaq - ağzını qıfıllamaq; dil-dil ötmək - dilotu yemək; burnunun ucu göynəmək - ürəyi istəmək, ürəyi axmaq. Frazeoloji birləşmələrin antonimliyi: xoşu gəlmək - acığı gəlmək , üz ağartmaq - üz qaraltmaq dil-dil ötmək - ağzma su almaq. Frazeoloji birləşmələr nitqə xüsusi ifadəlilik, canlıhq gətirir. Belə birləşmələrdən, əsasən, məişət üslubunda və bədii üslubda istifadə olunur.

***Qeyd:*** ***1*** .Kömək etmək, yaxşı olmaq, əl etmək, adam olmaq, oxuya bilmək kimi birləşmələr frazeoloji birləşmə sayılmırlar. Çünki bunlar tərkibi-mürəkkəb fel hesab edilir. 2. "Yola düşmək" kimi birləşmələr omonim frazeoloji birləşmə hesab edilmir, çünki mənalarından biri həqiqi (top yola düşdü), biri məcazidir (O küsüb yola düşdü). Frazeoloji birləşmələrin omonimliyi dedikdə, ifadə etdiyi mənalarının hər iki tərəfinin məcazi olması nəzərdə tutulur.

## Qrammatika

Dilimizin lüğət tərkibində olan sözlərin hamısı müəyyən qrammatik mənaya malik olur. Bu baxımdan həmin sözlər ayrı-ayrı qruplarda birləşir. Müstəqil mənasına və qrammatik xüsusiyyətlərinə görə qruplaşan sözlərə nitq hissələri deyilir. Sözün hansı nitq hissəsinə aid olması onun hansı suala cavab verməsindən,əşya,yoxsa hərəkətlə bağlı olmasından və s. asılıdır. Nitq hissələri bir-birindən leksik- qrammatik mənalarına görə fərqlənir. Dilimizdə 10 nitq hissəsi var. Bu nitq hissələri də öz sırasında iki qrupda cəmlənib:

1. Əsas nitq hissələri: isim, sifət, say, əvəzlik, fel, zərf
2. Köməkçi nitq hissələri: qoşma, bağlayıcı, ədat, modal sözlər




## İSİM

İsim ümumi qrammatik mənasına görə əşyaların, canlı və cansız varlıqların adlarını bildirir.Kim?, nə? (bəzən də hara?) suallarından birinə cavab olur. Məsələn: müəllim, şagird, uşaq va s. isimləri kim? sualına; at, quş, ağac, daş və isimləri nə? sualına; Bakı, Təbriz, Gəncə və s. isimləri isə hara? sualına cavab olur. İsmin əsas səciyyəvi xüsusiyyətləri tək və cəm olması, mənsubiyyətə görə dəyişməsi və hallanmasıdır.

Konkret və mücərrəd isimlər: Əşya dedikdə bütün varlıqlar nəzərdə tutulur. Varlıqlar iki cürdür: gözlə görünə bilən və görünə bilməyən. Bu baxımdan isimlər iki növə bölünür: konkret isimlər və mücərrəd isimiər

<u>Konkret isimlər-</u> gözlə görünə bilən əşyaların adlandır. Məsələn:dağ,çiçək,qoyun,insan,meşə,ev və s.

<u>Mücərrəd isimlər-</u> gözlə görünə bilməyən əşyaların adlandır. Məsələn:amı,xəyal,yuxu,məqsəd və s.

Ümumi və xüsusi isimlər:

İsimlər cəmiyyətdəki tutduğu yerə və həmcinslİyinə görə iki növə bölünür:

1 .Ümumi isimlər

2Xüsusi isimlər

Eynicinsli əşyalarm adlanna ümumi isimlər deyilir.Məsələn: insan, ağac, ot, gül, çiçək, das, quş, balıq, dəftər, kitab, qələm və s.

Varlığı tək olması ilə fərqlənən əşyalann adlarına isə xüsusi isimlər deyilir. Xüsusi isimlərə, əsasən, aşağıdakılar daxildir:

1. İnsan adlan və soyadlar, təxəllüs və ləqəblər: Nizami Gəncəvi, Hüseyn Cavid, Mirzə Ələkbər Sabir.
2. Coğrafi və astronomik adlar. Azərbaycan, Gəncə, Şuşa, Ay, Ülkər və s.;
3. Qəzet, jurnal və əsər adlan:"Azadlıq","Ulduz", "Xəmsə" və s.
4. Heyvanlara verilən xüsusi adlar: Alabaş, Qırat, Mərcan və s.

Xüsusi isimlər böyük hərflə yazılır. Qəzet, jurnal, əsər, zavod, cəmiyyət və s. adları dırnaq içərisində və böyük hərflə yazılır. Məsələn. "Dəli Kür” (əsər),, "Azərbaycan" (jurnal), "Bakı fəhləsi" (zavod), "Vətən" (cəmiyyət)

Bəzi ümumi isimlər xüsusi isimlərə keçə bilir. Məsələn: arzu,fərəh, ilham, səadət, vəfa, sədaqət, sevinc, çiçək, bülbül və s. ümumi isimlər şəxs adı (bəzən də yeməkxana, mağaza, kinoteatr və s adlarını) bildirdikdə xüsusi isim olur. Nadir hallarda əks hal baş verir, yəni xüsusi isimlər ümumi isimlərə çevrilir. Məsələn: Rentgen alman aliminin adıdır, rentgen isə xüsusi şüa ilə işıqlandırılma alətinin adıdır.

**Tək və cəm isimlər**

İsimlər kəmiyyətcə tək və cəm olur. İsimlər cəmdə olarkən lar$^2$ şəkilçisini qəbul edir: kitablar, insanlar, evlər, şagirdlər və s.

Qeyd: Bu şəkilçi qoşulduğu sözün son samitindən asılı olaraq, bəzi səkillərdə [- rar$^2$], [-nar$^2$ ], [-dar$^2$] kimi tələffüz olunur: qatar- [qatarrar], şəhərlər - [şəhərrər], qazlar - [qazdar], buludlar [bulutdar], igidlər - [igiddər]. oğlanlar - [oğlannar], əkinlər -[əkinnər] və s.

Dilimizdə elə isimlər də var ki, onların məzmununda çoxluq,topluluq anlayışı var. Belə isimlər toplu isimləradlanır. Məsələn: el, xalq, kütlə, camaat, qoşun, sürü, ih dəstə, partiya. Toplu isimlərin çoxu cəm şəkilçisi qəbul edir: xalqlar, ellər, ellər və s. Toplu isimlərlə əlaqədə olan xəbər təkdə işlənir, məsələn: El yaylağa köçür. Xalq azadlığına qovuşdu və s.

# SİFƏT

Sifət əşyanın əlamət və keyfiyyətini bildirən əsas nitq hissəsidir. Sifət necə? nə cür? hansı? suallarından birinə cavab olur. Sifətlər daha çox əşyanın əlamətini, keyfiyyətini və rəngini bildirir. Əlamət dedikdə əşyanın zahiri görkəmi, keyfiyyət dedikdə isə onun daxili xüsusiyyəti nəzərdə tutulur. Məsələn: əşyanın həcmi (uzun, qısa, böyük, kiçik və s.), zahiri görkəmi (nurani, yaşlı, kök, artıq və s.) onun əlamətidir. Əşyanın daxili xüsusiyyəti, yəni dadı, xasiyyəti, vərdişi, mənəvi cəhətləri (məsələn: çalışqan, əliaçıq, ürəyiyumşaq, ağıllı və s.) onun keyfiyyətidir. Əşyanın rəngi də onun əlaməti sayılır .İsim əşyanın adını, sifət isə əlamətini bildirir. Buna görə də sifət həmişə ismə aid olur və ondan əvvəl işlənir.

Sifətin quruluşca növləri: Sifətlər quruluşca sadə, düzəltmə və mürəkkəb olur.

Sadə sifətlər: Sadə sifətlər bir kökdən ibarət olur. Məsələn: ağ, qara, uzun, gödək, qısa, hündür, qalın, nazik və s. Azaltma və çoxaltma dərəcələrinin şəkilçilərini qəbul edən sifətlər də quruluşca sadə sayılır. Məsələn: sarışın, uzunsov, ağımtıl, qıpqırmızı, gömgöy, qapqara və s.

Düzəltmə sifətlər: Düzəltmə sifətlər isimlərin və fellərin sonuna leksik şəkilçi artırmaqla düzəlir. Hansı nitq hissəindən düzəhnƏäüıə görə düzəltmə sifətlər iki qrupa bölünür: isimdəndüzələn sifətlər, feldəndüzələn sifətlər, isimdən düzələn sifətlər. Bu növ düzəltmə sifətlər isimlərə aşağıdakı leksik şəkilçiləri artırmaqla düzəlir:

- $lı^4$: maraq-lı (dərs), tərbiyə-li (uşaq), su-lu (xörək), ütü-lü (paltar) və s.
- $sız^4$: dad-sız (meyvə), bilik-siz (tələbə), ot-suz (yer), güc-süz (uşaq) və s. .
- $cil^2$: zarafat-cıl (oğlan), iş-cil (adam), söhbət-cil (qonşu), qohum-cul (kişi), ölümcül (yara) və s.
- $dakı^4$: kitab-dakı (şəkillər), həyət-dəki (ağac) və s.
- $-ı^4$: badam-ı (göz), çərkəz-i (papaq), armud-u (stəkan), gümüş-ü (saç) və s. Sonu saitlə bitən sözlərdə bu şəkilçi -yı və -yi şəklində işlənir: xurma-yı (saç), qəhvə-yi (rəng) və s.
- i (- vi): Yalnız ərəb və fars mənşəli sözlərə qoşulan bu alınma şəkilçi ahəng qanununa tabe olmur və bir cür yazılan tarix-i (hadisə), dövr-i (mətbuat), daxil-i (siyasət), dairə-vi (masa), ailə-vi (dostluq) və s.
- kı, - ki, - kü: qabaq-kı (sıra), çoxdan-kı (əhvalat), axşam-kı (söhbət), dünən-ki (külək), bildir-ki (hadisə), bugun-kü (xəbər) və s. Misallardan göründüyü kimi, bu şəkilçi, əsasən, zərflərdən sifət düzəldir.
- $lıq^4$: ay-lıq (maaş), il-lik (plan), don-luq (parça), üz-lük (daş) və s.

Bu şəkilçilərdən $-lı^4$ və $-sız^4$ antonim şəkilçiləridir: yağ-lı -yağ-sız (ət), duz-Iu - duz-suz (xörək), ağıl-lı - ağıl-sız (insan) və s. $-lı^4$, $-lıq^4$, $-ı^4$ şəkilçiləri isə həm də isim düzəltdiyi üçün omonim şəkilçilərdir: Sultan-lıq -isim, ağıl-lı (uşaq) -sifət; yaxşı-lıq -isim, qurban-lıq (qoç) -sifət; yaz-ı -isim, palıd-ı (rəng) -sifət və s.
Qeyd: Sifət düzəldən -lı şəkilçisi qoşulduğu sözün son samitindən asılı olaraq [$- rı^4$], [$-nı^4$], [$-dı^4$] şəklində tələffüz olunur. Məsələn: qarlı [qam], dadlı[dəddı], buludlu [hulutdu] və s.

**Feldən düzələn sifətlər.**

Aşağıdakı leksik şəkilçilərin köməyi ilə fel köklərindən sifət düzəlir:

-ağan (-əyən): qaç-ağan (at), gül-əyən (uşaq) və s. Ağla-ğan (körpə) düzəltmə sifəti də bu şəkilçinin köməyi ilə düzəlmişdir. Burada fel kökü saitlə bitdiyi üçün şəkilçidəki birinci sait səs düşmüşdür.

-qan (-kən): çalış-qan (şagird), dalaş-qan (uşaq), sürüs-kən (yer), döyüş-kən (asgər) və s. Deyingən (qoca) düzəltmə sifəti də bu şəkilçinin köməyi ilə düzləmişdir. Bu sözdə fel cingiltili samitlə bitdiyi üçün şəkilçinin ilk samiti də kar yox, cintilili samitdir.

-gın⁴ (-gin -ğun, -gün). Bu şəkilçi sonu cingiltili samitlə bitən fel köklərinə qoşulur: az-ğın (düşmən), dal-ğın (baxış), gər-gin (iş), əz-gin (sifət), sol-ğun (çiçək), yor-ğun (adam), süz-gün (baxış), duz-gün (cavab) və s.

-qın⁴ (-qın, -kin, -qun, -kün): Yuxarıdakı şəkilçinin variantı olan bu şəkilçi sonu kar samitlə bitən fel köklərinə qoşulur: sat-qın (adam), kəs-kin (söz), bit-kin (fikir), coş-qun (dəniz), tut-qun (hava), küs-kün (baxış), öt-kün (söz) və s.

-q⁴ (-q -k) aç-ıq (qapı), əz-ik (paltar), yan-ıq (çörək), uç-uq (ev), sök-ük (divar), soyu-q (su), çürü-k (meyvə), böyü-k (usaq) və s.

-ıcı⁴: qır-ıcı (təyyarə), keç-ici (xəstəlik), qür-ucu (əllər), öldür-ücü (gülüs).

-aq (-q, -k): qorx-aq (adam), ürk-ək (at), parla-q (saç), titrə-k (səs) və s.

-unc, ünc: qorx-unc (hadisə), gül-ünc (iş) və s.

Qeyd 1: Feldən sifət düzaldən bu şəkilçilərdən -qın, -ğın şəkilçiləri isə bə zi isimlər də düzəlir. Məsələn: basqın, yanğın, qırğın, sürgün və s.

Qeyd 2: -ıq va -aq şəkilçiləri həm də feldən isim düzəldir: bacar-ıq, bili-ik, yat-aq, sanc-aq, və s. Bu şəkilçilər omonim şəkilçilər sayılır.

Qeyd 3: -kan, -kin, -kün şəkilçilərinin ilk samiti tələffüzdə cingiltili tələffüz olunur. Məsələn: sürüşkən - [sürüşgən], kəskin -[kəsgin), ötkün - [ötgün] və s.

**Mürəkkəb sifətlər.** Mürəkkəb sifətlər bir neçə yolla yaranır:

1. İki sadə sözün birləşməsi ilə: qaraqaş (qız), uzunsaç (gəlin), hazırcavab (oğlan), diribaş (uşaq) və s.
2. Birincisi sadə, ikinci düzəltmə olan sözün birləşməsi ilə: ucaboylu (oğlan), taleyüklü (məsələ), məqsədyönlü (iş), sözdəyişdirici (şəkilçi), qarabuğdayı (sifət), beşmərtəbəli (ev) və s.
3. İki düzəltmə sözün birləşməsi ilə: açıqürəkli, smıqqəlbli, soyuqqanlı (adamlar) və s. Belə mürəkkəb sifətlərin birinci tərəfi feldən düzələn sifət, ikinci tərəfi isə isimdən düzələn sifət olur.
4. Biri mənsubiyyət şəkilçisi qəbul etmiş sözün iştirakı ilə: dılışırin (uşaq), yaxasıaçıq (köynək), dağüstü (park), ölkələrarası (yarış) və s.^..
5. Sadə və düzəltmə sifətlərin təkrarı ilə: yaşıl-yaşıl (çəmənlər), uzun-uzun (yollar), dadlı-dadlı (meyvələr), qalaq-qalaq (odun), yığın-yığın (daşlar), böyük-böyük (evlər) və s. Belə sifətlər əşyanın çoxluğunu bildirir və onlardan sonra gəl-M isimlər daha çox cəmdə işlənir.
6. Biri (bəzən də hər ikisi) ayrdıqda işlənməyən sözlərin birləşməsi ilə: uzun- uzadı (söhbət), kələ-kötür (yol), əzik-üzük (dəsmal), əyri-üyrü (yol)" qarmaqarışıq (yuxu) və
7. Yaxm və ya əks mənalı düzəltmə sifətlərin birləşməsi ilə: güllü-çiçəkli (həyət), daşlı-kəsəkli (yol), irili-xırdalı (daşlar), elmi-kütləvi (jurnal) vƏ s.

İlk dörd qayda üzrə düzələn mürəkkəb sifətlər bitişik, qalan qaydalar üzrə düzələnlər isə defislə yazılır.

**Sifətin müqayisə dərəcələri**. Sifəti başqa nitq hissələrindən fərqləndirən əsas əlamətlərdən biri də onun dərəcə bildirməsidir. Müxtəlif əşyalardakı eyni bir əlamət başqalarından az və ya çox dərəcədə fərqlənir. Məsələn: şirin bal və şirin qarpız, san limon və san alma birləşmələrindəki əşyalann əlaməti - şirinliyi və sanlığı eyni dərəcədə dəyil. Bu baxımdan sifətin müqayisə dərəcələri vardır.Əşyanm əlaməti üç dərəcədə ola bilər: normal, normadan az, normadan çox. Bu xüsusiyyətə görə sifətin üç dərəcəsi var:

1. Adi dərəcə
2. Azaltma dərəcəsi
3. Çoxaltma dərəcəsi

Adi dərəcə: Əlamətin adi halda olduğunu bildirir. Heç bir xüsusi morfoloji əlaməti - qrammatik şəkilçisi yoxdur. Məsələn: ag, qara, sirin, sərin, böyük, kiçik və s. Adi dərəcədə olan sifətlər dilimizdə çoxluq təşkil edir. Adi dərəcə başqa dərəcələr üçün ölçü, me yar rolunu oynayır. Adi dərəcə olmasa, azaltma və çoxaltma dərəcələrini müəyyən edə bilmerik. Deməli, sifətin azaltma və çoxaltma dərəcələri adi dərəcə əsasmda yaranır və müəyyən edilir.

Azaltma dərəcəsi:

Əlamətin adi haldan az olduğunu bildirir. Azaltma dərəcəsi iki üsulla düzəlir:

1. Morfoloji üsulla. Adi dərəcədə olan sifətlərə aşağıdakı şəkilçiləri artırmaqla:

-ımtıl$^4$: ağ-ımtıl, boz-umtul, göy-ümtül, san-mtıl və s.
-ımtraq (-mtraq): ağ-ımtraq, san-mtraq
-sov (-ımsov, - ümsov): uzun-sov, ağ-ımsov, göy-ümsov
-şın: san-şın, qara-şın və s.
-raq, -rək: yaxşı-raq, gödə-rək (ikinci sözün kökündəki k (gödək) samiti düşür. (Bu şəkilçi ilə düzələn sifətlər müasir dilimizdə nadir hallarda işlənir).

2.Sintaktik üsulla. Adi dərəcədə olan sifətlərin əvvəlmə açıq sözünü artırmaqla.

Bu sözdən sonra defis işarəsi qoyulur: açıq-qırmızı, açıq-san və s.
(Bəzi sifətlərin əwəltndə işlənən az, ala, təhər sözləri də azaltma dərəcəsi məzmununu bildirir: az şirin, alayarımçıq, göy təhər və s.).

Çoxaltma dərəcəsi:

Əlamətin adi haldan çox olduğunu bildirir. Çoxaftma dərəcəsi də azaltma dərəcəsi kimi iki üsulla düzəlir

1.Morofoloji üsulla. Çoxaltma dərəcəsində olan sifətlər bu üsulla iki qayda ila düzəlir:

a)Adi dərəcədə olan sifətlərin sonuna -ca$^2$ şəkilçisini artırmaqla: canlı-ca (şəkil), zorba-ca (balıq), körpə-cə (xiyar), yekə-cə (oğlan) və s.; '

b)Sifətin ilk hecasının son samitinin m, p, r, s samitlərindən biri ilə əvəz olunması və sifətin təkrar ona qoşulması ilə:

göy-göm+göypjgömgöy, qırmızı - qıp+qırmızı = qıpqırmızı, doğru - dos+doğru = dosdoğru

Sifətin ilk hecası saitlə bitərsə, bu samitlərdən biri həmin hecaya qoşulur: yaşıl - yam+yaşıl = yamyaşıl, san - sap+sarı = sapsarı, təmiz –tər+təmiz = tərtəmiz, bütün - büs+bütün =büsbütün və s.

2.Sintaktik üsulla. Adi dərəcədə olan sifətlərin əvvəlinə ən, lap, çox, daha, olduqca ədatlarından biri, düm hissəciyi və tünd sözü artırılır.Ədatlar ayrı, düm hissəciyi ilə bitişik yazılır. Tünd sözündən sonra defis qoyulur: ən gözəl, lap yaxşı, çox maraqlı, daha ağıllı, olduqca bacanqlı, dümağ, tünd-göy və s.

**Sifətin isimləşməsi:**

Bəzi sifətlər cümlədə ismi əvəz edə bilir, yəni onun yerində işlənir. Belə sifətlər isimləşmiş (substantivləşmiş) sifətlər adlanır. İsimləşmiş sifətlər İsmin suallarına  cavab olur və isimlərə məxsus cəm, hal, mənsubiyyət şəkilçilərini qəbul edir.

Məsələn: Qocalara hörmət hər bir gəncin borcudur. İgidlərimiz düşmənə layiqli cavab verdilər. Bu cümlələrdəki qoca, gənc və igid sifətləri aid olduqlan isimləri əvəz etmişdir. Birinci cümlədəki qoca sifəti adamlara ismini əvəz edərək onun yerində işlənmişdir (qoca adamlara - qocalara). Eyni cümlədəki gənc sifəti də oğlanın (gənc oğlanın) ismini, ikinci cümlədəki igid sifəti isə döyüşçülərimiz (igid döyüşçülərimiz) isriini əvəz etmişdir. İsimləşmiş sifətlər cümlədə mübtəda və tamamlıq vəzifələrində çıxış edir. Morfoloji təhlil zamanı belə sifətlər isim kimi yox, isimləşmiş sifət kimi təhlil olunur.

**Sifətin cümlədə rolu.**

Sifətlər cümlədə ən çox təyin olur. Bəzən sifətlər cümlədə xəbər vəzifəsində də çıxış edir. Bu halda xəbər isimdən əvvəl işlənir və şəxs (xəbərlik) şəkilçilərini qəbul edir. Məsələn: yaxşıyam, yaxşısan, çalışqandır, kiçiyik, ağıllısınız və s.

Sifətin morfoloji təhlil qaydası.

Sifətin təhlili zamanı onun aşağıdakı xüsusiyyətləri göstərilir:

1. Əlamət, keyfiyyət, rəng və s. bildirməsi və sualı
2. Quruluşca növü
3. Dərəcəsi
4. Bağlı olduğu söz
5. Cümlədə rolu

Məsələn: Anar ağıllı və hazırcavab oğlandır. O, sinifdə ən çalışqan şagirddir.

Ağıllı - keyfiyyət bildirir, necə? sualına cavab olur: Quruluşca düzəltmədir - ağıl ismindən düzəlmişdir. Adidərəcədədir, isim ilə bağlıdır. Cümlədə təyindir.

Hazırcavab - keyfiyyət bildirir, necə? sualına cavab olur. Quruluşca mürəkkəbdir: hazır sifəti və cavab ismindən yaranmışdır. Adidərəcədədir, oğlan ismi ilə bağlıdır. Cümlədə təyindir.

Çalışqan - keyfiyyət bildirir, necə? sualına cavab verir. Quruluşca düzəltmədir. Çoxaltma dərəcəsindədir, ən ədatının köməyi ilə bu mənanı bildirir. Şagird ismi ilə bağlıdır. Cümlədə təyindir.

# SAY

Əşyanın miqdarını və ya sırasını bildirən əsas nitq hissəsinə say deyilir. Say neçə? nə qədər? neçənci? suallarından birinə cavab olur. Məsələn: iki (uşaq), beş (kitab), birinci (sinif) və s. Sifət əşyanın əlamətini, say isə miqdar və ya sırasını bildirir. Saym sifətlə bir neçə oxşar cəhəti var:

1. Say da sifət kimi isimlə bağlı olur və sifət kimi isimdən əvvəl işlənir.
2. Say da sifət kimi cümlədə ən çox təyin olur.
3. Say da sifət kimi ismi əvəz edə bilir, yəni isimləşir.
4. Say da sifət kimi qımıusca sadə, düzəltmə və mürəkkəb olur.

Sayın quruluşca növləri:Saylar quruluşca üç növə bölünür: sadə, düzəltmə və mürəkkəb saylar.Sadə saylarbir kökdən ibarət olur. Məsələn: bir, üç, yeddi, on, əlii, səksən, doxsan, milyon və s.

Düzəltmə saylar kök və leksik şəkilçidən ibarət olur, isim və sifətdən fərqli olaraq, düzəltmə saylar başqa nitq hissələrindən yox, yalmz saylarınözündən düzəlir.

Düzəltmə saylar sadə saylara -ıncı4 şəkilçisini artırmaqla düzəlir. Bu şəkilçi yalnız saya aid şəkilçidir: qırx-ıncı, səkkiz-ıncі, on-uncü, üç-tincü, altı-ncı, iki-nci. —la$^2$ və -ca$^2$ şəkilçilərinin köməyi ilə düzələn onlarla, yüzlərlə, onlarca, minlərcə tipli saylar da quruluşca düzəltmədir. Çoxlu sayı da quruluşca düzəltmədir.

Mürəkkəb saylar da, əsasən, saylardan yaranır. Məsələn: üç-dörd, beş-altı, on-on beş, on iki, otuz üç, yüz iyirmi beşinci, bir çox, bir az, bir qədər, beşdə üç, ikidə bir və s. İki-üç, üç-dörd tipli mürəkkəb qeyri-müəyyən miqdar sayları defislə, qalanları isə ayrı yazılır.

Qeyd: Defislə yazılan mürəkkəb saylar əsl mürəkkəb saylar, ayn yazılan saylar isə tərkibi saylar sayılır.

Saym mənaca növləri:Sayın mənaca iki növü vardır:

1.Miqdar sayları

2. Sıra sayları

Miqdar saylan özü də üç növə bölünür:

1. Müəyyən miqdar sayları
2. Qeyri-müəyyən miqdar sayları
3. Kəsr sayları

Müəyyən miqdar sayları :Müəyyən miqdar sayları əşyanın konkret miqdarını bildirir və neçə? nə qədər? suallarına cavab verir. Məsələn: beş, on, yüz, otuz üç, yüz on və s. Dilimizdə quruluşca sadə olan müəyyən miqdar saylan cəmi 23-dür: bir, iki, üç, dörd, beş, altı, yeddi, səkkiz, doqquz, on, iyirmi, otuz, qırx, əlli, altmış, yetmiş, səksən, doxsan, yüz, min, milyon, milyard, trilyon. Bu sözlərdən yalnız sonuncu üçü alınma sözdür, qalanları əsl Azərbaycan (türk) sözləridir. Sıra saylan və mürəkkəb müəyyən miqdar sayları bu 23 sayın əsasında yaranır.

Müəyyən miqdar saylarından soma gələn isimlər yalnız təkdə işlənir. Məsələn: on beş şagird, beş kitab və s. Bu isimləri cəmdə işlətmək (beş kitablar şəklində) qrammatik cəhətdən səhvdir. Sifətlərdən soma gələn isimlər isə cəm şəkilçisi qəbul edir, məsələn: maraqlı kitablar, çalışqan şagirdlər, yeni binalar və s. Müəyyən miqdar saylan ilə isimlər arasında çox vaxt numerativ sözlər işlənir. Həmin sözlər aşağıdakılardır:

Nəfər - insan bildirən isimlərlə işlənir: iki nəfər şagird, on nəfər tələbə və s.
Baş - əsasən, heyvan bildirən isimlərlə işlənir: on baş öküz, yüz baş qoyun, iki bas keçi və s. (Danışıq zamanı baş sözü ailə üzvləri üçün də işlənir: iki bas ailə üzvü).
Ədəd, dənə - cansız əşya bildirən isimlərlə işlənir beş dana nar, iki ədəd qələm və s.
Cüt, dəst - qoşalıq bildirmək üçün isimlərin əvvəlində işlənir: bir cüt ayaqqabı, iki dəst paltar (kostyum) və s.
Göz, tikə, parça, dəstə, top və s numerativ sözləri də müəyyən miqdar saylan ilə isimlər arasında işlənir: üç göz otaq, bir tikə qənd, bir parça çörək, iki dəstə gül bir top çit və s.

Qeyri - müəyyən miqdar sayları:Qeyri-müəyyən miqdar saylan əşyanın dəqiq olmayan miqdarını bildirir və nə qədər? sualma cavab verir. Məsələn beş-altı (kitab), üç-dörd (uşaq) və s Dilimizdə ən çox işlənən qeyri-müəyyən miqdar sayları aşağıdakılardır az. çox, xeyli, birqədər, bir çox, bir az, bir sıra, az-çox, çoxlu, onlarla, yüzlərlə, minlərlə, bir-iki, on-on beş və s. Az və çox saylan ən, lap, daha ədatlan ilə də işlənə bilər: ən az (otaq), lap çox (adam), daha çox (məhsul) və s.
Az sayından sonra gələn isim təkdə işlənir: az adam. Bir çox, bir sıra saylanndan sonra gələn isimlər isə cəmdə işlənir: bir çox alimlər, bir sıra şəhərlər və s. Çox, onlarla, yüzlərlə, minlərlə və s. saylanndan sonra gələn isimlər isə həm təkdə, həm də cəmdə işlənə bilir: çox uşaq, çox adamlar, onlarla şagird, yüzlərlə tələbə və s Başqa qeyri-müəyyən miqdar saylanndan sonra gələn isimlər isə təkdə işlənir: xeyli adam, bir qədər odun və s.
Bir-iki, üç-dörd, beş-altı tipli qeyri-müəyyən miqdar saylan ilə isimlər arasmda da ' nəfər, baş, ədəd, dənə, dəst, kimi numerativ sözlər işlədilir: üç-dörd nəfər uşaq, bir- iki dənə alma, beş-altı dəstə gül və s.

Qeyd: Bir-iki, üç-dörd, bes-altı tipli saylara təqribi (təxmini) miqdar saylan da deyilir.

Kəsr sayları :Kəsr saylan ya tamın (bütövün) hissəsini, ya da tam və hissəsini bildirir və nə qədər? neçə hissə? suallanna cavab olur. Kəsr sayları müəyyən miqdar sayları və -da2 şəkilçisinin köməyi ilə yaranır. Məsələn: beşdə üç (5/3), iki tam onda beş (2,5) və s. Kəsr sayları quruluşca həmişə mürəkkəb (tərkibi) olur.

Sıra sayları:Sıra saylan əşyanın sırasını bildirir və neçənci? sualına cavab verir.

Sıra sayları müəyyən miqdar saylarına -ıncı$^{4}$ şəkilçisini artırmaqla düzəlir: altmışıncı, səksəninci, doqquzuncu, dördüncü.Kökü samitlə bitən saylara qoşulduqda bu şəkilçinin ilk saiti düşür: altıncı, ikinci və s.
Əvvəl, axır, filan, son sözləri də -ıncı$^{4}$ şəkilçisi ilə işləndikdə sıra sayı məzmununu bildirir: əvvəlinci (sıra), axırıncı (dərs), sonuncu (zəng), filanıncı (il) və s.
Sıra sayları bəzən hansı? sualına da cavab olur. Məsələn birinci (hansı?) mərtəbə, axırıncı (hansı?) cərgə, onuncu (hansı?) sinif və s.
Sıra saylarından sonra gələn isimlər bəzən cəm şəkilçisi qəbul edə bilir. Məsələn: beşinci siniflər, 30-cu illər, birinci sıralar və s.
Sıra sayları başqa saylara nisbətən daha çox isimsiz işlənə bilir (isimləşir).Məsələn: Onuncular irəlidədirlər. Birincilərə mükafat verdilər, və s.

Sıra sayları quruluşca sadə olmur, ya düzəltmə (birinci, ikinci), ya da mürəkkəb (on birinci, otuz ikinci) olur.Sıra sayları üç cür yazılır:

1. Sözlə: birinci, altıncı, on beşinci və s.
2. Ərəb rəqəmləri və -ıncı4 şəkilçisinin ixtisar forması olan -cı[4] şəkilçisi ilə: 6-cı,

1-ci, 4-cü, 35-ci və s.

Sıra saylanm ərəb rəqəmləri ilə yazıb, onlardan sonra nöqtə və ya yanmmötərizə (nöqtəsiz) işarəsi qoymaqla da göstərmək olar. Məsələn: 1.1) və s.

3.Roma rəqəmləri ilə: XX əsr, IX sinif, VI fəsil və s. Roma rəqəmlərindən sonra heç bir şəkilçi işlədilmir və defis işarəsi də qoyulmur. Roma rəqəmləri 7 işarə ilə göstərilir: I, V, X, L (50), C (100), D (500), M (1000) Bunların müxtəlif şəkildə birləşməsi ilə qalan rəqəmlər də yazılır: XL (40-cı), LX (60-cı) və s.

Sayın isim kimi işlənə bilməsi:

Say da sifət kimi ismi əvəz edə bilir, ismi əvəz edən say təklikdə (isimsiz) işlənir, yəni isimləşir. İsimləşmiş say ismə məxsus hal, cəm və mənsubiyyət şəkilçilərini qəbul edir, ismin sualına cavab olur və cümlədə mübtəda, tamamlıq və bəzən də xəbər vəzifəsində işlənir: Məsələn: Beşincilər (kim?) yarışda qalib gəldirlər. Beşlərimdən (nədən?) xoşum gəlir. Beş (nə?) üçdən (nədən?) çoxdur. Gələn onunculardır (kimdir?).

Bəzi sayların yazılışı və deyilişi:

Dilimizdəki bəzi saylann yazılışı və tələffüzü fərqlənir. Bu cür saylar, əsasən, aşağıdakılardır: dörd - [dört], səkkiz - [səkgiz], doqquz - [dokquz], altmış - [atmış], əlii altı - [əllaltı], səksən -[səysən] s. Dörd sayı -üncü şikilçisini qəbul etdikdə isə kökdəki sonuncu samit sait səsdən əvvəl gəldiyi üçün cingiltili tələffüz olunur, [dördüncü].

Say cümlədə ən çox təyin olur. Yuxarıda qeyd olunduğu kimi, say isimləşdikdə mübtəda, tamamlıq, bəzən də xəbər ola bilir.

Sayın təhlil qaydası:Say aşağıdakı qaydada təhlil olunur:

1. Ümumi qrammatik mənası, sualı
2. Hansı isimlə bağlı olması
3. Quruluşca növü
4. Mənaca növü
5. Cümlədə rolu

Məsələn: Birinci sinif şagirdi Günay dərslərindən beş qiymət alır.

Birinci - əşyanın sırasını bildirir, neçənci? sualına cavab olur. Sinif isimi ilə bağlıdır, quruluşca düzəltmədir. Sıra sayıdır, cümlədə təyindir.

Beş - əşyanın miqdarını bildirir, neçə? sualına cavab olur. Qiymət ismi ilə bağlıdır, quruluşca sadədir. Müəyyən miqdar sayıdır, cümlədə təyindir.

# ƏVƏZLİK

İsim, sifət, say və başqa nitq hissələrinin yerində işlənən sözlərə əvəzlik deyilir.
Məsələn: Anar əlaçı şagirddir. O, beşinci sinifdə oxuyur. Sinfimizdə əlaçı şagirdlər çoxdur. Həmin şagirdlər olimpiadada iştirak edəcəklər. Günay birinci sinifdə oxuyur. Günay neçənci sinifdə oxuyur? Müəllim təmkinlə danışırdı. Müəllim necə danışırdı? və s. Bu cümlələrdəki o, həmin, neçənci və necə əvəzlikləri sıra ilə ismin, sifətin, sayın və zərfmyerində işlənmişdir. Əvəzlik hansı nitq hissəsinin yerinə işlənirsə, onun da sualma cavab olur.

Əvəzliyin quruluşca növləri:

Əvəzliklərin çoxu quruluşca sadədir. Məsələn: mən, biz, onlar, bu, həmin və s.
Biri, birisi, kimsə əvəzlikləri düzəltmə; kim isə, heç kim, heç nə və s. əvəzlikləri isə mürəkkəbdir (tərkibi əvəzliklərdir)

Əvəzliyin mənaca növləri:

Əvəzliyin mənaca aşağıdakı növləri vardır:

Şəxs əvəzlikləri:İsmin yerində işlənən və kim? nə? suallarım cavab verən əvəzliklərə deyilir. Şəxs əvəzlikləri kəmiyyətcə tək və cəmolur və şəxsə görə üç növəbölünür:

I şəxs (danışan): təkdə - mən, cəmdə - biz

IIşəxs (dinləyən): təkdə - sən, cəmdə - siz

IIIşəxs (haqqmda danışılan): təkdə - o, cəmdə - onlar.

I və II şəxsi bildirən əvəzliklər yalnız insana aid olur və kim? sualma cavab verir.

III şəxsi bildirən əvəzliklər isə həm insana, həm də heyvana və cansızlara aid ola bilir.
Məsələn: Qoyun ev heyvanıdır. O, ildə bir. bəzən də iki bala verir. Yaqut qiymətli daşdır O, Bədəxşanda olur və s. III şəxsi bildirən əvəzliklər heyvana və cansızlara aid olduqda nə? sualma cavab verir. Deməli, şəxs əvəzliyi heç də həmişə insana aid olmur. Burada "şəxs" sözü qrammatik mənadadır. Şəxs əvəzlikləri quruluşca yalnız sadə olur. Şəxs əvəzlikləri isim kimi hallanır. Mən və biz əvəzlikləri hallandıqda yiyəlik halda -in şəkilçisi əvəzinə-im şəkilçisini qəbul edir. Müqayisə edin: dən ismi yiyəlik halda dən+in olur,mən əvəzliyi isə eyni halda mən+im olur. Şəxs əvəzlikləri mənsubiyyətə görə dəyişmir.

Qeyri - müəyyən əvəzliklər ismin yerində işlənir və qeyri-müəyyən şəxsi və ya əşyanı bildirir. Qeyri-müəyyən əvəzliklər kim? nə? suallarına cavab olur.

Dilimizdə ən çox işlənən qeyri-müəyyən əvəzliklər bunlardır: biri, kim, kimsə (kim isə), nə isə, hamı, hərə, bəzisi, hər kəs, hər şey və s:

Bu əvəzliklərdən hamı, hərə quruluşca sadə; biri, kimi, kimsə düzəltmə; hər kəs, kim isə, nə isə, hər şeymürəkkəbdir (tərkibi əvəzlikdır).Kim isə, nə isə qeyri- müəyyən əvəzliklərindən başqa, qalan qeyri-müəyyən əvəzliklər hallanır. Qeyn-müəyyən əvəzliklər cümlədə, əsasən, mübtəda və tamamlıq olur.
Məsələn:Hamı gülür (mübtəda). Hərənizə bır sualım var (tamamlıq). Bu əvəzliklər də xəbərlik şəkilçisi qəbul etdikdə cümlədə xəbər olur. Məsələn: Bu işdə günahkar hamımızıq.
İnkar əvəzlikləri:inkar əvəzliklərinin çoxu heç sözünün köməyi ilə düzəlir heç kim, heç nə, heç kəs, kimsə (heç kim mənasında).
İnkar əvəzlikləri də ismin yerində işlənir, kim? nə? suallarından birinə cavab olur və cümlədə mübtəda, tamamlıq olur.

***Qeyd:*** Kimsə əvəzliyindən sonra gələn fel təsdiqdə olduqda o, qeyri-müəyyən əvəzlik olur .Məsələn: Kimsə səni soruşurdu. Bu əvəzlikdən sonra gələli fel inkarda olduqda isə o, inkar əvəzliyi olur. Məsələn: Kimsə bu sualın cavabını tapmadı.

İşarə əvəzlikləri :İşarə məqsədi ilə işlədilən əvəzliklərə deyilir .O, bu, elə, belə, həmin sözləri işarə əvəzlikləridir. O, bu, həminişarə əvəzlikləri, əsasən, sifətin yerində işlənir və hansı? sualına cavab olur. Məsələn: Bu (hansı?) kitab maraqlıdır. O (hansı?) ağac çinardır. Həmin (hansı?) oğlan tələbədir və s.Sifətin yerində işlənən bu əvəzliklər cümlədə təyin olur.
Elə, belə işarə əvəzlikləri isə həm sifətin, həm də zərfin yerində işlənir. Məsələn: Belə (elə) dostdan kim inciyər. Elə oxu ki, mən də eşidim.Bu əvəzliklər sifətin yerində işləndikdə cümlədə təyin, zərfin yerində işləndikdə isə zərflik olur.

Bu, o əvəzlikləri omonimdir: həm işarə bildirir, həm də əşyanı göstərmək üçün işlədilir. Bu əvəzliklər əşyanı göstərmək üçün işlədikdə ismin xüsusiyyətlərini daşıyır. Bu halda onlar cəmlənir, hallanır və cümlədə mübtəda, tamamlıq və xəbər olur. Məsələn: Bu (nə?), uşağın kitabıdır. Bundan (kimdən?) muğayat ol. Onu (nəyi?) bura gətir. Təriflədiyim oğlan budur (kimdir?).
Mübtəda vəzifəsində işlədilən o, bu əvəzliklərindən sonra fel və köməkçi nitq hissələrindən başqa, qalan nitq hissələri ilə ifadə olunan cümlə üzvü gəldikdə vergül qoyulur.

Sual əvəzlikləri:Sual bildirən sözlərə deyilir.Bütün əsas nitq hissələrinin sualları, yəni kim? nə? hara? necə? nə cür? neçə? neçənci? niyə? nə zaman? nə etmək? və sual əvəzlikləridir. Bunlar isim, sifət, say və zərf, sual şəklində əvəz edir və ya cavab almaq məqsədi ilə işlədilir. Sual əvəzlikləri əvəz etdiyi nitq hissəsinin qrammatik xüsusiyyətlərini daşıyır. Məsələn, kim? nə? hara? ismin sualı olduğu üçun hallanır, cəmlənir, mənsubiyyətə görə dəyişir, cümlədə mübtəda və tamamlıq
olur: Kim dərsə gəlməyib? Kimi istəyirsiniz? Kimin var? Haranız ağrıyır? Nələri görmədik? Kimlər gəldi, kimlər getdi?

Sual əvəzlikləri başqa nitq hissələri ilə yanaşı, əvəzliklərin də yerində işlənir.
Məsələn: Hamı gülür. Kim gülür? Biz kəndə gedirik. Kim kəndə gedir?

Təyini əvəzliklər:Əşyanı ümumi şəkildə təyin etmək üçün işlədilir. Hər, bütün, filan, öz sözlərindən ibarətdir. Məsələn: Hər gözəlin bir eybi oiar. Mənim üçün bütün günlər gözəldir. Hər gülün öz ətri var. Təyini əvəzliklər hansı? sualına cavab verir və cümlədə təyin olur. Təyini əvəzliklər hallanmır.

Qayıdış əvəzliyi:Mənsubiyyət şəkilçisi qəbul etmiş öz əvəzliyinə deyilir: özüm, özün, özü, özümüz, özünüz, özləri. Qayıdış əvəzliyi ismin yerində işlənir və ismin xüsusiyyətlərini daşıyır: hallanır, cümlədə mübtəda və tamamlıq olur: Özüm (kim?) gəlmişəm. Özündən (kimdən?) küssün.

***Qeyd:*** Mən, sən, o şəxs əvəzliklərinin və qayıdış əvəzliyinin qəbul çıxışlıq hal şəkilçisi [-nan$^2$] şəklində tələffüz olunur məndən - [mənnn], səndən - [sənnən], ozümdən - .[özümnən], özündən - [özünnən] və s. əvəzliyinin cümlədə rolu:
əvəzlik cümlədə bütün cümlə üzvləri vəzifəsində işlənir. Şəxs, qeyri-müəyyən, inkar və qayıdış əvəzlikləri mübtəda, tamamlıq və xəbər; işarə əvəzlikləri və təyini əvəzliklər, əsasən, təyin; sual əvəzlikləri isə bütün cümlə üzvləri olur. Əvəzliyin təhlil qaydası: əvəzlik aşağıdakı qaydada təhlil

olunur: 1.Hansı nitq hissəsini əvəz etməsi və sualı 2. Quruluşca növü 3. Mənaca növü 4.Halı mənsubiyyət şəkilçisi (əgər varsa) 5. Cümlədə rolu

Bir nümunə: O, sinifdə hamıdan biliklidir. O - ismin yerində işlənmişdir, kim? sualma cavab olur. Quruluşca sadədir, şəxs əvəzliyidir. Adlıq haldadır, cümlədə mübtədadır.
Hamıdan - ismi əvəz etmişdir, kimdən? sualma cavab olur. Quruluşca sadədir, qeyri-müəyyən əvəzlikdir. Çıxışlıq haldadır, cümlədə tamamlıqdır.

# FEL

Fel qrammatik mənasına görə hərəkət bildirən əsas nitq hissəsidir, fellər müxtəlif şəkil və zamanlarda işlədilənnə etmək? nə etdi? nə edəcək? və s. suallarından birinə cavab olur, felləri başqa nitq hissələrindən fərqləndirən digər qrammatik xüsusiyyətlər bunlardır

1. Şəxsə və kəmiyyətə görə dəyişir. Məsələn: Mən yazıram, və s
2. Təsdiq və inkarda olur. Məsələn: yazmaq - yazmamaq, gəlmək-gəlməmək və s.
3. Zaman bildirir (keçmiş, indiki, gələcək). Məsələn: yazdı, yazır, yazacaq va s.
4. Təsirli və təsirsiz olur. Məsələn: yazmaq (nəyi?), baxmaq (nəyə?) və s.

Fellər də isimlər kimi dilimizdə çoxluq təşkil edir.
Felin leksik mənaca növləri: Feillərin leksik mənaca aşağıdakı növləri var:

1. İş bildirən fellər: yonmaq, doğramaq, qazmaq, kəsmək, biçmək, tikmək və s.
2. Hərəkət bildirən fellər: qaçmaq, getmək, gəlmək, oynamaq, qalxmaq, enmək və s.
3. Nitq bildirən fellər: danışmaq, demək, çıxış etmək, pıçıldamaq, qulaq asmaq və s.
4. Təfəkkür bildirən fellər: xatırlamaq, düşünmək, yada salmaq, fikrə getmək, duymaq, hiss etmək və s.
5. Hal-vəziyyət bildirən feillər: ağlamaq, gülmək, sevinmək, ağarmaq, qızarmaq, utanmaq və s.

Bütün feillərdə hərəkətvardır, lakin onların bəzilərində iş və hərəkət, digərində isə təfəkkür, hal-vəziyyət və s. daha qabarıq şəkildə özünü göstərir.

Təsirli və təsirsiz fellər:

Hərəkətin obyektə münasibətinə görə fellər təsirli və təsirsiz olur.Özündən asılı olan sözlərin ismin təsirlik halmda işlənməsini tələb edən fellərə təsirli fellər deyilir.Təsirli fellərin birbaşa tələb etdiyi obyekt ismin təsirlik halının suallarına cavab olur. Məsələn: Uşağı (kimi?) gördüm. Məktubu (nəyi?) yazır. Su (nə?) içirsən? və s.

Özündən asılı olan sözlərin ismin təsirlik halmda deyil, başqa hallarda işlənməsini tələb edən fellər isə təsirsiz fellər adlanır.Təsirsiz fellərlə əlaqədə olan sözlər ismin, əsasən, yönlük, yerlik və çıxışlıq hallarının suallarına cavab olur. Məsələn: Kitaba (nəyə?) baxıram. Kənddə (harada?) yaşayırıq. Evdən (haradan?) gəlirsən? və s.

Bəzi təsirsiz fellər -dır$^4$, -ır$^4$ şəkilçilərinin köməyi ilə təsirlifellərə çevrilir. Məsələn: inanmaq (nəyə?) - inandırmaq (kimi?), çatmaq (haraya?) - çatdırmaq (nəyi?), gülmək (kimə?) -güldürmək (kimi?), qaçmaq haraya?). - qaçırmaq (kimi?), bişmək (harada?) - bişirmək (nəyi?), köçmək (haraya?) - köçürmək (kimi? nəyi?) və s.

-ıl$^4$, -ın$^4$ şəkilçilərinin köməyi ilə bəzi təsirli fellər də təsirsiz fellərə çevrilir. Məsələn: açmaq (nəyi?) - açılmaq (harada?), çəkmək (nəyi?) - çəkilmək (haraya?) almaq (nəyi?) -alınmaq (haradan?), silmək (nəyi?) - silinmək (harada?) və s.

Təsdiq və inkar fellər:

Fellər hərəkətin icra olunub - olunmaması baxımından iki cür olur: təsdiq fellər, inkar fellər. Təsdiq fellər hərəkətin icra olunmasını bildirir. Təsdiq fellərin xüsusi şəkilçisi yoxdur. Məsələn: yaz, oxu, baxacaq, görmüşsən və s.

İnkar fellər hərəkətin icra edilmədiyini bildirir və vurğu qəbul etməyən -ma$^2$ şəkilçisi ilə düzəlir. Məsələn:yazma. getmə, almadım, gəlmirəm, baxmayacaq, görməmişsən və s.

Felin lazım, bəzən də vacib şəklinin inkarı -ma$^2$ şəkilçisi ilə yox, deyil sözü ilə düzəlir alası deyil, getməli deyil və s.

İndiki və qeyri-qəti gələcək zamanda işlənərkən -ma$^2$ şəkilçisindəki samit düşür. Məsələn

gəl+ir gəl+m+ir,
oxu+yur oxu+m+ur,
yaz+ar+am yaz+m+aram,
bax+ar+ıq bax+m+arıq,
gəl+ər gəl+m+əz,
oxu+yar+lar oxu+m+az+lar

Son iki nümunədən göründüyü kimi, qeyri-qəti gələcək zamanda üçüncü şəxsin təkində və cəmində -ar zaman şəkilçisinin tərkibindəki r samiti z samitinə keçir.

***Qeyd:*** Felin inkar şəkilçisi -ma2 ilə isim düzəldən -ma2 şəkilçisi omonimdir.

## KÖMƏKÇİ NİTQ HİSSƏLƏRİ

Köməkçi nitq hissələri aşağıdakı xüsusiyyətlərinə görə əsas nitq hissələrindən fərqlənir:

1. Leksik mənası olmur.
2. Ayrılıqda cümlə üzvü kimi işlənmir və müstəqil suala cavab vermir.
3. Şəkilçi qəbul etmir və dəyişmir.

Leksik mənası olmayan, ayrılıqda cümlə üzvü kimi işlənməyən, şəkilçi qəbul etməyən söz qruplarına köməkçi nitq hissələri deyilir.

Qoşma, bağlayıcı, ədat, modal sözlər və nida köməkçi nitq hissələridir. Köməkçi nitq hissələrinin qrammatik mənası olur.

## Qoşma.

İsmin müxtəlif hallarında olansözlərə qoşularaq, müəyyən məna çalan əmələ gətirən köməkçi nitq hissəsinə qoşma deyilir.Qoşmalar, əsasən, isimlərə və ismi əyəz edən əvəzliklərə, məsdərlərə, bəzi zərflərə, eləcə də isimləşən başqa sözlərə də qoşula bilir. Məsələn: Onlar Akiflə razılaşdılar. Oxumaq

üçün kitabxanaya getdik. Dünənə kimi hava isti idi. Oxuduğuma görə imtahanda yaxşı nəticə göstərdim.

Qoşmaların ismin hallarında işlənməsi:Qoşmalar ismin dörd halında olan sözlərə qoşulur.

1) Adlıq halda işlənən qoşmalar. Adlıq halda olan sözlərə qoşulan qoşmalar bunlardır: qədər, kimi,;-tək, üçün, ilə (-la, -lə). Bu qoşmalardan ilk üçü- qədər, kimi, -tək müqayisə, bənzətmə, tərz mənasını bildirir. Məsələn: Qızın dişləri mirvaritək ağappaq idi. Sevincindən quş kimi uçurdu.
-tək qoşması qoşulduğu sözlərə bitişik şəkildə yazılır. Bəzi sözlərə qoşulan -ca qoşması da müqayisə mənasını bildirir. Məsələn: Dəryaca ağlın olsa....
İlə qoşması birgəlik, vasitə mənasını bildirir. Məsələn: Əli ilə işim var. Lənkərana gəmi ilə gedirik.
İlə qoşması samitlə bitən isimlərə qoşulduqda həm ayrı, həm də bitişik (-la, -lə şəklində) yazılır. Məsələn: Nurlan ilə - Nurlanla və s. Saitlə bitən sözlərdə isə bu qoşma həmişə ayrı yazılır. Məsələn: qonşu ilə, Vüsalə ilə və s. ilə qoşması ayn yazıldıqda [ynan, ynən] şəklində tələffüz olunur. Məsələn: atası ilə [atasıynan], gəmi ilə [gəmiynən]. Qoşma bitişik yazıldıqda isə -nan, -nən şəklində tələffüz olunur. Məsələn: qardaşımla [qardaşımnan], qələmlə [qələmnən] və s.
üçün qoşması isə səbəb və məqsəd mənasım bildirir. Məsələn: anam üçün, oxumaq üçün və s.
Üçün qoşması samitlə bitən sözlərdən sonra [-çın$^4$], saitlə bitən sözlərdən sonra isə [yçın$^4$] şəklində tələffüz olunur. Məsələn: atam üçün [atamçün], qonşu üçün [qonşuyçün] və s.

2) Yiyəlik halda işlənən qoşmalar. Yiyəlik halda olan sözlərə qoşulan qoşmalar bunlardır: qədər, kimi, -tək, üçün, ilə (-la, -lə). Bu qoşmalardan ilk üçü - kimi, tək, qədər müqayisə, bənzətmə mənasım bildirir. Məsələn: Onun kimi dost çətin tapılar. Sultan sənin qədər çalışırdı. Onuntək adamlar bu vəzifəni yerinə yetirə bilərlər. İlə qoşması birgəlik, vasitə mənasını bildirir. Məsələn: Səninlə işim var. Onunla gəzməyə gedirdik və s.Üçün qoşması isə səbəb və məqsəd mənasını bildirir. Məsələn: sənin üçün, bizim üçün və s.

3)Yönlük halda işlənən qoşmalar. Yönlük halda olan sözlərə qoşulan qoşmalar bunlardır: qədər, kimi, -dək, -can$^2$, tərəf, doğru, qarşı, sarı, görə, əsasən, aid, dair, məxsus.
Qədər, kimi, -dək, -can$^2$ qoşmaları məsafə mənasım bildirir. Məsələn: Kəndə qədər (kimi) piyada getdik. Axşama qədər səni gözləmişəm və s.
Tərəf, doğru, qarşı, sarı qoşmaları yönəlmə, istiqamət mənalarını ifadə edir.
Məsələn: bağa tərəf (san), evə doğru, küləyə qarşı və s.
Görə qoşması səbəb və istinad bildirir: Xəstəliyinə görə onu evə buraxdılar. Rəhbərliyin əmrinə görə, bizi burada saxladılar və s. Əsasən qoşması da istinad bildirir: Qərara əsasən, onlara güzəştlər ediləcək. Tapşırığa əsasən biz buradayıq və s.

Aid, dair, məxsus qoşmalan da aidlik bildirir: Fəlsəfəyə dair mülahizələri var. Sənə aid olan kitablan apararsan. Ona məxsus dəftərlərə baxın.

Yönlük halda işlənən qoşmalardan -dək və -can$^2$ sözlərə bitişik şəkildə yazılır: evədək, axşamacan, kəndəcən və s.

4)Çıxışlıq halda işlənən qoşmalar:əvvəl, sonra, qabaq, bəri, başqa, savayı, ayrı, özgə, qeyri, ötrü. Bu qoşmalardan - əvvəl, sonra, qabaq, bəri zaman mənasını bildirir. Məsələn: Mən Orxandan sonra (qabaq, əvvəl) gəldim. 2007-ci ildən bəri ölkəmizdə çoxlu dəyişikliklər baş verib və s.

Ötrü qoşması səbəb-məqsəd mənasını bildirir. Məsələn: Ana uşaqlarından ötrü özünü oda-közə atır. Qoşmalardan başqa, savayı, ayrı, özgə, qeyri isə fərqlənmə mənasında işlənir. Məsələn: Nurgüldən başqa, (qeyri, savayı, özgə) hamı yatmışdı. Qoşmalar qoşulduğu sözlə birlikdə bir cümlə üzvü olur.

Məsələn: Bu kitablar şagirdlər üçündür cümləsində üçündür qoşmasını ayrılıqda xəbər kimi götürmək olmaz, o, şagirdlər sözü ilə birlikdə sadə ismi xəbərdir.

Qoşmaların orfoqrafıyası.

Qoşmalar aid olduqları sözlərdən ayrı yazılır. Dək, can (cən) qoşmaları bu cəhətdən istisnadır. Onlar əlaqədar olduqları sözlərlə bitişik yazılır.

İlə qoşmasının yazılışında iki cəhət var:

a)İlə qoşması saitlə bitən sözlərdən ayn yazılır.

b)İlə qoşması samitlə bitən sözlərdə iki cür yazılır:

- Saitlə bitən sözlərdə olduğu kimi, samitlə bitən sözlərdən də ayn yazılır.
- İlə qoşması, ixtisar formasında (-la, -lə) samitlə bitən sözlərlə bitişik yazılır.

Qoşmaların qrammatik mənaları.

Qoşmaların hər birinin ümumi qrammatik mənası var. Ancaq bu mənalann reallaşmasında qoşmalann aid olduğu sözlərin mənası da rol oynayır. Məsələn, kimi qoşması aid olduğu sözlərdən asılı olaraq, müqayisə, zaman, məkan, tərz mənalan bildirə bilər. Qoşmaların bəziləri arasında sinonimlik əlaqə də var: san- doğru, kimi-cən Bunlar da göstərir ki, qoşmaların qrammatik məna qruplan arasında qəti fərqlər qoymaq olmaz. Azərbaycan dilində, şərti də olsa, qoşmaların aşağıdakı məna fərqlərini göstərmək olur.

1. Qoşmalann məkan münasibəti bildirmələri: qədər, dək, cən, san.
2. Qoşmalann zaman münasibəti bildirməsi: kimi, dək, cən.
3. Qoşmalann müqayisə bildirməsi: kimi, tək.
4. Qoşmalann səbəb və məqsəd bildirməsi: üçün, ötrü, görə.
5. İlə qoşması birgəlik, vasitə; aid, dair qoşmalan aidlik, barəsində, haqqında mənalannda işlənir.

## Bağlayıcı

Bağlayıcı - cümlə üzvləri və ya cümlələr arasında əlaqə yaradan, onlan qrammatik cəhətdən bir-birinə bağlayan köməkçi nitq hissəsidir.

Cümlədəki vəzifəsinə (sintaktik vəzifəsinə) görə bağlayıcılar iki növə bölünür: tabesizlik bağlayıcılan, tabelilik bağlayıcıları.

Tabesizlik bağlayıcıları həm sadə cümlədə, həm də tabesiz mürəkkəb cümlələrdə işlənir. Sadə cümlələrin həmcins üzvlərini, tabesiz mürəkkəb cümlələrin isə tərkib hissələrini bir-birinə bağlayır.

Tabelilik bağlayıcıları isə yalnız tabeli mürəkkəb cümlələrdə işlənir və onlann tərkib hissələrini bir-birinə bağlayır.

Bağlayıcının mənaca növləri.

Tabezbesizlik bağlayıcılarının mənaca aşağıdakı növləri var:

1. Birləşdirmə bağlayıcıları: və, ilə (-la, -lə). Məsələn: Şagird üçün nizam-intizam və çalışqanlıq başlıca şərtdir. Aliyə ilə Aydın bir sinifdə oxuyurlar.

Və bağlayıcısı istər sadə cümlənin həmcins üzvlərini, istərsə də tabesiz mürəkkəb cümlənin tərəflərini bir-birinə bağlayır. Məsələn: Günay və Aysu rəfiqədirlər (sadə cümlə). Zəng vuruldu və şagirdlər sinfə daxil oldular (tabesiz mürəkkəb cümlə). İlə bağlayıcısı isə yalnız sadə cümlənin həmcins üzvlərini bir-birinə bağlayır.

2. Qarşılaşdırma bağlayıcıları: amma, ancaq, lakin, halbuki, isə. Məsələn: Qonaq onu tanıdı, amma (ancaq, lakin) heç nə demədi.
3. Bölüşdürmə bağlayıcıları: ya, ya da, ya da ki, və ya, gah, gah da, gah da ki, istər, istərsə, istərsə də. Məsələn: Ya yaz, ya da diqqətlə qulaq as. Gah gün çıxırdı, gah da yağış yağırdı, İstər şagirdlər, istərsə də müəllimlər bu mövzunu çox xoşlayırlar.
4. İştirak bağlayıcıları: həm, həm də, həm də ki, o cümlədən, hətta, habelə, həmçinin, da-da (də-də), da, də. Məsələn: Uşaq həm gündüzlər, həm də gecələr dincəlmir. Bütün kənd camaatı, hətta qocalar düşmənə qarşı vuruşur. Baba da, nəvə də sevinirdi, iclasda kadr məsələsi də müzakirə olundu. Onlar da zəlzələdən zərər çəkənlərə yardım göndərdi.
5. İnkarlıq bağlayıcıları: nə, nə də, nə də ki. Məsələn: Uşaq nə yazır, nə də oxuyur. Bu bağlayıcıların işləndiyi cümlələrin xəbəri daha çox təsdiqdə olur.
6. Aydınlaşdırma bağlayıcıları: yəni, yəni ki, məsələn. Məsələn: Bakının zəngin sərvəti, yəni nefti var. O, bir çox şairlərin, məsələn, Fuzulinin şeirlərini əzbər bilir.

Tabelilik bağlayıcılarının mənaca növləri bunlardır:

1. Səbəb bağlayıcıları: çünki, ona görə ki, ona görə də, ondan ötrü ki, onun üçün ki, buna görə də. Məsələn: Uşaq dərsə getməmişdi, çünki başı ağrıyırdı. Mən təyinatımı kəndə aldım, ona görə ki, orada müəllimə ehtiyac var.
2. Şərt bağlayıcıları: əgər, hərgah, indi ki, madam ki, bir halda ki və s. Məsələn: Əgər belə oxusan, əlaçı olarsan, indi ki, sən gedirsən, mən getmirəm.- 3
3. Güzəşt bağlayıcıları: hərçənd, hərçənd ki və s. Məsələn: Hərçənd ki, o, heç kimi eşitmir, yenə də xahiş edərik.
4. Aydınlaşdırma bağlayıcıları: ki, belə ki. Məsələn: Müəllim dedi ki, sabah inşa yazacaqsınız, imtahanın nəticələri yaxşıdır, belə ki, şagirdlərin çoxu müsbət qiymət alıblar.

Bağlayıcının mənaca növləri və orfoqrafiyası.

Bağlayıcılar quruluşca sadə və mürəkkəb olur. Və, ilə, amma, ancaq, lakin, gah, yəni, hərçənd, hətta, əgər, çünki bağlayıcıları quruluşca sadədir. Ayn yazılan indi ki, ona görə ki, belə ki, yəni ki, həm də, ya da, istərsə də, gah da və bitişik yazılan halbuki, habelə, hərgah bağlayıcıları isə mürəkkəb bağlayıcılardır. Bağlayıcıların bəzilərini vergüllə əvəz etmək olur. Məsələn: Zəng vuruldu və dərs başlandı cümləsindəki və bağlayıcısını vergüllə əvəz etmək olar.

Cümlədə təkrar olunan (qoşa işlənən) həm, həm də, ya, ya da, gah, gah da, nə, nə də və s. bağlayıcılarının ikincisindən əvvəl vergül qoyulur. Məsələn: O həm oxuyur, həm də işləyir.

Amma, ancaq, lakin bağlayıcılarından əvvəl vergül qoyulur. Məsələn: Göy guruldadı, amma yağış yağmadı. Bu bağlayıcılar bir - birini əvəz edə bilir, yəni sinonim bağlayıcılardır.
Qoşa işlənən da, də bağlayıcılarından sonra vergül qoyulur. Məsələn: Uşaq da, cavan da, qoca da azadlıq istəyir.

Mürəkkəb cümlələrdə işlənən çünki, ona görə ki, ona görə də bağlayıcılarından əvvəl vergül qoyulur. Məsələn: Körpə dincəlmirdi, çünki qulağı ağrıyırdı.

***Qeyd 1:*** ilə bağlayıcısı və ilə qoşması omonimdir. Bunları bir-birindən fərqləndirmək üçün nəzərə almaq lazımdır ki, bağlayıcı kimi işlənən ilə sözünü (və ya onun qısa -la, -lə şəklini) və bağlayıcısı ilə, eləcə də, vergüllə əvəz etmək mümkündür. Məsələn: Tural ilə Anar qardaşdır - Tural və Anar qardaşdır, ilə qoşmasını isə və bağlayıcısı ilə əvəz etmək mümkün deyil. Məsələn: Əli ilə vacib işim var.

***Qeyd 2:*** Ki bağlayıcışı ilə sifət düzəldən -kı$^4$ şəkilçisini qarışdırmamalı. Sifət düzəldən -kı$^4$ şəkilçisi dörd cür yazılır və əsasən, zaman bildirən sözlərə artırılır: səhərki (görüş), axşamkı (qonaq) və s. Bu şəkilçi yiyəlik halda olan əvəzliklərə də qoşulıir: bizimki, onlarınkı, özümüzünkü və s.

Ki bağlayıcısı həmişə mürəkkəb cümlənin tərkib hissələrini bir-birinə bağlayır, ayrı yazılır və ondan sonra vergül qoyulur.

## Ədat

Sözlərin və cümlələrin təsir gücünü qüvvətləndirən köməkçi nitq hissəsinə ədat deyilir.

Ədatlan işləndiyi cümlələrdən çıxarsaq, həmin cümlələrin mənası müəyyən dərəcədə zəifləyə bilər. Məsələn: Artıq gözlədiyimiz gün gəlib çatdı. Bu cümləni artıq ədatı olmadan da işlətmək olar və ondakı məna dəyişməz, yalnız bir qədər zəifləmiş olar. Deməli, ədatlann əsas vəzifəsi cümlədəki mənam daha da qüvvətləndirmək və dinləyicinin diqqətini müəyyən bir cəhətə daha artıq yönəltməkdir.

Ədatın mənaca növləri.

Ədatların mənaca aşağıdakı növləri var:

1.Qüvvətləndirici ədatlar: artıq, axı, ən, lap, daha, da, də, nə, hətta, necə, ha, ki, - ca$^2$, belə və s. Məsələn: Axı bizim günahımız nədir? Necə dedin! Ha gözlədim, sən gəlmədin. Bizə bircə xal lazımdır, indicə onu gördüm. Biz ki belə danışmamışdıq. Hətta sən də bu işdən xəbərsizsən. Nə durmusan, oxu da. Bu barədə bir kəlmə belə danışma və s.

2.Dəqiqləşdirici ədatlar: elə, əsl, məhz.
Məsələn: Elə hamı mən deyəni deyir. Ora əsl sənin yerindir. Bu işi məhz ona tapşırmaq olar və s.

3.Məhdudlaşdırıcı ədatlar: ancaq, yalnız, təkcə, tək bircə, bir və s. Məsələn: Onu dəyişdirsə, ancaq mühit dəyişdirər. Bircə saf mənəviyyat bizi bu bəlalardan qurtara bilər. Təkcə Anar bütün tapşırıqları düzgün həll etmişdi və s.

4.Sual ədatları: bəs, məgər, yəni, -mı$^4$ və s.

Məsələn: Bəs dünən niyə bizə gəlməmişdin? Məgər mən uşağam? Yəni, doğrudan, sən həmişəlik gedirsən? Tapşırıqları yazdınızmı? və s.

5.Əmr ədatları: di, qoy, gəl, gəlin, gör, görün, bax, qoysana, ha, gəlsənə, -sana[2] və s.
Məsələn: Di başla. Qoy dərsini oxusun. Bax, gözləyəcəyəm! Gəl bu işdən əl çəkək. Gəlsənə dostuna zəng edək. Oxusana, Dərsinizi oxuyun ha. və s.

6.Arzu ədatları: kaş, kaş ki, təki, barı və s.
Məsələn: Kaş biz də orada olaydıq! Təki torpaqlarımız azad olunsun. Ban bu günləri boş keçirmə və s.

7.Təsdiq və inkar ədatları: bəli, bəli də, hə, yox, xeyr, heç, heç də və s. Ədatlardan sonra qrammatik prinsipə görə vergül qoyulmur. Lakin bəli, hə, yox, xeyr ədatlarından sonra intonasiyanın tələbi ilə vergül qoyulur. Məsələn: Bəli, biz azadlığımıza qovuşduq. Hə, de görüm, mən deyən oldu, olmadı?! Xeyr, sən yanılırsan. Bəli də, ayağı çarıqlı kiçik bir ölkə, Böyük Firdovsilər yaratdı, bəlkə! (S.Vurğun) və s.

Bəzən eyni bir ədat müxtəlif mənalarda işlənə bilər. Məsələn: Bu ki bizim Əlidir! cümləsində ki ədatı qüvvətləndirmə mənasım, Ay uşaq, xəstələnməmisən ki? cümləsində isə sual mənasını bildirir. Ha ədatı  həm qüvvətləndirici, həm də əmr ədatı kimi işlənə bilər. Felin əmr şəkli ilə işləndikdə bu ədat əmr ədatı, digər sözlərlə işləndikdə isə qüwətləndirici ədat olur. Məsələn: Evi təmizləyin ha (əmr). Sənə güvənirəm ha. (qüwətləndirici)

***Qeyd:*** Qoysana və gəlsənə sözləri bəzən yalnız ədat kimi, yerinə görə isə fel + ədat kimi işlənir. Məsələn: Qoysana bir az dincələk (ədat). Gəlsənə bu gün ora getməyək (ədat). Çantanı yerə qoysana (qoy-fel f sana-ədat). Sən də evə gəlsənə (gəl-fel+sənə-ədat).

## Modal sözlər

Danışanın  ifadə etdiyi fikrə münasibətini bildirən sözlərə modal sözlər deyilir. Modal sözlərin mənaca aşağıdakı növləri vardır:

1.Təsdiq bildirən modal sözlər: əlbəttə (əlbəttə ki), doğrudan (doğrudan da), həqiqətən, sözsüz, şəksiz, şübhəsiz (şübhəsiz ki), doğrusu, düzü və s. Məsələn: Əlbəttə ki, düz sözə zaval yoxdur. Doğrudan da, insan gücü tükənməzdir. Sözsüz, qələbə gec-tez bizim olacaqdır və s.

2.Güman və şübhə bildirən modal sözlər: gərək (gərək ki), yəqin (yəqin ki), görünür, deyəsən, ehtimal ki, bəlkə, güman ki, olsun ki, və s. Məsələn: Görünür, düşmən bizim zəif yerimizi bilir. Gərək ki, sən onu tanıyırsan. Deyəsən, yağış yağacaq. Ola bilsin ki, görüşümüz sabah baş tutmadı və s.

3.Nəticə, ümumiləşdirmə bildirən modal sözlər: deməli, yaxşı, demək xülasə beləliklə, ümumiyyətlə, bir sözlə, nəhayət və s. Məsələn: Deməli, qərarımız qətidir Beləliklə, biz oram tərk etməli olduq. Nəhayət, gözlədiyimiz gün gəlib çatdı və s.

4.Fikrin mənbəyini bildirən modal sözlər: məncə, səncə, bizcə, fikrimizcə və s. Məsələn: Məncə, o, yalan danışmır. Fikrimizcə, bu məsələnin həlli asandır və s.

5.Sıra və ardıcıllıq bildirən modal sözlər: birincisi, əwəla, ikincisi və s. Məsələn: Birincisi, o, hələ uşaqdır, ikincisi də, günahkar özünsən.

6.Təəssüf bildirənlər: təəssüf ki, heyif ki, əfsus ki və s. Təəssüf ki, biz mənəviyyata az əhəmiyyətveririk və s.

7.Bənzətmə və ya müqayisə bildirən modal sözlər: sanki, elə bil, elə bil ki və s. Məsələn: Sanki ona dünyanı bağışladılar. Elə danışır, elə bil ki, uşaqdır və s.

Modal sözlər quruluşca sadə və mürəkkəb olur. Bir sözdən ibarət olan modal sözlər quruluşca sadədir: əlbəttə, deyəsən, xülasə, deməli, görünür və s. Bəlkə də, doğrudan da, şübhəsiz ki, bir sözlə, ola bilsin ki, sözsüz ki və s. isə mürəkkəb modal sözlərdir.

Modal sözlər cümlə üzvlərindən vergüllə ayrılır və cümlənin əvvəlində, ortasında, sonunda işlənə bilir. Məsələn: Doğrusu, mən yorulmuşam. Mən, düzü, bu yerləri I tanımıram. Sən öz istəyinə çatacaqsan, əlbəttə.

Bütün modal sözlər ayrı yazılır.

Görünür, deyəsən, demək, deməli, olmaya, demə, görəsən sözləri həm fel, həm də modal söz kimi işlənə bilir. Xülasə sözü isə həm isim (məsələn, qəzetlərin I xülasəsi) həm də modal söz kimi işlənə bilir.

## Nitq mədəniyyətinin məqsəd və vəzifələri

Nitq mədəniyyəti insanlara məxsus ümumi mədəniyyətin ən vacib və aparıcı tərkib hissələrindən biridir. Bu anlayışa danışıq mədəniyyəti ilə yanaşı,yazı mədəniyyəti də daxildir. Belə yüksək keyfiyyətə yiyələnən şəxs cəmiyyətin ictimai həyatında, onun hər hansı bir sahəsində fəal və məhsuldar iştirak etmək imkanına malik olur. Xüsusən, ziyalıların nitq mədəniyyətinə yiyələnməsi vacib sayılır. Yazıçılar, müəllimlər, aktyorlar, radio və televiziya işçiləri, jurnalistlər,bədii,başqaları onların danışığından, oxusundan, yazdıqlarından nümunə götürməlidirlər. Dilçilik ədəbiyyatında nitq mədəniyyəti anlayışı belə izah olunur: "Nitq mədəniyyəti tətbiqi dilçilik söz ustaları nitqinin təsirliliyi, obrazlılığı, ifadəliliyi, məntiqliyi, zənginliyi ilə fərqlənməli sahəsi olub, hər hansı konkret bir dilin orfoepik,orfoqrafik, leksik, qrammatik, üslubi və s. normalarını müəyyənləşdirən nəzəri axtarışlar və təcrübi tədbirlər kompleksidir". Bu tərifi başqa bir şəkildəifadə etmiş olsaq, deyə bilərik ki, nitq mədəniyyəti danışıq və yazı zamaniorfoqrafik və orfoepik qaydalara, qrammatik qayda-qanunlara, üslub normalarınaəməl etmək, zəngin söz ehtiyatına malik olmaq, nitqin etik normalarını gözləməkdir.
Nitq mədəniyyəti dilçiliyin praktik sahəsi olub, dildən ünsiyyət vasitəsi kimi istifadəqaydalarını öyrənir. Nitq mədəniyyətinə yaxşı yiyələnmək üçün dilin fonetik (orfoepik və orfoqrafik),leksik və qrammatik qayda - qanunlarını bilmək və nitq zamanı onlara əməl etmək zəruridir. Nitq mədəniyyətində dilçiliyin nəzəri fikirləri əməli (praktik)şəkildə həyata keçiri-lir. Buna görə də nitq mədəniyyəti dilçiliyin nəzəri yox, praktik sahəsi sayılır. Nitq mədə-niyyətində ayrı-ayrı dil faktları və ya hadisələri yox, dilçiliyin qayda-qanunları sistemi öyrənilir. Ümumiyyətlə, nitq mədəniyyətinin konkret predmeti yoxdur."Nitq mədəniyyətinin konkret predmetini müəyyənləşdirmək (Məsələn.fonetikanı, leksikam yaxud, qrammatika predmeti kimi) çox çətindir. Nitq mədəniyyətində bu və ya digər dil faktı hadisəsi yox, üsullar qayda-qanunlar sistemi öyrənilir. Nitq mədəniyyəti filologiya elminin praktik sahəsidir. Yəni nitq mədəniyyəti dedikdə hər şeydən əvvəl filologiyanın dildən ünsiyyət vasitəsi kimi istifadə qaydalarını, elmin əsasında öyrənilən sahəsi nəzərdə tutulur. Eyni zamanda həmin anlayışdan bu və ya digər nitq təzahürünün keyfiyyətini bildirmək üçün də istifadə edilir.

Bildiyimiz kimi, dil lüğət fondu, qrammatik quruluşu, fonetik sistemi ilə təşəkkül tapmış ünsiyyət vasitəsidir. Nitq isə xalqın hər bir nümayəndəsinin bu ünsiyyət vasitəsindən fərqli istifadəsidir, ayrı-ayrı insanların danışığıdır.Hər hansı bir xalqın milli mədəniyyətinin göstəricilərindən biri də gözəl nitqdir.Gözəl nitq üçün, əsasən, iki şərt tələb olunur:

1. Dilin özünün ifadə imkanlarının genişliyi, yəni hər hansı bir fikri ifadə etmək imkanının olması.
2. Bu dildə danışanın yüksək hazırlığı, yəni dilin ifadə imkanlarından düzgün şəkildə istifadə etməsi.

Hər hansı dilin fonetik, leksik (yaxud leksik-semantik), qrammatik, eləcə də orfoqrafik və orfoepik qayda-qanunları vardır. Onları öyrənmədən, bilmədən nitq mədəniyyətinə yiyələnmək mümkün deyildir. Haqqında danışılan qayda-qanunlar müəyyən tarixi təkamülün məhsulu olub, cəmiyyətin normal ünsiyyətinə xidmət edir.

Azərbaycan dili fonetik, leksik və qrammatik quruluşuna görə dünyanın inkişaf etmiş və zəngin dillərindən biri sayılır. Bu dil özünəməxsus musiqili ahəngi, səlisliyi və axıcılığı ilə diqqəti cəlb edir. Çox-çox qədim zamanlarda dilimizdə şifahi xalq ədəbiyyatı nümunə-ləri, sonralar isə yazılı ədəbiyyat yaranmışdır. İstər şifahi, istərsə də yazılı ədəbiyyatımız xalqımızın gözəl və zəngin nitq mədəniyyətinin olduğunu sübut edir.

Milli mədəniyyətin, o cümlədən də nitq mədəniyyətinin qoruyucusu, daşıyıcısı bütövlükdə xalqdır. Xalqın hər bir nümayəndəsi nitq mədəniyyətinə dərindən yiyələnməli və onu layiqli şəkildə qorumalıdır.

Bu mədəniyyəti inkişaf etdirməkdə, yaymaqda söz ustalarının böyük xidmətləri olmuşdur.

Nitq mədəniyyəti nitqin müxtəlif şəraitində məzmun və məqsədə uyğunolaraq ədəbi dilin yazılı və şifahi formalarından, ifadəlilik vasitələrindən istifadə edəbilmə bacarığıdır.Bu anlayış dilin mənimsənilməsinin iki pilləsini özündə ehtiva edir:

1)düzgün nitq, yazan, oxuyan və danışanın nitq normalarını gözləməsi;

2)nitq məharəti.

Təkcə nitq normalarını deyil, həm də mövcudvariantlardan məzmun baxımından dəqiq, üslub və situativlik cəhətdən dahauyarlı dil vahidini seçib işlədə bilmək. Nitq mədəniyyəti normativ qrammatika iləüslubiyyatın vəhdətidir. Başqa bir mənbədə mədəni nitq, nitq mədəniyyəti anlayışı belə izah olunur. "Nitq mədəniyyəti - nitqin ədəbi dil normalarına uyğunluğu, dilin ifadəvasitə və imkanlarından nitqin məqsəd və məzmununa müvafiq surətdə istifadəetmək bacarığı; dil səviyyələrinin və onlara daxil olan vahidlər sisteminin formalaşdırılması, təkmilləşdirilməsi problemlərini, dil hadisə və proseslərinininkişaf xəttini, üslubiyyat məsələlərini araşdıran dilçilik bəhsi". Bu tərif nitqmədəniyyəti anlayışını ehtiva etmək baxımından daha dəqiq və əhatəlidir.

Nitq mədəniyyəti insanın yüksək ictimai mədəniyyəti, təfəkkür mədəniyyəti, dilə şü-urlu sevgisi, ən yüksək keyfiyyətdir. Böyük Britaniyada qadınların nitqi ilə bağlı aparılan sosioloji tədqiqatlar göstərmişdir ki, nə qədər nitqdüzgündürsə qadın şəxsi və professional həyatda bir o qədər xoşbəxtdir. Bunəticəni, şübhəsiz, dilin bütün daşıyıcılarına aid etmək olar. İnsanın nitqi onun içdünyasını aşkarlayan başlıca vasitədir. Adamları tanımaq, onlara bələd olmaqüçün, hər şeydən əvvəl, ünsiyyətə girmək, təmasda olmaq lazımdır. Antik dövrünböyük filosofu Sokrat həmişə deyərmiş: "Ey insan danış səni tanıyım". Həzrət Əlibuyururdu ki, hər kəs öz dilinin altında gizlənib. Danışmayınca

onun ağıllı və yaağılsız olması məlum olmur. Tarixi inkişafın bütün dövrlərində nitqə, onungözəlliyinə xüsusi diqqət yetirilmiş, qiymət verilmişdir.“Qabusnamə”də deyilir: “Sözü ən gözəl tərzdə söyləmək lazımdır ki, həmsöz anlayan olasan, həm də söz anladasan’jgl Maraqlı və canlı danışıq aləmi səslərin deyiliş tərzi, işlənmə forması ilə çox bağlıdır. K.S.Stanislavskinin dediyi kimi, “sadə və gözəl danışığı bacarmaqözü bir elmdir və onun xüsusi qanunları var”.A.P.Çexov “Gözəl danışığa etinasız yanaşan adamlar özlərini insana layiqoia biləcək ən ali, nəcib bir zövqdən məhrum edirlər” fikrini söyləmişdir.Bir latın atalar sözündə deyilir ki, şair anadan şair doğulur, natiqlər isətədricən yetişir. Buradan aydın şəkildə bəlli olur ki, gözəl danışığa yiyələnməkhəyatda qazanılır və hər kəsin özündən asılıdır. Lap qədim zamanlarda yaranmışbir zərb-məsəldə deyilir: “Sözün zahiri zərif, batini lətif olmalıdır”.

Nitq mədəniyyətinə yiyələnmək üçün dilin lüğət tərkibinə dərindən bələdlik, onun fonetik, leksik-semantik və qrammatik normalarına yiyələnmək, dil qanunlarını nitqdə düzgün tətbiq edə bilmək zəruridir. Söz ehtiyatı zəngin olan, sözlərin məna çalarlarını nitqində düzgün əlaqələndirməyi bacaran, geniş erudisiyalı insan öz fikrini çətinlik çəkmədən məntiqi cəhətdən ifadə edə bilmək qabiliyyətində olur.

Yaxşı nitqi, mədəni nitqi şərtləndirən bir sıra tələblər (əslində onlarmədəni nitqin keyfiyyətləridir) vardır ki, bunlar nitqin normativliyidir. Həmintələblər bunlardır: aydınlıq, düzgünlük, sadəlik, dəqiqlik,
yığcamlıq, zənginlik,təmizlik, münasiblik, ifadəlilik, orijinallıq, səmimilik və s. Yazılı nitq mədəniyyətiproblеminə həmçinin orfoqrafiya və durğu işarələrinə əməl edilməsi də daxildir.Bunlar hər biri ayrılıqda və hamısı birlikdə etalon səviyyəli nitqi yaradır ki, bunitqə yiyələnənlər natiqlik sənətində, müəllimlik fəaliyyətində və digər sahələrdə böyük uğurlar qazanırlar.

**Nitq haqqında anlayış.** Nitq - insanlar arasında dil vasitəsilə həvata keçirilən ünsivvət prosesidir.İlk cümlədən göründüyü kimi dil verbal ünsiyyət üçün vasitə, nitq isə həmin "prosesin öfcüdür. İnsanlar dilə öyrənməklə onun vasitəsilə ünsiyyət saxlaya bilirlər. Başqa sözlə onlar nitqə yiyələnmiş olurlar. Psixologiyada “nitq” və “dil” anlayışlarını fərqləndirirlər. Adətən, dili şərti danışıq işarələr sistemi kimi qəbul edirlər. Onun köməyi ilə insanlar üçün müəyyən əhəmiyyət və məna kəsb edən səs birləşmələri ifadə olunur. Dil cəmiyyət tərəfindən yaradılır. Dil ümumxalqa məxsus olduğu üçün həmin dilin ölməsi deməkdir. Xalqın aradan çıxması ilə dil ölü dilə çevrilir. Dil olduqca mürəkkəb quruluşa malikdir. Hər cür dil,hər şeydən əvvəl, özünün müəyyən mənalı söz sistemindən ibarət olan lüğət tərkibinə malikdir. Bu,həmin dilin leksikasını təşkil edir. Bunlarla yanaşı olaraq hər bir konkret dilin Özü üçün xarakterik olan səs və ya fonetık tərkibi də mövcuddur. Dil həcm etibarilə nitqdən çox genişdir. Çünki, dil ümumxalqa məxsusdur, nitq isə ayrıca fərdə aiddir. Dildə işlədilən sözlərin yalnız müəyyən bir qismi fərdin ünsiyyət prosesində istifadə edilir. Dildən fərqli olaraq nitqi ünsiyyət prosesinirfl özü hesab edirlər. Bu proses məlumat, göstəriş,sual,əmr və s. şəklində həyata keçir.Hər bir söz ümumiləşdirmə mahiyyətinə malikdir. Ona görə də nitq prosesində hər bir söz özünün müvafiq mənasında çatdırılmalıdır. Buna isə sözü müvafiq kontekstdə işlətməklə nail olmaq mümkündür. Nitqdə sözlərin mənasının köməyi ilə müvafiq məzmunu çatdırmaqla yanaşı danışdığımıza öz emosional münasibətimizi - də bildiririk. Nitq ünsiyyət prosesi kimi insanların fikir, təcrübə mübadiləsinə imkan yaradır. Nitqin əhəmiyyəti onun funksiyalarında özünü aydın göstərir. Adətən, dilin üç funksiyasını qeyd edirlər: l)dil ictimai tarixi təcrübənin mövcud olması,saxlanması və

verilməsi vasitəsidir 2)dil kommunikasiya eləcə də insanın davranışını tənzim etmək vasitəsidir 31dil intelllektual fəaliyyətin silahıdır. Dilin bu funksiyaları nitqin də fəaliyyət istiqamətini təyin edir. Mövcud psixoloji ədəbiyyata əsasən nitqin funksiyalarına aşağıdakıları aid etmək olar. Nitqin birinci funksiyası əşyaları,hərəkəti,vəziyyəti adlandırmaqdır. Bu nitqin signifikativ və ya semantik funksiva adlanır. Bu funksiya insan nitqini heyvanların ünsiyyətindən fərqləndirir. Heyvanların çıxardığı səs əşyaları deyil, onlann öz vəziyyətlərini bildirir. İnsanda isə müəyyən söz deyilərkən həmin sözlə bağlı hər hansı cismin, hadisənin təsəvvürləri canlanır. Nitqin sonrakı funksiyası onun ümumiləşdirmə funksiyasıdır. Nitq sözlərə əsaslındığına görə-daima ümumiləşdirməyə imkan yaradır. Nitqin mühüm funksiyaların hirj də kommunikativ funksiyadır. Bu funksiyada öz növbəsində məlumat vermə və fəaliyyətə təhrik etmə vəzifələrini yerinə yetirir. Nitq vasitəsi ilə hisslərimizi,arzu və istəklərimizi,bu və ya digər cismə,hadisəyə münasibətimizi bildiririk. Nəhayət nitq vasitəsi ilə başqalarına təsir edir,onların davranış və rəftarlarında müəyyən dəyişiklik yaradır,.hər hansı bir işi yerinə yetirməyə təhrik edirik. Bütün bu funksiyalarla yanaşı olaraq nitqin özünəməxsus xüsusiyyətləri də mövcuddur. Bunlara nitqin məzmunluluğu,anlaşıqlılığı,təsirliliyi və ifadəliliyini aid etmək olar.

Nitqin qavranılması və anlaşılması. Nitqin qavranılması, anlaşılması və mənimsənilməsi Özünəməxsus xüsusiyyətləri ilə fərqlənir. Aparılmış tədqiqatlar göstərmişdir ki, nitqin qavranılması qavrayış zamanı qarşıya qoyduğumuz məqsəddən, fəaliyyətimizin gedişində onun hansı funksiyanı yerinə yetirməsindən,qavranılan nitqin məzmunu, anaşıqlığı, emosionallığından, nitqi qavrama şəraitindən və qavrayanın şəxsi təcrübəsindən,qavrama ustanofkasmdan asılıdır. Nitqin qavranılması və anlaşılması insanın nitqə nə dərəcədə yiyələnməsindən, başqa sözlə nitq prosesində istifadə olunan dili nə dərəcədə mənimsəməsindən də asılıdır. Dili, onun fonetik,leksik,qrammatik qanunlarını mükəmməl mənimsəyən adam həmin dilin vasitəshə həyata keçirilən nitq prosesini asanlıqla və düzgün qavraya və anlaya bilir. Bu baxımdan ana dilində və xarici dillərdə nitqi qavramaq və anlamaq bir sıra xüsusiyyətlərinə görə bir-birləsindən fərqlənir. Ana dilinə birbaşa yiyələnən insan həm imitasiya həm də sistemli təlim prosesində onun bütün çalarlarına yiyələnir, nətjcədə müvafiq tələblərə əməl olunduqda bu dildə nitqi qavrama və anlama da o qədər çətinlik yaratmır. Xarici dilin mənimsənilməsi və qavranılması isə xeyli fərqlənir. Tanınmış psixolinqvist A.A.Leontyevin qeyd etdiyi kimi ikinci dilin öyrənilməsi onu öyrənməyə başlayan adamın yaşından asılı olaraq müxtəlif psixoloji məzmun kəsb edir. O ana dilin öyrənilməsi ilə paralel və ya azacıq gec baş verə bilər. Bu cür hallar iki dilli ailələr üçün adi haldır. Burada o psixolji cəhətdən ana dilinin mənimsənilməsi ilə oxşardır. İkinci dilin öyrənilməsi bir qədər sonra, məktəbəqədər yaş dövründə də başlaya bilər. Bu dövr dili, onun fonetika və qrammatikasını dərk etmədən birbaşa metodla mənimsəmək üçün səmərəli, senzitiv dövrüdür. Lakin, ikinci dilin öyrənilməsinə uşaqlarda ana dilin faktlarına ixtiyari olaraq istinad etmək bacarığı yarandıqdan sonra başlamaq daha səciyyəvi haldır. Xarici dilin və ümumiyyətlə ikinci dilin öyrənilməsi məhz həmin bacarıqların əsasında baş verir. Əgər ana dili aşağıdan yuxarıya doğru mənimsənilərsə, daha sonra burada ən sadə mexanizm, burada heca düzəltmək mexanizmi yaranırsa, sonra dilin ali səviyyələri mənimsənilirsə, daha sonra nitqin ixtiyariliyi meydan gəlirsə, bununla belə dil vahidləri ilə şüurlu əməliyyat ən axırda təşəkkül tapırsa, ikinci dil aşağıdan yuxarıya - dil vasitələrini tam ixtiyari seçməklə, dil üzərində şüurlu əməliyyat aparmaqdan nitqin avtomatlaşmasına doğru mənimsənilir. Bu cəhət istər-istəməz xarici dildə nitqi qavramaq və anlamaqda öz təsirini göstərir. Xarici ölkə psixoloqlarının əsərlərində qeyd edildiyi kimi, insanın nitq aparatı müxtəlif nitq

səsləri yaratmaq imkanına malikdir. Lakin heç bir dildə bu səslərin hamısından istifadə olunmur. İngilis dilində qırxa qədər müxtəlif fonemlərdən istifadə olunur. Başqa dillər də özünün xüsusi fonem qrupunu seçir. Uşaqlar ana dilində istifadə olunan səsləri tələffüz etməyə öyrəndikdən sonra onlar öz fonemikalarına həddindən artıq rigidliklə yanaşırlar. Onlar öz ana dillərində ifadə olunmayan səsləri tələffüz etməkdə, həmin yad səsləri bir-birindən fərqləndirməkdə çətinlik çəkirlər. Məhz bu hal çox vaxt xarici nitqin qavranılniası və anlaşılmasını çətinləşdirir. Bu səbəbdən çox vaxt xarici nitq bizim üçün aydın olmur, ayrı-ayrı səslərin ardıcıl deyil, qarışıq, anlaşılmaz toplusu təsirini bağışlayır. Xarici dildə nitqi qavramaq və anlamaq özünü göstərən çətinliklərdən biri də nitqdəki səslərin tələffüz sürəti ilə bağlıdır. Xarici ölkə psixoloqlarının tədqiqatları göstərmişdir ki, yaşlı adamlar nitqdə saniyədə 16 fonem olmaqla bir dəqiqə ərzində 250 sözü qavraya bilirlər. Adətən, bu fonemlər hər bir nitq vahidini müəyyənləşdirən sərhəd rolunu oynayaraq fasilə olmadan ötüb gedir. Həqiqətən çox vaxt bir fonemin yaradılması digərinin üzərinə düşür. Məsələn, insan əvvəlki samitin tələffüzünü qurtarmamış sait səsi tələffüz etməyə başlayır. Bu hal ayrı-ayn sözlərin tərkibində ardıcıl fonem, eləcə də frazaların daxilində ardıcıl sözlər üçün düzgün hal hesab olunur. Deməli, çox vaxt dinləyici nitq axınını müvafiq vahidlərə ayırmaq vəzifəsini yennə yetirməli olur. Bu prosesi düzgün həyata keçirmək üçünsə dinləyənin həmin dilin lüğət tərkibi və strukturu haqqında zəruri biliyinin olması tələb edilir.

## Nitqin inkişaf mərhələləri

Nitqin inkişaf mərhələsi müxtəlif cür təsnif olunmusdur.Müasir dövrdə istifadə edilən bölgü A.N.Leontyevin mərhələləridir. O,njtqin yaranmasını 4 mərhələyə ayırmışdır.

1. Hazırlıq mərhələsi- bu uşaq anadan ötandan 1 yaşma qədər olan dövrü əhatə edir.
2. Bu dövr 1-3 yaşa qədər dövrü əhatə edir.Məktəbəqədər yaş dövründən qabaqkı mərhələdir.
3. Məktəbəqədər- 7 yaşa qədər
4. Məktəb dövrü 7-17 yaşa qədərki dövr

1-ci mərhələ - hazırlıq mərhələsidir ki,bu dövrdə uşağın anadan olmasından sonra onda səs reaksiyaları qışqırıq,ağlama meydana gəlir.Düzdür bu səslər danışıq səslərindən fərqli olsalar da , nitq aparatının nəfəs, səs və artikulyasiya hissələrinin müxtəlif və incə hərəkətlərinin inkişafına kömək edir.2-ci həftədən sonra uşağın səslərə,danışana reaksiya verdiyi,ağlamağı kəsmək,qulaq asmaq,səs gələn tərəfə başını çevirmək müşahidə edilir.Tezliklə körpə intonasiyanı fərqləndirməyə başlayır,mehriban səsə sakitləşir,oynayır,kəskin səslə ağlayır.2 ayında qığıldama ,3 ayında hecalarla səslənmə (ta-ta,ba-ba,ma-ma) ,5 ayında uşaq səsləri eşidir və ətrafdakıların artikulyasiyasına uyğun yamsılamağa çalışır.Beləliklə tədricə??, uşaq yamsılamaqla səsli nitqin bütün elementlərinə fonem, ton, ritm və intonasiyaya sahib olur.7-9 ayında uşaq böyüklərin ardınca müxtəlif və çoxlu səs birləşmələrini yamsılaya bilir. 10-11 aylannda sözlərə reaksiya yaranır.Bu zaman uşağın nitq mühitinin onun nitqinin formalaşmasına çox böyük təsiri vardır.

2-ci mərhələ - məktəqədər yaşdan əvvəlki döVrdü.Uşaqda ilk sözlərin meydana gəlməsi ilə hazırlıq mərhələsi bitmiş olur və onda fəal nitqin yaranması başlayır,səsləri qarışdırır,yeri ərini dəyişik salır,buraxır və ya tələffüzünü təhrif edir.Uşağın ilk sözləri ümumi məna xarakteri daşıyır.Belə ki, eyni sözlə ya da söz birləşməsi ilə həm əşyanı,həm istəyini,həm də hisslərini adlandıra bilər.Məsələn; ata

sözü həm atanın gəlməsini,həm atanı istəməsini,həm də incəlikliyini bildirə bilər.Bu yaşda uşağın lüğətində çoxlu söz olur.Məsələn 1 yaş 6 ayında 10 -15 ,2 yaşın sonunda 300 söz, 3 yaşında 1000-ə qədər söz ola bilər.3 yaşın əvvəlində uşaqda nitqin qrammatik quruluşu formalaşmağa başlayır.

3-cü mərhələ - məktəbəqədər yaş dövrü.Bu yaş dövründə uşaqların çox hissəsində düzgün olmayan səs tələffüzü müşahidə edilirXs-z^.„ş.-i„ f-yjr-1 SB9H Bu „dövrdə fonematik qavrama inkişaf edir,öz tələffüzünə nəzarət edib imkan daxilində onu düzəltmək vərdişləri inkişaf edir,lüğət tərkibi çox böyük sürətlə inkişaf edir.4-6 yaşında aktiv lüğət ehtiyatı 3000-4000 sözə ,çatır.;Sözlərin -mənası dəqiqləşir və zənginləşir.4 yaşda uşaq sadə və mürəkkəb cümlələrdən istifadə edə bilər.5 yaşında nitqin ən ağır-monoloji nitq formalaşır.

4-cü mərhələ- məktəb dövrüdür.Bu mərhələdə uşaqların nitq inkişafının xüsusiyyətləri digər mərhələlərdən fərqlənir.Məktəb dövrdə nitq şüurlu sürətdə ona yiyələnmə ilə ı qrammatik qanunların mənimsəməsi ilə xarakterizə olunur.Bu dövrdə yazılı nitq aparıcı rol oynayır.

## Ünsiyyət mədəniyyəti və danışıq etikası

Əxlaq mədəniyyəti insanların min illər boyu yaratdığı qaydalara əsaslanmış davranış normalarıdır. Orta əsrlərin sonlarından bu normalar etiket adlanmağa başlamışdır. Dünyada etiket normalarının hüquqi yaradıcıları ingillislər olmuşlar. XVIII əsrdə məşhur ingilis yazıçısı Oliver Holdsmit “ Dünyanın vətəndaşı və ya Çin filosofunun məktubları ” əsərində yazımışdır ki, hər bir ölkənin milli əxlaq normaları olsa da, bütün insanlıq üçün eyni ola bilən normalar da mövcuddur və bunlar sağlam düçüncədən , kamillikdən doğur . Bunlara malik adam hansı millətə məxsus olmasından asılı olmayaraq hər yerdə hamı tərəfindən rəğbətlə qarşılanır.

Mədəni , kübar əxlaqlı adam olmaq üçün etiket qaydalarım bilmək hələ kifayət deyil. Bu qaydalan həm bilmək, həm də onlara öz gündəlik davranışlarında əməl etmək lazımdır. Hələ o dövrlərdən belə fikirləşirdilər ki, əxlaqlı adamı 3 çəhət zinətləndirir: xeyirxahlıq, Təvazökarlıq, nəzakət. İnsan cəmiyyətdə yaşayır, digər insanlarla, təşkilatlarla daim ünsiyyətdədir. Əlaqələrimiz genişləndikcə ünsiyyət yaratmaq imkanlarımız da artır.

Görkəmli sovet pedaqoqu V.A.Suxomlinski yazırdı ki, siz insanlar arasında yaşayırsınız, öz hərəkələrinizi, inşaSlara müraciətinizi həmişə ağlınızla yoxlayın, başqalarına pislik edib-etmədiyinizə, onların xətrinə dəyib-dəymədiyinizə əmin olun.

Ünsiyyət mədəniyyətinin özülü ailədən qoyulur, əsas iş də burdan başlayır. Çünki uşaq ilk səsləri, sözləri məhz ailədə eşidir, danışmaq öyrənir, sonra özü həmsöhbətə çevrilir. Deməli, həm danışır, həm də dinləyir. Həm soruşur, həm də cavab verir. Odur ki, bu məsələyə, sadəcə, təkcə nitq vərdişlərinə yiyələnmək kimi yox, həm də ünsiyyət vərdişlərinə yiyələnmək kimi baxmaq lazımdır. Sokrat haqlı olaraq demişdir ki, danış, səni görüm. Kiminləsə danışarkən onun psixikasını, daxili aləmini nəzərə almaq, temperamentini duymaq lazımdır. Çünki insanlar hamısı eyni deyillər: Ətrafimızdakılardan kimlərsə qəmli, şən, utanacaq, inadkar, lovğa və s. olduğu şəksizdir. Kimsə hamıylä eyni ycürə danışsa, ya dinlənilməyəcək, ya da qəlblərə, beyinlərə yol tapa bilməyəcəkdir. Amerika alimlərinin ali idarəetmə işçiləri üçün tövsiyələri eləcə də bütün insan qruplarına aid edilə bilər. Onlar deyirlər ki, elektrik qığılcımları kimi insanların əməli ideyalarının əksəriyyəti başqalarının fikirləri ilə təmasda yaranır. Buna görədə həmsöhbətinə diqqətlə qulaq asmaq, sözünü kəsməmək, mətləbə daxil

olmayanları söhbətə qoşmaqla məzmunsuzluq yaratmamaq lazımdır. Bununla siz müsahibinizdən yeni ideyalar və məlumatlar əldə edə biləcək, eyni zamanda çox böyük mədəniyyətlə dinlədiyiniz üçün ehtiram qazanacaqsınız. Yüksək dinləmə mədəniyyəti müsahibini həm də daha gözəl və canlı danışmağa sövq edir.

Siz danışarkən söylədiklərinizin dinləyənə necə təsir göstərdiyini diqqətdən qaçırmamalısınız. Çünki istər yazılı, istərsə də şifahi nitqinizdə ağır söz işlətmədən də sözün arxasında gizlənən məna ilə adamın qəlbinə dəymək mümkündür. Ünsiyyət zamanı hər sözü məharətlə işlətmək lazımdır. Səs tonu da diqqətdən qaçırılmamalıdır. Daha gözəl və canlı danışmaq üçün bunlar hamısı şərtdir. Bu zaman jest və mimikaların da ahəngini gözləməlisiniz. İnsanda hər şey gözəl olmalıdır.Geyiminiz, hərəkətləriniz  bu gözəlliyi tamamlamalıdır

Ünsiyyət mədəniyyəti yalnız gözəl və mənalı danışmaqdan ibarət deyildir. Bu prosesdə iki tərəf var: danışan və dinləyən. Nə qədər zəngin danışsanız, həmsöhbətinizin və yaxud auditoriyadakı adamların qəlbinə daha asan yol tapacaqsınız. Bu zaman həm də gözəl dinləniləcəksiniz. Gözəl danışan qarşısıdakı adamlarda nə qədər xoş təəssürat yaradırsa, gözəl dinləyən də özü haqqında eyni təəssüratı yaradır. Bunlar hamısı nəzakət, əxlaq qaydaları üçün mühümdür. Biz hər gün ictimai həyatın müxtəlif sahələrində tanıyıb-tanımamağımızdan asılı olmayaraq çoxlu insanlarla ünsiyyətdə oluruq və ya ətrafımızda bunları seyr edirik. Səmimi, mehriban ünsiyyət xoşumuza gəldiyi kimi, əl-qol ata-ata kobud, küçə leksikonunda danışanları görəndə əsəbiləşirik. Belə mənzərələrin yaranmasında hər birimizin məsuliyyət payı var.

Fransız yazıçısı V.Hüqo yazırdı ki,yaşadığımız dünyada səmadan da gözəl mənzərə vardır, bu, insan qəlbinin dərinliyidir. Bu dərinliyə baş vura bilmək üçün gözəl danışmağı, müraciət formalarını, dinləməyi bacarmaq lazımdır.

Nitq mədəniyyəti insanlara məxsus ümumi mədəniyyətin ən vacib və aparıcı tərkib hissələrindən biridir. Bu anlayışa danışıq mədəniyyəti ilə yanaşı, yazı mədəniyyəti də daxildir. Belə yüksək keyfiyyətə yiyələnən şəxs cəmiyyətin ictimai həyatında, onun hər hansı bir sahəsində fəal və məhsuldar iştirak etmək imkanına malik olur. Xüsusən, ziyalıların nitq mədəniyyətinə yiyələnməsi vacib sayılır. Yazıçılar, müəllimlər, aktyorlar, radio və televiziya işçiləri, jurnalistlər, bədii söz ustaları nitqinin təsirliliyi, obrazlılığı, ifadəliliyi, məntiqliyi, zənginliyi ilə fərqlənməli, başqaları onların danışığından, oxusundan, yazdıqlarından nümunə götürməlidirlər. Nitq mədəniyyəti insanın yüksək ictimai mədəniyyəti, təfəkkür mədə- niyyəti, dilə şüurlu sevgisi, ən yüksək keyfiyyətdir. Böyük Britaniyada qadınların nitqi ilə bağlı aparılan sosioloji tədqiqatlar göstərmişdir ki, nə qədər nitq düzgündürsə qadın şəxsi və professional həyatda bir o qədər xoşbəxtdir. Bu nəticəni, şübhəsiz, dilin bütün daşıyıcılarına aid etmək olar. İnsanın nitqi onun iç dünyasım aşkarlayan başlıca vasitədir. Adamları tanımaq, onlara bələd olmaq üçün, hər şeydən əvvəl, ünsiyyətə girmək, təmasda olmaq lazımdır. Antik dövrün böyük filosofu Sokrat həmişə deyərmiş: "Ey insan danış səni tanıyım". Həzrət Əli buyururdu ki, hər kəs öz dilinin altında gizlənib. Danışmaymca onun ağıllı və ya ağılsız olması məlum olmur. Tarixi inkişafın bütün dövrlərində nitqə, onun gözəlliyinə xüsusi diqqət yetirilmiş, qiymət verilmişdir. Bir latın atalar sözündə deyilir ki, şair anadan şair doğulur, natiqlər isə tədricən yetişir. Buradan aydın şəkildə bəlli olur ki, gözəl danışığa yiyələnmək həyatda qazanılır və hər kəsin özündən asılıdır. Lap qədim zamanlarda yaranmış bir zərb-məsəldə deyilir: "Sözün zahiri zərif, batini lətif olmalıdır"

Bir latın atalar sözündə deyilir ki, şair anadan şair doğulur, natiqlər isə tədricən yetişir. Buradan aydın şəkildə bəlli olur ki, gözəl danışığa yiyələnmək həyatda qazanılır və hər kəsin özündən asılıdır. Lap qədim zamanlarda yaranmış bir zərb- məsəldə deyilir: "Sözün zahiri zərif, batini lətif olmalıdır". Yaxşı nitqi, mədəni nitqi şərtləndirən bir sıra tələblərvardır ki, bunlar nitqin normativliyidir. Həmin tələblər bunlardır: aydınlıq, düzgünlük, sadəlik, dəqiqlik, yığcamlıq, zənginlik, təmizlik, münasiblik, ifadəlilik, orijinallıq, səmimilik və s. Yazılı nitq mədəniyyəti probleminə həmçinin orfoqrafiya və durğu işarələrinə əməl edilməsi də daxildir. Bunlar hər biri ayrılıqda və hamısı birlikdə etalon səviyyəli nitqi yaradır ki, bu nitqə yiyələnənlər natiqlik sənətində, müəllimlik fəaliyyətində və digər sahələrdə böyük uğurlar qazanırlar. Nitqin əsas keyfiyyətləri haqqında yığcam bir şəkildə aşağıdakıları qeyd etmək olar: Nitqin aydınlığı dinləyici və oxucunun nitqi asanlıqla anlaması, başa düşməsidir. Aristotel nitqin aydınlığını ünsiyyət üçün başlıca şərt sayır və göstərirdi ki, nitq aydın deyilsə, demək, o öz məqsədinə çata bilməmişdir. Nitqin aydınlığı üçün əsas amil danışanın (eləcə də oxuyanın və yazanın) nitq obyekti haqqmda mükəmməl məlumata malik olmasıdır. Natiq haqqında danışacağı materiala dərindən və yaxşı bələd olsa, həmin materialı ifadə etmək üçün müvafiq dil vasitələri də tapa bilər. Bəhs olunan mövzular, hadisələr, əhvalatlar və s. barədə dərin, həm də ətraflı biliyə malik olan natiqlər daha maraqla dinlənilir, onların şərhində heç bir dolaşıqlıq, zidd fikirlər müşahidə olunmur. Belə adamlar sadə, aydın cümlələrlə, faktlarla, dəlillərə əsaslanaraq danışır və yazır, işlədilən hər bir sözün əhəmiyyətini, ifadə olunan fikir üçün onun nə dərəcədə yararlı olduğunu aydın təsəvvür edirlər. Firudin bəy Köçərli nitqin aydınlığını təfəkkürün düzgün işləməsi, fikrin düzgünlüyü ilə əlaqələndirir. "Bizim yəqinimizdir ki, dili dolaşıq şəxsin fikri də dolaşıqdır. Doğru və salamat fikirli adamların kəlamı həmişə aydm, açıq və düzgün olur" - deyirdi. Nitq zamanı aydınlığın pozulmasının bir səbəbi də dili, sözlərin mənasım, işlənmə məqamını və s. yaxşı bilməmək, zəngin söz ehtiyatına sahib olmamaqdır. Danışıq zamanı qüsurlu cümlələrə tez-tez təsadüf edirik. Radio və televiziya verilişlərində nəzərə çarpan belə nöqsanlı cümlələrdən misal olaraq aşağıdakıları göstərmək olar: Türk xalqları həmişə əxlaqlı olublar. Müşavirədə xeyli qonaqlar çıxış etdilər. Təcili atəşin dayandırılması tələb olundu. Hadisə yerinə çıxılmış; Rəis mədəni (birinci hecadakı ə uzadılaraq tələffüz olunur) adamdır. O, bu işə məhsuldur. Dövlət film fondundan itmiş məşhur bəstəkar Müslüm Maqomayev haqda film tapılmışdır; Başımıza gətirilən ermənilər tərəfindən vəhşilikləri saymaqla qurtarmaz; Ona müvəffəqiyyət uğurları arzulayıram; Bu il havalann pis keçməsi ilə bağlı qəbahət yaranmışdır; Biz bunlara müdaxilə göstərməyə çalışırıq və s. Düzgün olmayan tələffüz - səslərin öz məxrəcində deyilməməsi, qarışdırılması, bəzən də səslərin, hecaların tələffüzdən düşməsi, məzmuna, məqsədə uyğun intonasiyaya əməl olunmaması və s. də nitqin aydınlığına xələl gətirən səbəblərdir. Normal nitq tempindən yavaş və ya əksinə, iti danışanlara təsadüf etmək çətin deyildir, iti templə danışarkən sözlər yarımçıq tələffüz olunur. Belə nitqi eşitmək və qavramaq çətin olur. Sözlərin əvvəli və ya axın "udulur", səslər anlaşılmır. K.S.Stanislavski bu cür nitq haqqında demişdir: "Səsləri dəyişdirilmiş sözlər mənə ağzının yerində qulağı, qulağın yerində barmağı olan adam təsiri bağışlayır. Əvvəli aydın deyilməyən söz başı əzilmiş adam kimidir. Sonu eşidilməyən söz isə mənə ayaqlan kəsilmiş adamı xatırladır. Ayn-ayn hərf və hecaların buraxılması əzilmiş burun, çıxarılmış göz və ya diş, kəsilmiş qulaq və bu kimi şikəstliklər təsirini bağışlayır. Bəzi adamlar ehtiyatsızlıq üzündən sözləri yapışdınb, mənasız və formasız kütləyə çevirəndə mən balın üstünə düşmüş milçəyi xatırlayır və tutqun dumanda payız palçığı və çiskinini təsəvvürümə gətirirəm"

Natiqlik praktikasında nitqin diksiya baxımından aydınlığı və düzgünlüyü böyük əhəmiyyət kəsb edir. Nəfəsi və səsi idarəetmə bacarığım təkmilləşdirmək, bu sahədə şivə qüsurlarını düzəltmək, dodaqların, dilin, çənənin süstlüyünü aradan qaldırmaq, səs, nəfəs üzərində kompleks çalışmalar aparmaqla aydın diksiyaya nail olmaq mümkündür. Auditoriya qarşısında çıxış edən natiq (mühazirəçi) nitqin səs mədəniyyətinə yiyələnməli, danışıq cihazından düzgün istifadə etməyi bacarmalıdır. Nitqin səs mədəniyyəti dedikdə bura artikulyasiya aparatının düzgün qurulması, səs və sözlərin dürüst tələffüz edilməsi, ünsiyyət şəraitinə görə səsin gücünün tənzimlənməsi, nitq sürətinin gözlənilməsi, intonasiyaya, ifadəliliyə əməl olunması, nitqi eşitmə qabiliyyətinin yaradılması və s. daxildir. Nitqin səs mədəniyyəti səs cihazı, onun funksiyasını normal şəkildə yerinə yetirməsi məsələsi ilə sıx bağlıdır. "Nəfəs səs və s. anlayışlardan ibarət olan bu səs cihazı müəyyən qaydalar və vərdişlərin məcmusu vasitəsilə dili konkret ünsiyyət şəraitində reallaşdırır. Səs cihazı intonasiya, pauza, vurğu, orfoepiya, temp, ritm, tembr, mimika, hərəkət kimi anlayışlarla birləşib nitqin texnikası adlı bir sahəni təşkil edir. Həmin sahə nitq mədəniyyətinin əsas bölmələrindən biri olub şifahi nitqin daxili, səslənən tərəfinin ifadəlilik keyfiyyətinin yaranmasına xidmət edir".

Diksiyanın pozulması səbəblərindən biri danışıq və ya oxu zamanı nəfəsin düzgün tənzim olunmamasıdır. Məlumdur ki, ağciyər tələffüz zamanı tələbata uyğun olaraq xaricə hava buraxır və bu hava ehtiyatının sərf edilməsi sözdən, cümlədən asılı olaraq müxtəlif ölçülü olur: nəfəsalmada hava ağciyərə adi ölçüdə, tədricən daxil olduğu halda, tələffüz zamanı ağciyərdən xaricə müxtəlif ölçülərdə buraxılır. Bəzən danışanlar tələffüz zamanı nəfəslərini lazımi ölçüdə sərt etmədiklərindən cümlənin sonuna yaxın hava ehtiyatı tükənir, damşan sanki boğulur, səsin gücü aşağı düşür. Bu o deməkdir ki, danışan cümlənin mənalı hissələrində, təbii şəkildə ehtiyac olduğu yerdə nəfəsini dərmir, cümləni birnəfəsə deyir və ya oxuyur. Məsələn; Yaz gələndə bütün ağaclar kimi yasəmən də çiçək açardı. Onun açıq-bənövşəyi gülləri salxım-salxım olub sallanardı. Birinci cümlədə gələndə, kimi, ikinci cümlədə isə gülləri sözlərindən sonra ani fasilə edilir, nəfəs alınır ki, bu da sözlərin, ifadələrin asan, aydın, həm də ahəngdar tələffüz olunmasını təmin edir.

Düzgün tələffüzdə, səslərin formalaşmasında çənələr, xüsusən alt çənə fəal iştirak edir. Alt çənənin enməsi və qalxması ilə ağız boşluğunun həcminin daralması və genişlənməsi nəticəsində müxtəlif səslər yaranır. Bəzən danışanlarda alt çənənin mühərrikliyinin zəifliyi tələffüzdə süstlüyə, ləngiməyə, ölüvaylığa səbəb olur. Deyilənlər yaxşı qavranılmır, dinləmə istənilən səviyyədə getmir. Belə hala yol .verməmək üçün natiqin çənəsi, necə deyərlər, möhkəm olmalıdır

Nitq həm də dəqiq olmalıdır. Bu, nitqdə yığcamlığı yaradır. Dəqiqlik sözün öz istinad nöqtəsi, yəni onun ifadə etdiyi məfhumla bağlandığı zaman mümkün olur. Bunun üçün danışanın, yazanın nitqin predmetinə yaxşı bələd olması, fikrə uyğun münasib sözlər, ifadələr işlədə bilməsi, çoxmənalı sözlər, omonim, sinonim, antonimlərdən yerində istifadə etməsi əsas şərtdir. Sözlər seçilərkən sözün mənası, emosional-ekspressiv rəngi, üslubi səciyyəsi, işlənmə dairəsi, qrammatik tərkibi də nəzərə alınmalıdır.

Nitqdə reallıqdan uzaqlaşmanın digər səbəbi danışanın nitq predmeti haqqında səthi məlumata sahib olmasıdır. Məsələn, müasir təlim texnologiyaları, onların məktəbdə tədrisinin mövcud problemlər (interaktiv, innovativ təlim və s.) barədə aydın təsəvvürü, ətraflı məlumatı olmayan rəhbər maarif işçisinin müəllimlər qarşısında çıxışı istənilən effekti verə bilmir. Yaxud ölkəmizin xarici siyasəti haqqında səthi məlumatı olan mühazirəçinin, icmalçınm, şərhçinin və başqalarının çıxışı maraqsız olur, yaxşı dinlənilmir.

Nümunəvi nitqin mühüm şərtlərindən biri də cümlələrin düzgün qurulmasıdır. Bu cəhətdən natiqin nitqi başqalarından fərqlənməlidir. O, dinləyicilərlə ünsiyyətin bütün formalarında fikrini dolğun, sanballı, aydın və təsirli cümlələrlə ifadə etməyi bacarmalıdır. Danışıq prosesində yaxşı cümlə qurmaq məqsədilə fikirləşmək və nümunəvi cümlələr düzəltmək mümkün deyildir və buna ehtiyac da yoxdur. Belə bacarıq xüsusilə natiqlərdə möhkəm nitq vərdişinə çevrilməli, nəzərdə tutulan fikir özünəmüvafiq forma ilə verilməlidir.

Natiqin nitqi, hər şeydən əvvəl, bədii təsvir vasitələri - sinonimlər, frazeoloji Birləşmələr, atalar sözləri, zərbi-məsəllər, həkimanə sözlər, aforizmlər və s. ilə zəngin Rölmalıdır. Danışan bu vasitələrlə ən incə mətləbləri dinləyicilərinə çatdıra bilməlidir.

Belə obrazlı ifadələr yerində, məqamında işləndikdə nitq xoşagəlimli olur, onun Bədiiliyi, təsir gücü artır.

Auditoriyada, ictimai yerlərdə, rəsmi məclislərdə nitqin daha dəbdəbəli, təmtəraqlı olması üçün çox zaman qəlib xarakterli, çeynənmiş sözlərdən, cümlələrdən istifadə olunur, məqsədyönlü iş, görkəmli nailiyyətlər qazanmaq, yüksək əmək nümunələri göstərmək, yüksək nəticələrə nail olmaq, önəmli addım, təşkil etmək, diqqəti çəkən məsələ, qısa zaman kəşiyində, prizmadan baxmaq, dəstəkləmək, yeni münasibətlər müstəvisində, bu istiqamətdə fəaliyyət və s. tipli ifadələrin tez-tez işlədilməsi nitqə quruluq gətirir, onu canlılıqdan məhrum edir. Natiq nitqində həmin ifadələrin uyarlı qarşılığından istifadə olunmalıdır.

Şifahi nitqin qüsurlarından biri də cümlələrin məntiqi, qrammatik baxımdan düzgün qurulmamasıdır. Məsələn, Bu məqalə oxucu kütləsi üçün nəzərdə tutulmuşdur. Onun sözünə baxıb, onun abidəsini qoydular. Xalq, əhali belə düşünürlər. Orada beş yüzdən artıq qocalarımız yaşayır; Tamaşalarımız çox yaxşı kiçikyaşlılar tərəfindən qarşılandı. Hər məntəqədə artıq səs verəcək seçiciləri gözləyirdilər; Çox təəssüf ki, bu xeyirxah işdə mən tək deyiləm və s. Radio və televiziya verilişlərinin dilindən alınmış bu cür qüsurlu cümlələrə bəzən natiqlərin, mühazirəçilərin, müəllimlərin nitqində də təsadüf etmək mümkündür. Natiq cümlə qurmaq bacarığının təkmilləşdirilməsi ilə bağlı müəyyən sistemlə, müntəzəm şəkildə iş aparmalı, həmin keyfiyyətə tam şəkildə yiyələnməlidir. Onun nitqində uzun, dolaşıq, təmtəraqlı cümlələrə yol verilməməli, fikirlər aydın, sadə şəkildə ifadə edilməlidir. Burada iş cümlələrin düzgün qurulması ilə bitmir. Həmin cümlələr həm də dinləyicini qane edəcək bir tərzdə söylənilməlidir. Bu zaman ədəbi tələffüz qaydaları gözlənilməli, normal diksiyaya, nitq fasiləsinə, tonuna, məntiqi vurğuya və şairəyə əməl olunmalıdır.

## Nitq mədəniyyəti məsələlərini ümumiləşdirən sxemlər və cədvəllər

### Nitqin təsnifi



## Natiqlik sənətinin inkişaf etdirilməsi yolları

1.Natiqlik sənəti kursları təşkil edilməsi.

2. Televiziyada və radioda natiqlik sənətinə həsr olunmuş verilişlər aparmaq

3.Natiqlik sənətinə həsr olunmuş yığıncaq və konfranslar keçirmək.

4.Ali məktəblərin filologiya fakültəsində natiqlik sənəti ixtisası üzrə kadrlar hazırlığı aparılması.

5.Ayrı-ayrı tarixi şəxsiyyətlərin nümunəvi nitqinin səs yazısına köçürülməsi və əhali arasında yayılması.

6.Natiqlik sənətinin özünəməxsus uyğunluqlarını və sirlərini aşkar edən elmi əsərlər yazılması

7.Natiqlik sənəti haqqında müxtəlif dövrlərdə yaşamış tarixi şəxsiyyətlərin fikirlərini təbliğ etmək.

## Natiqin dinləyiciləri düşündürmək, mühazirədə qoyulan məsələyə marağı artırmaq məqsədilə auditoriyaya verəcəyi sualların tipləri

1. Hipotetik (fərziyyə,təxmini xarakterli) suallar.
2. Düşünməyə təhrik edən suallar
3. Həvəsləndirici suallar
4. Dinləyiciləri rəy söyləməyə təhrik edən suallar
5. Yoxlama xarakterli suallar
6. Nəticə çıxarmağa sövq edən suallar
7. Dinləyicinin diqqətini müəyyən istiqamətə yönəldən suallar
8. Ritorik suallar (cavab tələb etməyən).

## Nitqin elementləri

1.Məzmun 2.Təbiilik 3.Aydınlıq 4.Tembr 5.Jest 6.Kompozisiya 7.Yığcamlıq (lakoniklik) 8. Emosionallıq 9.Səsinin tonu 10.Qeyri-etik sözlərdən qaçmaq.

## Nitq etiketlərinə dair nümunələr

1. Razılıq etmə məqamında- minnətdaram, çox razıyam, Çox sağ olun, bağışlayın, sizə əziyyət verdim, Allah sizdən razı olsun və sair.
2. Köməyə ehtiyac məqamında- zəhmət olmasa, sizə əziyyət verəcəyəm, rica edirəm, lütfən, üzr istəyirəm, imkanımız olsa və sair.
3. Kömək etmə məqamında- icazə verim, kömək edim, siz əziyyət çəkməyin, qulluğunda olum, sizə nə kömək edə bilərəm və sair.
4. Dəvət etmə məqamında- xoş gəlmisiniz, buyurun qonağımız olun, qapımız həmişə üzünüzə açıqdır, Siz bizim üçün həmişə əzizsiniz, məclisimizdə iştirakınızdan məmnun olarıq və s.
5. Qarşılama məqamında- xoş gördük, xoş gəlmisiniz, qədəmləriniz mübarək, həmişə Siz gələsiniz, gəlişinizlə bizi sevindirdiniz və sair.
6. Vidalaşma məqamında: salamat qalın, yaxşı yol, uğur olsun, evinizə xeyir aparın, zəhmət çəkdiniz ki, Allah amanında və sair.
7. Etiraz etmə məqamında- bu məni təmin etməyir, bağışlayın, mən razı deyiləm, mən başqa cür düşünürəm, bu mənim əqidəmə uyğun deyil və sair.
8. Ad gününü təbrik etmək məqamında- ad gününüz mübarək təbrik edirəm, cansağlığı, uzun ömür arzulayıram. Allah səni bütün arzularına çatdırsın, tale sənə yar olsun və sair.
9. Telefon danışıq məqamında- Alo, eşidirəm sizi, buyurun, bağışlayın, tanımadım zəng edən kimdir, salamınızı çatdıraram, bağışlayın vaxtınızı aldım və sair.
10. Hal əhval tutma məqamında- əhvalınız necədir, işləriniz necə gedir, uşaqlar necədir, xanımınız necədir, özünüzü necə hiss edirsiniz və sair.

## Ədəbi dilin normaları



## Mədəni nitqə verilən başlıca tələblər




## Nitqin funksiyaları



## Nitq prossesinin ünsürləri




## Daxili nitqin xüsusiyyətləri




## Monoloji nitqin formaları



## Dialoji nitqin növləri.




## Şifahi nitqin xüsusiyyətləri

- Danışılır və eşidilir,
- Daha çox ümumişlək sözlərdən istifadə edilir
- Cümlələr quruluşca sadə olur
- Danışıq dilinə yaxın olur
- İntonasiya, fasilə, vurğudan istifadə edilir
- Mimika, jest və s. istifadə edilir
- Texniki vasitələrlə, gələcək nəslə ötürülür
- Temp sürətli olur.

## Şifahi nitqdə intonasiyanın tipləri



## Yazılı nitqin xüsusiyyətləri

- Yazılır və oxunur
- Terminlər çox işlənir
- Geniş və mürəkkəb cümlələrdən çox istifadə edilir
- Ədəbi dilə söykənir
- Durğu işarələrindən istifadə edilir
- Yazılı şəkildə nəsildən nəsilə ötürülür
- Sürət aşağı olur
- Hərflərdən istifadə edilir

## Nitqdə mimikanın ünsürləri

- Üz mimikası
- Göz mimikası
- Ağız mimikası
- Dodaq mimikası
- Alın mimikası və s.

## Jest ünsürləri

- barmaq jestləri
- əl pəncəsi jestləri
- qol jestləri
- baş jestləri
- çiyin jestləri
- qıç jestləri
- ayaq jestləri

## Mimika işarələrinin növləri

- xoş əhval ruhiyyə mimikası
- xəlvəti işarə mimikası
- narazılıq mimikası
- təəccüb mimikası
- nifrət etmə mimikası
- həya etmə mimikası
- qorxu mimikası

## Jest işarələrinin növləri

- istiqamət vermə jesti
- işarə etmə jesti
- icazə jesti
- təzdiq və ya razılıq jesti
- etiraz etmə jesti
- hərəkətə təhrik jesti
- vidalaşma jesti
- birliyə çağırma jesti
- qələbə jesti
- keyfiyyət jesti
- təsviri jest

## Yazılı nitqdə istifadə olunan durğu işarələri

- nöqtə
- vergül
- nöqtəli vergül
- iki nöqtə
- çox nöqtə
- sual
- nida
- tire
- defis
- dırnaq
- mötərizə

## Natiqlik sənətinin predmeti funksiyası və strukturu

“ **N**natiqlik sənət”   i termini (latınca oratoria), qədim kökə malikdir, qədim mənşəidir.l,Yunan sözü olan ritorika və Azərbaycan sözü olan natiqlik onun sinonimləridir.



**Müasir nitqin əsas tərkib hissələri.**




Nitq mədəniyyəti, rasional, bacarıqların və vərdişlərin formalaşdırılması və natiqlik məharətinə yiyələnmə və öyrədilməsi üçün əsas şərtlərdən biridir.

**Nitqin əsasını təmin edən amillər**

Mədəni tarixi

-Demokratiya azadlığının inkişafı, öz şəxsiyyətinin azadlığı, insanların bərabərliyi,

-bərabər hüquqların bir birini inandırmağı göstərən elmə ehtiyac

şəxsiyyətin özünəməxsusluğunu təkrarolunmazlığı və onun inkişafı

-Insanların bir birinə oxşamamazlığı,

-ünsiyyət və ünsiyyətdə olmağın öyrədilməsinə elmi tələb

Sosial-siyasi

-ictimai həyatda insanlar özləri haqqında böhtan danışmağa başlayanda insanların insan hüquqlarına istinad

-20-ci əsrin etiraz səsi

psixoloji

-Cəmiyyətdə insan fikrinin dəyişməsi, -mədəniyyəti, ədəbiyyat, incəsənətin inkişafı, elmi psixologiyanın yaranması

kommunikativ

-Insan ünsiyyətinin inkişafı,

-insanların nüfuz dairəsinin kəskin genişlənməsi vəziyyətlərinin kəskin artmasından məcburi ünsiyyətə girmək və bir birini inandırmaq lazımdır.

iqtisadi

Rəqabət böhranı, reklam elmi, alıcıların istehlak etməsi

-sübut etməyin elminin vacibliyi,

-müasir menecment, nəinki texniki, hətta istehsal idarəetməsinin təkmilləşdirilməsini nəzərdə tutur

**Nitq mədəniyyətini təşkil edən əsaslar**



**Nitqin semantik vasitələri**



**Natiqlik sənətinin əsasını təşkil edən elmlər**



**Natiqlik fəaliyyətinin prinsipləri**



**Natiqlik sənətinin müasir qanunları**

Natiqlik sənətinin müasir qanunları

1.Dialoqun harmonizasiyası qanunu:

effektiv (harmonizasiyalı) şifahi nitq yalnız situasiyanın iştirakçılarının qarşılıqlı dialoqları əsasında mümkündür.

2.əlaqələndiricinin məqsədə çatmaq üçün yaxınlaşma və oriyentasiya Qanunu

3.Nitqin emosionallığı qanunu: danışan təkcə fikirləşmir, o, həmçinin hiss edir və xəbər verdiyi və ya danışdıqlarını emosional yaşayır.

Zövq qanunu: təsirli nitqi yalnız natiqin qarşısına dinləyiciyə sevinc bəxş  etmək, bu əlaqəni xoş etmək məqsədi qoyduğu zaman mümkündür.

**Nitq mədəniyyətinin sirrini açan suallar**



**Natiqlik sənəti praktiki həyat üçün nə verir?**

düzgün nitq nə deməkdir, bilmək lazımdır, onun məntiqində danışmalıdır.

lazımi məqamda özünü sərbəst və inandırıcı hiss etmək

Daha yaxşı və daha asan düşünmək (yaxşı demək, daha dəqiq, məntiqli, ardıcıl olması)

Natiqlik sənəti praktiki həyat üçün nə verir?

Dinləyicisinin marağını necə cəlb edə biləsən.

Danışığını yaxud ünsiyyətin müxtəlifliyi ilə dinləyicini ələ alasan məruzə edəsən, mühazirə oxuyasan, işgüzar söhbətdə iştirak edəsən, sağlıq deyəsən, təbrik edəsən, şəninə xoş sözlər deyəsən, ictimai yerdə açıq danışasan, öz doğruluğunda haqlı olduğunu sübut edəsən.

Auditoriyanın və həmsöhbətinin tələbi nəzərə alınmalıdır, dinləyicinin yormamalısan nitqinlə onları razı salasan, daha cəlbedici olasan

Bunların hamısı bizi düzgün danışmaq qaydaları ilə tanış edir.

**Nitq nədəniyyəti korifeyləri**



**Nitq nmədəni yyətinin inkişafı**




Nitqin hazırlanmasında əsas işlər
İnventio
Fikrin tapılması
Dispositio
Fikrin düzülməsi
Elocutio
Şifahi ifadəsi
Memoria
xatırlanması
Actio(pronuntiatio)
Ifadə edilməsi




**İctimai nitqin hazırlanması və həyata keçirilməsinin əsas mərhələləri**

**Siseronun nitq mədəniyyətinə baxış**



**Aristotel-Qədim nitq mədəniyyətinin əsas nəzəriyyəçisi**

Kitabda qeyd edib:

- ✓ Nitq mədəniyyətinin predmeti-“verilmiş hər bir predmetə münasibətdə inandırmanın mümkün üsullarının tapılması bacarığı”.
- ✓ İnandırmağın 3üsulu:Birinci danışanın xarakterindən,Digəri dinləyicilərin əhval ruhiyyəsindən,3cüsü isə mitqin özündən asılıdır.

Natiqlik çıxışlarının növləri:

- məsləhət verici
- məhkəmə
- təntənəli

II kitabda nəzərdən keçirilir:

- ✓ Danışana münasibətdə inamı yaradan səbəblər-ağıl,yaxşılıq,xeyirxahlıq.
- ✓ Nitqin inaandırıcı olması haqqında onları(dinləyiciləri) necə inandırmalı-onlarda müəyən hisslər yaradaraq(qəzəb,sevgi,qorxu,cəzsaət,ayıb,şəfqət, nifrət).

Nitq Mədəniyy

III kitab nitqin özünə həsr olunur:

- ✓ Üslub nitqin predmetinə uyğun gəlməlidir.
- ✓ Üslubda ümumi tələblər:
  - — Aydınlıq
  - — Keçid
  - — Həriflik
  - — Yumşaqlıq
  - — Lütf
  - — Alicənablıq

“Nitq mədəniyyəti-diqlektikaya uyğun gələn sənətdir.Ümumilik xarakteri daşıyır.Nitq mədəniyyətindən hər addımda istifadə edirlər.O,gündəlik həyatda,ötəri və dövlət

**Natiqin psixoloji və pedoqoji problemləri**



**Tamaşaçıları öyrətməyə başlayan zaman,növbəti suallar ətrafında düşünün:**

Bu suallar ətrafında düşünün

1.Tamaşaçıların yaş,sahə,sosial və etnik tərkibi nədir?

2.Dinləyicilər sizin çıxışınızdan nələr gözləyir?

3.Dinləyiciləri narahat edən məsələlərdən hansının həllində kömək edə bilərsiniz?

4.Dinləyicilərin ümumi bilik səviyyəsi necədir?

5.Nələri detaylı analiz(təhlil) etməlisən?

6.Ümumi mənada danımaq üçün nələr kifayətdir?

7.Günün hansı hissəsində çıxış etmək lazımdır?(səhər,günorta,axşam)

8.Hansı hesabat və terminləri dinləyicilər başa düşməzlər?

9.Hansı verilənləri uğurlu misal və müqayisəylə təsdiqləmək lazımdır

10.Demək istədiyinizi necə dəqiq demək lazımdır?

**Nitq söylənilən zalların səviyyəsi**

Orta təhsilli zalda (gənc əməkdaşlar)

- Zaldan öz üstünlüyünüzü göstərəcək qədər yüksəlməyin
- Deyilən problemlə bağlı mücərrəd əsaslandırmanın quru məntiqi ilə məhdudlaşmamaq
- Düşüncələrinizi, ideyalaraınızı təkrar etməyin.Bezdirici olmayın
- Gənclərin indi zövq aldığı bütləri haqqında pis fikir söyləməyin
- Kəskin suallardan qaçmayın, cəmiyyətin göündə etibarsızlıq qazanmayln
- Onların psixoloji vəziyyətlərinin zəifliyindınsui-istifadə etməyin və onların hissləri ilə oynamayın.

Ali təhsilli zal (təcrübəli əməkdaşlar)

- Tez yaranan,tələsik,tam əsaslandırılmamış qeydlərdən qaçın.
- Sübut yerinə kimin hansı fikirdə olmağından asılı olmayaraq,sitat və istinadlardan sui-istifadə etməmək
- Mənfi faktlar, verilən qiymətlərdən sui-istifadə etməmək
- Prinsipial,qaynar məsələlərdən boyun qaçırmaq, mübahisəli məsələ və situasiyalardan qaçmamaq
- Əsaslandırılmalarda qeyri-ardıcıllığa yol verməmək, rəsmi və dialektik məntiqin qanunların
- Öz mənliyini həddən artıq yüksək səviyyədə göstərməmək


Natiq(N) və Dinləyici (D) arasında zalla əlaqə
Əlaqə-zalın və natiqin vəziyyətinin məcmusudur,dinləyicilər və danışanlar arasında qarşılıqlı anlavısdır
Çıxış edənin təqdimatına müsbət reaksiya
D və N arasında informasiyalı əlaqə zamanı müda
Daxiletmə ətaləti
Diqqətin qeyri-sabitliyi
Özgələrin fikirlərinə laqeydlik
Dinləyicilərdə diqqətin xarici ifadəsi(duruşları,cəmlənmiş baxış,bəyənmək alqışı,razılıq əlaməti,gülümsəmək,gülüş,alqış)
Natiqlə dinləyici arsında qarşılıqlı anlaşmanın əsas göstəriciləri:
Zalda iş sükutu
Agıllı(intellektual) təmas-natiqin düşündürücü birgə fəaliyyəti
“ Təkcə səlahiyyət əsasında heç nə öyrətməyin,xarici hisslər və məntiq yolu ilə sübutlar əsaında öyrədin.”
Y.Komenski

**Dinləyicilərin təfəkkürünün idarə olu**

Dinləyicilərin təfəkkürünün idarə olunmasına nail olmaq.

- Məqsədyönlülük (bütün çıxış zamanı məqsədi yadda saxlamaq)
- Aydınlıq
- Qısalıq
- İfadəlilik
- Emosionallıq
- Məntiqilik

**Zalın qiymətləndirilməsi meyarları**



**Natiqlik çıxışlarında məntiqin qanunlarından istifadə olunması**



# İctimai çıxışın kompozisiyası




<u>Çıxışın məntiqi və psixoloji aspektlərinin yaxın əlaqəsi:</u>

Kompozisiyanın mərkəzində başlanğıc və sonun bağlı olduğu və gətirilən bütün arqumentlərin aid olduğu tezis dayanır.

Tezis M.İ.Speranskinin çıxışlarına əsasən "hökmranlıq edən fikirdir", hansı ki, hər şey aid edilməlidir.

Verilmiş, sxem, nitqin əsas kompozisiya məntiqi görünüşü əks etdirir.

"Öz predmetini sorğu etmək onun bütün vəziyyət və hissələrinin məsafələrin qeyd edərək, hissələrə parçalamaq, bu əlaqəyə vermək məsafədə yerləşdirmək."

**Ictimai çıxışların əsas hissələri və hədəfi**



## Arqumentləşdirmənin metodları və üsulları

Qarşılıqlı yardım metodu müzakirələrdə istifadə olunur.

Potensial araşdırıcı metod:

öz maraqlarınız üçün siz aksentləri qaışdıracaqsınız, qoyulmuş məsələ ilə bağlı öz maraqlarınıza uyğun olanı ön planda qoyacaqsınız.

Müqayisə metodu

Fundamental üsul:

zala müraciət hansını, siz faktlar və xəbərlərlə tanış edirsiz, sizin sübutunuzun əsası olan faktlar

sorğu metodu:

natiqlərin sualları əvvəlcədən verilir; “dəyirmi masa” “leksiya dialoq” “sualları və cavabları” axşam bu formalardır.

Bumeranq metodu:

qarşı tərəfin silahını onun özünə qarşı istifadə etmək

Bəli..xeyir metodu:

zal danışıq mövzusuna ehtiyatla yanaşdığı zaman istifadə olunur.

Ziddiyyətlər metodu əsaslandırmaları və həmçinin qarşı tərəfinin arqumentasiyası və diqqəti onlarda cəmlənməsi üçün ziddiyyətlərin aşkarlanması

Inkar etmə metodu:

həmsöhbət tərəfindən ortaya qoyulan fakt sizin tərəfimizdən rədd edilə bilməz, lakin onun dəyərini və mahiyyətini uğurla uzaqlaşdırmaq olar.

ədəd metodu:

fərqli ayrı ayrı hissələri fərqləndirmək üçün həmsöhbətini çıxışını parçalamaq, “bu dəqiq deyil”, “bu şübhəlidir”, “burada ən fərqli nöqteyi nəzərlər mövcuddur”, “bu aydındır ki, səhvdir”.

Nəticələr çıxarma metodu dəqiq arqumentasiya əsaslanır, hansı ki, tədricən addımbaaddım nəticələrlə istənilən nəticəyə gətirib çıxarır.

**İctimai çıxışların sübutuna nail olmağın yolları**

| | |
|---|---|
| birinci | Proses, hadisə, fenomen, ictimai həyati faktlarının təhqiqatının, dialekt xüsusiyyətlərinin gücləndirilməsi |
| ikinci | Dəqiq sübutların yığılması |
| üçüncü | əsas dialektik və formal məntiq sübutun metodikasındadır. |
| dördüncü | Zala təsir göstərmək üçün şəxsi aspektin gücləndirilməsi |
| beşinci | Zala eyni fikir yaradan mühiti qurmaq, birgə həqiqəti axtarmaq. |
| altıncı | əsas qüvvənin bir daha tipik fakt üzərinə cəmləşdirmək və aydın iddianı sübut etmək. |
| yeddinci | Canlı və parlaq geyim vasitəsilə həmçinin yaradıcı ideyaları irəli sürməklə zalı idarə etmək üçün dəqiq emosional nəzarəti yaratmaq |
| Səkkizinci | Zalın aktiv diskussiyalara cəlb olunması |
| doqquzuncu | Müzakirələrin aparılması üçün uyğun zamanın seçilməsi və bununla zalı qərarların həqiqiliyinə inandırmaq. |

**Yüksək zəkalı və yüksək emosional nitqin keyfiyyət və komponentləri**

Doğruluq

aidiyyatlılıq

dəqiqlik

aydınlıq

Qısalıq(lakonik)

dilin zənginliyi

emosional ifadəlilik




**Yaxşı, nümunəvi nitqin meyarları:**

1. nitqin məzmunluluğu
2. 2. mənəvi qiymətləndirmək
3. ardıcıllıq
4. nitq mexanizmi
5. nitqin oğurluğu
6. nitqin aydınlığı
7. nitqin ifadəliliyi

# Natiqliyin kökləri və növləri

| Natiqliyin kökləri | Natiqliyin növləri |
|---|---|
| 1. Sosial siayasi natiqlik | Siyasi, sosial iqtisadi mövzularda çıxış<br>diplomatik nitq<br>siyasi baxış<br>hərbi vətənpərvər<br>mitinq çıxış |
| 2. Təbliğat natiqliyi | Təşviqati nitq<br>Elmi çıxış<br>elmi baxış<br>elmi məlumat |
| 3. Məhkəmə natiqliyi | Müstəntiq və yaittiham nitqi<br>Ictimai-ittiham nitqi<br>Vəkil və ya müdafiəedici nitq<br>Təqsirlinin özünü müdafiə nitqi |
| 4. Dini-kilsə natiqliyi | Vəz<br>Kilsədə nitq |
| 5. Sosial-məişət natiqliyi | Ildönümü ilə vəya tərifləyici nitq<br>stolarxası tost<br>başdaşı sözüvə ya xatirə nitqi |

## Azərbaycan dilinin üslubları



## Zalın fəth edilməsi üçün praktiki məsləhətlər

əvvəlcədən zalla,yerlə akustika ilə tanışlıq, zalla məsafənin təyini, keyfiyyətli dinləmənin təminmi

Ümmətin üzündən oxumamaq,vərəqləri çevirməmək və əgər lazımi bir rəqəm və sitatları yadda saxlamaq vəziyyətində deyilsinizsə, o zaman rahat istifadə edə biləcəyiniz qeydlər edin.

Qalstuku, köynəyin yaxasını, düymələrini fırlatmayın, saç düzümünü əvvəlcədən qaydaya salmaq lazımdır.

Pəncərəyə,tavana və ayaqlarımızın altına baxmayın, öz əməkdaşınıza laqeyd baxmayın, sizin qarşınızda hörmətə layiq insanlar dayanıb onların diqqətini dəyərləndirin.

Dinləyicilərimiz izləyin, ən xırda yorğunluq, diqqətsizlik, məyusluq, laqeydlik, darıxdırıcılıq əlamətlərinə diqqət yetirin.

Nəfəsiniz tükənəcək qədər danışmayın, dayanıqlı olun, ayağınızın üstündən keçməyin.

**Auditoriya qarşısında açıq mühazirə ilə çıxış edən natiqin hazırlığı**

-Nitqin məzmununa aid xüsusi ədəbiyyatla tanışlıq

- məşhur adamların çıxışları ilə tanışlıq,

- səsyazma qaydaları ilə tanışlıq,

-nitqin texnikasına aid xüsusi tapşırıqlar

-bədii ədəbiyyatdan oxumaq üçün parçalar

- çıxış vaxtı özünün çatışmayan cəhətlərini analiz etmək

-Nitq texnikasının təkmilləşdirilməsində müasir qiymətləndirici blanklar

## Yeni başlayan Natiqə təcrübi məsləhətlər

1.O vaxt çıxış etmək lazımdır ki, deməyə sözüm olsun

2. Əgər müzakirə ilə məsələ həll olunursa anda nitqi məhdudlaşdırılmalı və faktların düzgünlüyünə istinad edilməlidir.

3.Nitqin üslubu və dili auditoriyanın məqsədinə uyğun olmalıdır

4. Natiq imkan daxilində kitab üslubundan uzaq olmalıdır və hər bir halda dəftərxana üslubundan da kənar olmalıdır

5. Elə sözlərdən istifadə etmək lazımdır ki, auditoriya ilə münasibətdə səmimiyyət yaransın,

6.Elə ifadələr seçmək lazımdır ki, uzun olmasın.

7.Terminlərdən su istifadə etmək olmaz,

8. Auditoriya ilə ünsiyyət yaratmaq üçün:

-Dinləyicilərlə ümumi marağı müəyyənləşdirmək,auditoriya ilə dostcasına münasibət yaratmaq,özün haqda yüksək fikir yaratmağa cəhd etməmək

9.Ardıcıl və ifadəli danışmaq üçün yüksəkdən danışmağa ehtiyac duyulmur,

10.Özünü ələ almaq, idarə etmək bacarığına nail olmaq

11.Danışıqda hamı tərəfindən qəbul olunmuş bir dəqiqədə 110 120 söz deməyə ehtiyac duyulmur.

12.Dinləyicini özünə cəlb etmək üçün nitqin gərək emosional və gərgin olsun, yəni elə olmasın ki, onlar sözünü eşitsinlər,amma nəticə çıxarmasınlar.

13.Auditoriya ilə əlaqəni bir saniyə də olsa itirməyəsən,bunun üçün auditoriyan nəbzini tutmalısan, yəni hədər danışmayasan.

14.Nəzərə almaq lazımdır ki, natiqin populyarlığı ona inam, nə qədər xarici görünüşündən asılıdırsa, bir o qədər özünü aparmaq qabiliyyətindən ,manerasından da asılıdır.

15.Natiqin mimikası yerində olmalıdır, sakit və səmimi olmalıdır, hərəkətlər isə dəqiq nüfuzedici,simic olmalıdır.

16.Amiranə tonla danışmamaq və təhqirə yol verməmək

## Natiqlik sənətində etika

Etika fəlsəfi tədqiqat obyekti əxlaqdır. O, etika termini elmə, Aristotel tərəfindən gətirilib.

Natiqin etikası- bu professional etika növlərindən biridir, mənəvi normalar toplusu qiymətli oriyentasiyalar,özünü aparmaq qaydaları toplusudur, hansı ki, onun öhdəliklərində, məqsədlərə və öyrətmə məsələlərinə öz dinləyicilərinə öz münasibətini müəyyənləşdirir.

**Natiqin nitqində 3 vacib fakt**

Kim danışır

Nə danışır

Necə danışır

- Natiqin sposial statusu
  Çıxışın ən vacib hissəsi
  Nitqin tədqiq edilməsi
- Dinləyicilərlə tanışlıq dərəcəsi
  nitqin məzmunu( giriş,əsasz hissə və nəticə)
  Materialın tədqiq edilməsi
- Verilən qrupun danışana münasibəti
- Hörmət və güvənc
- Prestij(üstünlük) və səlahiyyəti (avtoritet)
- Onun xarici görünüşü,onun makro və mikro jestləri
- Səs
- Geyim
- Danışıq qaydaları

**ABŞ-ın ritorik nəzəriyyəsinin və praktikasının təcrübəsi**

Nitq mədəniyyətinin əsas istiqamətləri

Praktik nitq mədəniyyəti (təlimçi)

hüquqşünaslar, iş adamları üçün vəsaitlər çıxış üçün siyasi və ictimai fəaliyyət üçün kolleksiyalar

Nitq mədəniyyəti təcrübəsi

İşin zala necə təsir göstərdiyi effektivliyi baxımından tamaşaçıların təhlili və qiymətləndirilməsi

Nitq mədəniyyətinin nəzəriyyəsi

elmi tarixi və müasir vəziyyəti, klassik nitq mədəniyyətinin əsas qanunları, Aristotel, Siseron və müasir nitq mədəniyyətinin nümunələri

**Nitq hazırlığına dair 7 əhəmiyyətli məqamlar (Monroeya görə)**

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| Ucadan tələffüz etmək təcrübəsi | Nitq üçün uyğun sözlərin yığılması | Nitqin planının yaradılması | Materialların toplanması. | Materialın toplanması və nitqin predmetini məhdudlaşdırılması | Zalın və vəziyyətin təhlili | Itkin məqsədini müəyyən etmək |

**Nitqin qurulması**

**Məsələnin qurulması**

## Nitq quruluşunun əsas mərhələləri, (motivasiyalandırıcılıq)

| mərhələ | Funksiyalar | Təsirli reaksiya |
|---|---|---|
| 1-ci mərhələ diqqətin | Diqqəti cəlb etmək | “Mən qulaq asmaq istəyirəm” |
| 2-ci mərhələ Ehtiyacın | Lazımi bilikləri nümayiş elətdirmək. | “Mən məlumat almaq istəyirəm” |
| 3-cü mərhələ məmnuniyyətliyin. | Məlumatın özünün təqdim edilməsi | “məlumat mənə predmeti daha yaxşı anlamağa kömək edir” |

## Qısa çıxışın hazırlanması alqoritmi (R.F.Ferderberə görə)

| Çıxış qabağı günlər | Məsələ |
|---|---|
| 7 | Mövzunun seçilməsi, materialın axtarışına başlanğıc |
| 6 | Materialların toplanmasına davam etmək. |
| 5 | Çıxış planının tərtib edilməsi |
| 4 | Çıxış və nəticə üzərində iş |
| 3 | Lazım gələrsə, əlavə materialın axtarılması |
| 2 | 1-ci məşq |
| 1 | 2-ci məşq |
| Şərti təqvim | çıxış |

## Praktiki nitq mədəniyyətinin quruluşu

Natiq və mən

Çıxışa hazırlıq, konspekt, materialların toplanması və sair.

Natiqin zalda davranışı

İinamın formalaşması və natiqin şəxsiyyəti, ilk çıxış, ziddiyyətlərə natiqin ilk reaksiyası, natiqin zalda hərəkəti və sair.

Ardıcıllıq texnikası

Giriş, həqiqəti tutmaq, diqqətə yardım etmək, çıxış strategiyası, arqumentasiya yolları, çıxış dili, əsas fikrin çatdırılması, reqlament və sair.

Natiq və  zal

Zalın maraq və xüsusiyyətlərini hesaba almaq, çıxışın effektivliyi.

## Dil, nitq və söz haqqında müdrik kəlamlar

I Atalar sözləri:

- ✓ Abır istəsən çox demə, sağlıq istəsən çox yemə
- ✓ Adam var ki, dindirərsən can deyər, adam var ki, dindirməsən yaxşıdır
- ✓ Allaha doğru sözdən qiymətli bir sədəqə yoxdur
- ✓ Ayaq büdrəməsi dil büdrəməsindən yaxşıdır
- ✓ Dadlı söz dost qazandırar, ac söz düşmən
- ✓ Dadlı söz can arzusu, dadsız söz baş ağrısı
- ✓ Dil var bal gətirər, dil var bəla
- ✓ İki dinlə, bir söylə
- ✓ Dil ürəyin açarıdır
- ✓ Sözü ağzında bişir, sonra çıxar
- ✓ Qaba söz qaba hərəkətdən pisdir
- ✓ Sözü at yiyəsi götürər
- ✓ Sözünü bilməyən ağız başa toxmaq vurdurar
- ✓ Söz həyatın bəzəyidir
- ✓ Söz çeynəyən çox, söz deyən az
- ✓ Söz insanın vuran dilidir
- ✓ Söz qılıncdan itidir
- ✓ Söz var gələr keçər, söz var dələr keçər
- ✓ Söz var ki, dağa çıxarar, söz var ki, dağdan endirər
- ✓ Söz sözün dayağıdır
- ✓ Sözü məqamında deyərlər
- ✓ Sözü bişir, sonra düşür,
- ✓ Sözün zahiri zərif, batini lətif olmalıdır
- ✓ Söz var işi bitirər söz var baş itirər
- ✓ Söz həm məlhəmdir, həm də yara

II Görkəmli şəxsiyyətlərin fikirləri:

- ✓ Aşıq Alı- Aşıq Alı, nə qazandın, cahandan? Səndən qalan qatar-qatar söz oldu.
- ✓ Aşıq Ələsgər- Danışdığı sözün qiymətin bilə,
  Məcazi danışa, məcazi gülə
  Kəlməsindən ləl-cövhər süzülə,
  Tamam sözü müəmmalı gərəkdir.
- ✓ Belinski V.Q.- İnsanlar yalnız nəyi hiss edir və başa düşürlərsə, onu ifadə edirlər, onlar yalnız özləri yaxşı başa düşmədiklərini ifadə etməkdə söz tapa bilmirlər.
- ✓ Çernışevski N.Q- Nəyi dumanlı təsəvvür edirsənsə, onu dumanlı da ifadə edirsən.İfadələrini qeyri- dəqiqliyi və dolaşıqlığı yalnız fikirlərin dolaşıqlığını təsdiq edir.

- ✓ Əbül-Üla Gəncəvi- Ürək bulud, sözüm inci, könülsə bir dərya
  Dilim, bu gövhərin carçısı zaman isə bəha.
- ✓ Xəqani-Bəzən dil sıyrılmış qılınca bənzər.Ayıq ol, başını bədəndən üzər.
- ✓ M.İbrahimov-Söz qiymətli daşlar kimidir bu daşları yaxşı yonub, cilalandırıb ən şərəfli, sarayların mərmər divarlarını bəzəmək üçün işlədirlər.
- ✓ Xətib Təbrizi- Sözün kəsər və kəskinliyi qılınca sirayət edərək, onu itiləşdirmiş, materialını saflaşdırılmışdır.
- ✓ Qətran Təbrizi-Iztirab çəkən könüllülər sözdən aram tutur.
- ✓ Marağalı Əvhəli-Artıq söz danışma başı ağrıdar, hər deyilən sözə çıxma özündən. Ötən bülbül olma məclisdə gəl, sən.
- ✓ Nizami-Sözün qanadları var, quş kimi incə-incə. Dünyada söz olmasa, nəyə gərək düşüncə.
- ✓ Siseron- Müxtəlif səciyyəli insanların ürəyinə nüfuz etməyi bacarmayanlar, öz nitqləri ilə arzu etdikləri məqsədə çata bilməzlər.
- ✓ Saib Təbrizi-Acı sözdən öz dilini dişləyərsən
- ✓ Rəsul Rza- Dili könüllər fəth edən böyük insan gücüdür.
  Dili qiymətdən salar, ucuz söz, hiylə, böhtan.
  Elə saxla dilini nə dil səndən utansın, nədə sən dilindən utan.
- ✓ S.Vurğun- Nahaqq söz od vurar qəlbə, fəqət haqq söz keçər, daşdan. Ucuz söz qan qaraldır ki, küsərsən dostla sirdaşdan.
- ✓ M.S.Ordubadi- Cəbhədə qılınca, məclisdə gözəl nitqə malik olanlar qəhrəmandır.
- ✓ H.B.Zərdabi- İnsan şərəfinin bir dəlili də nitqdir.

## Nitq mədəniyyətinə dair terminlər lüğəti.

***Aydın nitq*** **_** hamı tərəfindən asan başa düşülən nitq.

***Axıcı nitq*** _fikrin, ardıcıl və davamlı ifadəsi

***Bayağı nitq*** _reallıqdan uzaq nitq

***Bəlağətli nitq*** _gözəl, aydın danışma qabiliyyəti

***Böyük nitqi*** _yaşlı adamın nitqi

***Daxili nitq*** **_**fikirləşmə prosesində yaranan nitq

***Dialoq*** _iki adamın qarşılıqlı sual cavabı.

***Dialoji nitq*** _iki adamın qarşılıqlı nitqi

***Diskussiya*** _müəyyən bir mövzu ətrafında gedən nitq prosesi

***Diskussiya mədəniyyəti*** **_** diskussiya zamanı etik normalara əməl olunması

***Doğma nitq*** _ana dilində danışanın nitqi

***Elimi nitq*** _müəyyən elmi məzmunlu nitq, mühazirə mövzusunu.

***Eyfimizim*** _hər hansı bir mənfi fikrin yumşaq tərzdə ifadəsi

***Eyfuizm*** _dəbdəbəli, təmtəraqlı nitq

***Emosional nitq*** _hiss və həyəcanı qabarıq şəkildə ifadə edən nitq

***Etike***t _nitqdə qəbul olunmuş danışıq tərzi

***Əcnəbi nitqi*** _xarixi dildə danışanın nitqi

***Fəsahət*** _gözəl danışıq qabiliyyəti

***Güclü nitq*** məzmunca dolğun və parlaq nitq

***Xitabət kürsüsü*** **_**nitq söyləmək üçün müəyyən olunmuş nitq

***Xitabət*** **_**natiqlik sənətindən bəhs edən bir şöbə

***Intellektual nitq*** _məna və məzmunca yüksək səviyyəli nitq

***Interpretasiya*** **_** izahli nitq

***Iyerarxiya*** _nitq prosesində yaş və vəzifəni nəzərə almaq

***Inversiya*** _məqsədlə bağlı olaarq cümlədə söz sırasının pozulması.

***Jarqon*** _ictimai zümrələr arasında işlənən qeyri ədəbi söz və ifadə

***Kommunikasiya*** _nitq ünsiyyəti

***Qısa nitq*** _ şəraitlə bağlı yığcam nitq

***Məntiqi nitq*** _ifadə olunan fikirlərin məntiqi əsasa söykənməsi

***Məntiqsiz nitq*** _ifadə olunan fikirləri məntiqə uyğun gəlməməsi

***Müəllif*** _nitqi bədii və elmi əsər müəllifinin nitqi.

***Mürəkkəb nitq*** _auditoriyanın səviyyəsinə uyğun olmayan nitq

***Monoloji nitq*** _Bir nəfərin nitqini özündə əks etdirən şifahi və yazılı nitq nümunələri

***Nitq aktı*** _müəyyən auditoriyada danışan və dinləyicinin ünsiyyəti

***Nitq mədəniyyəti*** _ümumi mənəvi mədəniyyətin tərkib hissələrindən biridir.

***Nitqin emosionallığı*** _ dinləyicinin duyğu və hisslərinə təsir edən nitq xüsusiyyəti

***Nitq parçası*** _struktur-semantik cəhətdən vəhdət təşkil edən nitq nümunəsi məsələn, abzas fəsil yarım fəsil və sair.

***Nitqin sürəti*** _Bir dəqiqə ərzində söz və ifadələrin nitqdə işlənmə vaxtı(yavaş adi sürəti nitq)

***Nitqin texnikası*** _nitq prosesində istifadə olunan tənffüs, səs və tələffüz vasitələrindən istifadə qaydaları

***Obrazlı nitq*** _bədii təsvir və ifadə vasitələri ilə zəngin nitq

***Obraz nitqi*** _bədii əsərdə hər hansı insan surətinin nitqi

***Pis nitq*** _məzmun və formaca dinləyicinin təmin etməyən nitq

***Polemika*** _müxtəlif məzmunlu fikir və mühakimə, mülahizələr toplusu \

***Poliloq*** _nitq iştirakçılarının sayca çoxluğu

***Poetik nitq*** _bədii üslubca zəngin nitq.

***Replika*** _dialoq iştirakçılarının hər birinin nitqi

***Rəvan nitq*** _fasilə vermədən ardıcıl davam edən nitq

***Ritor*** _qədim Yunanıstan və Romada Natiq mənasında işlənən söz

***Ritorika*** _natiqlik sənəti haqqında elm

***Ritorik fiqurlar*** _ bədii təsvir və ifadə vasitələri, anafora, antiteza,inversiya,ritorik sual,təkrir,ritorik xitab,epifora və s.

***Ritorik sual*** _cavab ehtiyacı olmayan bədii suallar

***Sadə nitq*** _ümumişlək sözlər və sadə quruluşlu sintaktik fiqurlardan ibarətd vahidlər ilə əhatə olunmuş, hamının asanlıqla anladığı nitq

***Spontan nitq*** _bədahətən səsləndirilən təbii nitq

***Süxəndan*** _söz ustası

***Tavtologiya*** _nitq prosesində eyni və mənaca yaxın sözlərin yersiz işlənməsi(atəşkəsi kəsmək, geyimi geyinmək, tamaşaya tamaşa etmək,başlamağa başlamaq və sair. )

***Ziyalı nitq*** _ alim, müəllim, həkim, jurnalist, yazıçı və sair. Nitqi

***Uşaq nitqi*** _əsasən orta məktəb şagirdlərinin nitqi

***Uzun nitq*** _müəyyən bir mövzuya həsr olunmuş əhatəli nitq

***Şifahi nitq*** _şifahi tələffüzlə səslənən nitq

***Yazılı nitq*** _hərflərlə yazıya köçürən nitq

***Yaxşı nitq*** _dinləyicilər tərəfindən rəğbətlə qarşılanan nitq, nitqmədəniyyətinin başlıca tələblərinə cavab verən nitq

***Vasitəli nitq*** _müəyyən şəxsə məxsus nitqini auditoriyaya başqası tərəfindən dəyişilmiş formada çatdırılması

***Vasitəsiz nitq*** _başqasının nitqinin danışan və ya yazan şəxsin nitqində olduğu kimi işlənməsi

# Bədii qiraət üçün şeir nümunələri

## <u>Nizami Gəncəvi</u>, "Az danışmağın gözəlliyi"

Sözün də su kimi lətafəti var,
Hər sözü az demək daha xoş olar.

Bir inci saflığı varsa da suda
Artıq içiləndə dərd verir su da.

İncitək sözlər seç, az danış, az din,
Qoy az sözlərinlə dünya bəzənsin.

Az sözün incitək mə'nası solmaz,
Çox sözün kərpictək qiyməti olmaz.

Əsli təmiz olan saf mirvarılar,
Suya və torpağa min bəzək vurar.

Mə'dənlə dolsa da hər xəzinə,
Hər kiçik zərrəsi dərmandır yenə.

Ürəyi oxşayan bir dəstə çiçək,
Yüz xırman otundan yaxşıdır, gerçək!

Yüz ulduz yansa da göylərdə, inan,
Bir Günə baş əymək xoşdur onlardan.

Göydə parlasa da nə qədər ulduz.
Günəşdir nur verən aləmə yalnız.



**Mirzə Şəfi Vazeh**

XIX əsr Azərbaycan xalqının ictimai,bədii fikir tarixində mühüm rol oynayan klassik ədiblərimizdən biri də Mirzə Şəfi Sadiq oğlu Vazehdir.O,1794-cü ildə Gəncə şəhərində anadan olmuşdur.O,Azərbaycan ədəbiyyatı tarixində görkəmli şair maarifçi klassik ədəbiyyatımızın qabaqcıl ənənələrini davam etdirən istedadlı şair kimi özünü göstərmiş, Füzuli ədəbi məktəbinin davamçısı kimi tanınmışdır. M.Ş.Vazeh fars, ərəb,rus dillərini gözəl bilən, şərq aləmində tanınmış məşhur xəttat alim idi, gözəl nitqi ilə diqqəti özünə cəlb edirdi.Təsadüfi deyildi ki, alman şairi, tərcüməçisi Fridrix Fon Bodenşted onu belə xatırlayırdı:"Qəlbimdə yenə sən,canalanırsan.Ey Gəncəli Ustadım![1]Sənin yanında əyləşib nəğmələrini məlahətli səsində dinləmək istəyirəm. Ey Gəncəli söz ustadi Mirzə Şəfi."

M.Ş,Vazehin aşağıda verilmiş şerini əzbərləyib, ifadəli oxumaq.

Nə qədər kim fələkin sabitü səyyarəsi var,
Ol qədər,sinədə qəmzən oxunun yarəsi var.
Deyil əflakdə kövkəb görünən çərxi-bülənd ,
Olubən didə sərəpa sənə nəzzarəsi var.
Rüzgarı qara daim, gecəsi tar keçər,
Hər kimin eşqdə bir yari-sitəmkarəsi var.
Necə qan cuşə gəlib eyləməsin ahu fəğan,
Könlümün dideyi-giryan kimi fəvvarəsi var.
Ol qəzəldir ki,bu,Vazeh dedi bir dərd əhli:
Zahirə lalə otağında qonaq qarəsi var.

[1] ***Akif Bayram***
***Mirzə Şəfi Vazehin Ədəbi irsi adlı kitabindan s.112, Bakı 2015***

**<u>Molla Pənah Vaqif,</u> "Durnalar"**

Bir zaman havada qanad saxlayın,
Sözüm vardır mənim sizə, durnalar!
Qatarlaşıb nə diyardan gəlirsiz,
Bir əbər versəniz bizə, durnalar!
Sizə müştaq durur Bağdad elləri,
Gözləyə-gözləyə qalıb yolları,
Asta qanad çalın, qafil elləri,
Heyifdir salarsız düzə, durnalar!
Xeyli vatdır yarın fərağındayam,
Pərvanətək hüsnün çırağındayam,
Bir ala gözlünün sorağındayam,
Görünürmü görün gözə, durnalar!
Mən sevmişəm ala gözün sürməsin,
Bədnəzər kəsibən ziyan verməsin,
Sağın gəzin laçın gözü görməsin,
Qoruram səfnizi poza, durnalar!
Nazənin-nazənin edərsiz avaz,
Ruhlar tazələnir olur sərəfraz,
Vaqifin də könlü çox edər pərvaz,
Hərdəm sizin ilə gəzə, durnalar!

**<u>Əhməd Cavad,</u> Azərbaycanın Dövlət himni**

Azərbaycan! Azərbaycan!
Ey qəhrəman övladın şanlı Vətəni!
Səndən ötrü can verməyə cümlə hazırız!
Səndən ötrü qan tökməyə cümlə qadiriz!
Üçrəngli bayrağınla məsud yaşa!
Üçrəngli bayrağınla məsud yaşa!
Minlərlə can qurban oldu,
Sinən hərbə meydan oldu!
Hüququndan keçən əsgər,
Hərə bir qəhrəman oldu!
Sən olasan gülüstan,
Sənə hər an can qurban!
Sənə min bir məhəbbət
Sinəmdə tutmuş məkan!
Namusunu hifz etməyə,
Bayrağını yüksəltməyə
Namusunu hifz etməyə,
Cümlə gənclər müştaqdır!
Şanlı Vətən! Şanlı Vətən!

Azərbaycan! Azərbaycan!
Azərbaycan! Azərbaycan!

**<u>M. Şəhriyar,</u> "Heydərbabaya salam"**

Heydərbaba, ildırımlar şaxanda,
Sellər, sular şaqqıldayıb axanda,
Qızlar ona səf bağlayıb baxanda,

Salam olsun şövkətizə, elizə,
Mənim də bir adım gəlsin dilizə.

Heydər Baba, kəkliklərin uçanda,
Göl dibindən dovşan qalxıb qaçanda,
Bağçaların çiçəklənib açanda,

Bizdən də bir mümkün olsa, yad elə,
Açılmayan ürəkləri şad elə.

Bayram yeli çardaqları yıxanda,
Novruzgülü, qarçiçəyi çıxanda,
Ağ buludlar köynəklərin sıxanda,

Bizdən də bir yad eləyən sağ olsun,
Dərdlərimiz qoy dikəlsin dağ olsun.

Heydər Baba, gün dalını dağlasın,
Üzün gülsün, bulaqların ağlasın,
Uşaqlarun bir dəstə gül bağlasın,

Yel gələndə ver gətirsin bu yana,
Bəlkə mənim yatmış bəxtim oyana.

Bir çıxaydım Damqayanın daşına,
Bir baxaydım keçmişinə, yaşına,
Bir görəydim nələr gəlmiş başına,

Mən də onun qarlarıyla ağlardım,
Qış donduran ürəkləri dağlardım.

Heydərbaba, sənin könlün şad olsun,
Dünya varkən ağzın dolu dad olsun,
Səndən keçən tanış olsun, yad olsun,

Deynən mənim şair oğlum Şəhriyar,
Bir ömürdür, qəm üstünə qəm calar.

**<u>Səməd Vurğun,</u> "Azərbaycan"**

El bilir ki, sən mənimsən,
Yurdum, yuvam, məskənimsən,
Anam doğma vətənimsən!
Ayrılarmı könül candan?
Azərbaycan, Azərbaycan!

Mən bir uşaq, sən bir ana,
Odur ki, bağlıyam sana,
Hankı səmtə, hankı yana
Hey uçsam da yuvam sənsən,
Elim, günüm, obam sənsən!

Çox keçmişəm bu dağlardan,
Durna gözlü bulaqlardan!
Eşitmişəm uzaqlardan
Sakit axan arazları,
Sınamışam dostu, yarı…

Fəqət səndən gen düşəndə,
Ayrılıq məndən düşəndə,
Saçlarıma dən düşəndə.
Boğar aylar, illər məni,

Qınamasın ellər məni.
Dağlarının başı qardır,
Ağ örpəyin buludlardır.
Böyük bir keçmişin vardır.
Bilinməyir yaşın sənin,
Nələr çəkmiş başın sənin.

Düşdün uğursuz dillərə,
Nəs aylara, nəs illərə.
Nəsillərdən nəsillərə,
Keçən bir şöhrətin vardır.
Oğlun, qızın bəxtiyardır…

Hey baxıram bu düzlərə,
Ala gözlü gündüzlərə.
Qara xallı ağ üzlərə,
Könül istər şeir yaza;
Gəncləşirəm yaza-yaza…

Ölməz könül, ölməz əsər,
Nizamilər, Fizulilər

Əlin qələm, sinəm dəftər,
De gəlsin hər nəyin vardır.
Deyilən söz yadigardır.

**Süleyman Rüstəm, "Təbrizim"**

Baxdıqca hüsnünə doymayır gözüm,
Təbrizim, Təbrizim, gözəl Təbrizim!
Qoymaram yadları girsin qoynuna,
İzin ver qolumu salım boynuna!
Sənin bayramına, sənin toyuna
Dili bir, qanı bir qardaşın gəlib,
Dərdinə aşina sirdaşın gəlib.
Sən çıxdın qarşıma duzla, çörəklə,
Bağından dərdiyin güllə, çiçəklə,
İkiyə bölünməz saf bir ürəklə,
Təbrizim, Təbrizim, aman Təbrizim,
Yox olsun başından duman, Təbrizim!
Qədrini ayrılıq çəkənlər bilər,
Hicranda göz yaşı tökənlər bilər,
Ömrünə qaranlıq çökənlər bilər,
Bağından gül-çiçək dərdim, Təbrizim,
Yenə təzələndi dərdim, Təbrizim!
Nə qəşəngdir yol boyunca söyüdlər,
Söyüdlərin kölgəsində igidlər
Babalardan dinləyirlər öyüdlər,
Coşur damarlarda qanı, Təbrizim,
Yoxdur bu mərdlərin sanı, Təbrizim!
Ağlasan ağlaram, gülsən gülərəm,
Yaşasan yaşaram, ölsən ölərəm,
Varımı səninlə yarı bölərəm,
Gəl bir də üzündən öpüm, Təbrizim!
Başına gül-çiçək səpim, Təbrizim!
Nədir o, mənalı, dərin baxışlar?
Nədir gözlərindən yağan yağışlar?
Nədir qəlbindəki payızlar, qışlar?
Yetimtək boynunu burma, Təbrizim!
Məlul-məlul baxıb durma, Təbrizim!
Sənin çiçəyinə, gülünə qurban!
Mənə qardaş deyən dilinə qurban!
Vətəninə qurban, elinə qurban!
Baxdıqca hüsnünə doymayır gözüm,
Təbrizim, Təbrizim, gözəl Təbrizim!

**<u>Bəxtiyar Vahabzadə,</u>** "**Ana dili**"

Dil açanda ilk dəfə «ana» söyləyirik biz,
«Ana dili» adlanır bizim ilk dərsliyimiz.
İlk mahnımız-laylanı anamız öz südüylə
İçirir ruhumuza bu dildə gilə-gilə.
Bu dil bizim ruhumuz, eşqimiz, canımızdır,
Bu dil bir-birimizlə əhdi-peymanımızdır.
Bu dil tanıtmış bizə bu dünyada hər şeyin
Bu dil əcdadımızın bizə miras verdiyi
Qiymətli xəzinədir…onu gözlərimiztək
Qoruyub, nəsillərə biz də hədiyyə verək.
Bizim uca dağların sonsuz əzəmətindən,
Yatağına sığmayan çayların hiddətindən,
Bu torpaqdan, bu yerdən,
Elin bağrından qopan yanıqlı nəğmələrdən
Güllərin rənglərindən, çiçəklərin iyindən,
Mil düzünün, Muğanın sonsuz genişliyindən,
Ağsaçlı babaların əqlindən, kamalından,
Düşmən üstünə cuman o Qıratın nalından
Qopan səsdən yarandın.
Sən xalqımın aldığı ilk nəfəsdən yarandın.
Ana dilim, səndədir xalqın əqli, hikməti,
Ərəb oğlu Məcnunun dərdi səndə dil açmış.
Ürəklərə yol açan Füzulinin sənəti,
Ey dilim, qüdrətinlə dünyalara yol açmış.
Səndə mənim xalqımın qəhrəmanlıqla dolu tarixi varaqlanır,
Səndə neçə min illik mənim mədəniyyətim,
Şan- şöhrətim saxlanır.
Mənim adım-sanımsan,
Namusum, vicdanımsan!
Bu dil tanıtmış bizə bu dünyada hər şeyi,
Bu dil əcdadımızın bizə qoyub getdiyi
Ən qiymətli mirasdır, onu gözlərimiz tək
Qoruyub, nəsillərə biz də hədiyyə verək!
Ey öz doğma dilində danışmağı ar bilən fasonlu ədabazlar,
Qəlbinizi oxşamır qoşmalar, telli sazlar.
Bunlar qoy mənim olsun,
Ancaq Vətən çörəyi,
Sizlərə qənim olsun!

**Nəbi Xəzri, " Şuşanın yolları "**

Hər yanda bir məclis qurulub gedir,
Buz kimi bulaqlar durulub gedir,
Dağların döşüylə burulub gedir,

Gör necə qovuşur yollara yollar,
Siz nə gözəlsiniz, yollar, a yollar.

Dağın ətəyinə qədəm qoyunca
Qarqar uğuldayır dərə boyunca,
Durub hüsnünüzə baxım doyunca

Baxım heyran-heyran mən sizə, yollar,
Ilk dəfə gəlmişik üz-üzə, yollar!
Sərin bulaqlardan ellər su içmiş,
Dostunu düşməndən yaxşıca seçmiş,
Burdan Vaqif ötmüş, Vidadi keçmiş,
Gərək ki, onları tanıya yollar,

Onların izləri hanı, a yollar?!
Sevirəm çeşməli, sulu dağları,

Vüqarlı dağları, ulu dağları,
Döysə də qar, yağış, dolu dağları,
Dolanıb aparır dağlara yollar,
Bağçalara yollar, bağlara yollar.

# ƏDƏBİYYAT SİYAHISI

1. Abdullayev A.S. Nitq mədəniyyəti və natiqlik sənəti.B, 1981.
2. Abdullayev N.Ə. Nitq mədəniyyətinin əsasları. Bakı, 2013.
3. A.Hacıyev Azərbaycan dilinin onomrastik sistemi. Bakı. 1990
4. Azərbaycan dilinin orfoepiya sözlüyü. B. 1982.
5. Azərbaycan dilinin orfoqrafiya lüğəti. B. 2004.
6. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı, 2002.
7. Babayev Adil. Azərbaycan dili və nitq mədəniyyəti. Bakı, 2011.
8. Əhmədov Ş. Mühazirəçilik məharəti, natiqlik sənəti. Bakı, 1985.
9. Əliyev V. Heydər Əliyevin dil siyasəti. Bakı, 2003.
10. Fərəcov Ə.A. İzahlı dilçilik lüğəti, Bakı, 1969.
11. Hacıyev Allahverdi, Mehrabova Tamam. Müasir Azərbay¬can dili. Bakı, 2014
12. Heydər Əliyev dil haqqında və Heydər Əliyevin dili, Bakı, "Elm", 1998.
13. Zamanov N.T. Heydər Əliyev və Azərbaycan nitq mədə-niyyəti. (II kitab). Bakı, "Elm və təhsil". 2014.

# MÜNDƏRİCAT

